# QEYB DÖVRÜNÜN TARİXİ

## ON İKİNCİ İMAMIN (Ə) QEYB DÖVRÜNƏ ANALİTİK BİR BAXIŞ



MÜƏLLİF: PUR SEYYİD AĞAYİ
TƏRCÜMƏ EDƏN: AZƏR TURAN

# فهرست

# QEYB DÖVRÜNÜN TARİXİ

## KİTAB HAQQINDA

Kitabın adı:..............Qeyb dövrünün tarixi

Toplayan::..Pur Seyyid Ağayi

Tərcümə edən::.....Azər Turan

Nəşr edən::...........Mo’ce–elm

Tiraj:::..۳۰۰۰

Çap növbəsi::...........Birinci

Çap tarixi:..۲۰۰۵

۹۶۴–۹۵۸۴۲–۷–۸

səh:۱

## KİTABDA İSTİFADƏ OLUNMUŞ ƏSAS MƏNBƏLƏR

.«۱Doktor Casim Hüseyn, «On ikinci imamın (ə) qeybinin siyasi tarixi

.«۲Şeyx Tusi, «Əl-fehrest», «Ər-rical», «Əl-ğeybət», «Təhrirul-vəsilə

.«Şeyx Müfid, «Əl-irşad.۳

.«Kuleyni «Kafi.۴

.«Səduq, «Kəmalud-din.۵

.Biharul-ənvar», Əllamə Məclisi».۶

.Ə’yanuş-şiə», Seyyid Möhsin Əmin Amili».۷

.İsbatul-vəsiyyə», Əli ibn Əl-Həsən Əl-Məs’udi».۸

.«Safi Gülpayqani, «Müntəxəbul-əsər.۹

.«Təbərsi «Əl-ehticac.۱۰

.«İbrahim Əyyub «Tarixul-əbbasi ۱

.«Əl-fəxri, «Tarixul-İslam.۱۲

.«Tarixe-Təbəri».۱۳

.«İbn Şəhr Aşub «Mənaqib.۱۴

.«Seyyid Məhəmməd Sədr «Tarixul-ğeybətul-suğra.۱۵

.Məqatilut-talibin», Əbül-fərəc İsfəhani».۱۶

.Mürəvvicuz-zəhəb», Əli ibn əl-Həsən əl-Məs’udi».۱۷

.«No’mani, «Əl-ğeybət.۱۸

.«Ricale-kəşşiy».۱۹

.«Ricale-Nəcaşi».۲۰

.Tənqihul-məqal», Əllamə Mamağani» ۲

.Vəsailuş-şiə», Şeyx Məhəmməd ibn Həsən Hürr Amili».۲۲

.«Süyuti «Tarixul-xüləfa.۲۳

.«Əllamə Hilli «Xülasə.۲۴

.«Əllamə Təbatəbai «Şiə dər İslam.۲۵

.Məfatihul-cinan», Şeyx Abbas Qummi».۲۶

.«Seyyid Əbül-Həsən İsfəhani, «Vəsilətun-nicat.۲۷

.«İbn-Əsir «Əl-kamil fittarix.۲۸

.«Mirza Hüseyn Nuri «Müstədrəkul-vəsail.۲۹

.«Şəhid Seyyid Məhəmməd Baqir Sədr, «Əl-Möhnət.۳۰

## ÖN SÖZ

Hicri-qəməri ۲۶۰-cı ildə imam Həsən Əsgərinin (ə) şəhadətə çatması ilə qeyb (qeybət) dövrü başlandı. Qeyb o zaman baş verir ki, dinin əsas proqramı işdən düşür, hədislər toplum şəklində qorunur və hədislərin tanınmasında onların araşdırılması me’yar olur. Şiə əqidəsini və fiqhini müxalif firqələrdən, xüsusi ilə xəlifələri himayə edən sünnə .əhlindən müdafiə edən şagirdlər hadisələrə tə’sir göstərir

Qeybə çəkilmiş ۱۲-ci imam həzrət Höccətin (ə) hüzuru hələ ki tamamlanmamış yetkinliyə ehtiyaclıdır. Qeyb təbii şəkildə başlayır. Həzrətin rəhbərliyi üçün şərait yaranınadək o, qeyb pərdəsi arxasında qalır. İslamın qorunması, müsəlmanlara rəhbərlik imamın vəzifələrindəndir. Dinin əsas proqramı və onun qorunması imam Həsən Əsgərinin (ə) dövrünədək tə’min olunmuşdur. İmam Həsən Əsgəridən (ə) sonra bu proqramın həyata keçməsi üçün müsəlmanlara rəhbərlik edəcək şəxsin hərəkəti qarşısında maneələr vardır. Bu maneələr aradan qaldırıldığı an, zəruri şərtlər ödəndiyi vaxt qeyb öz yerini zühura verəsidir. Şərtlər ödənmədiyi təqdirdə qeyb dövrünün .uzanması təbiidir

On ikinci imamın (ə) qeyb hadisəsi, şübhəsiz ki, şiə tarixinin ən mühüm hadisələrindəndir. Bu hadisə həm e’tiqadi, həm də tarixi baxımdan araşdırıla bilər. Əlinizdəki kitabda uyğun hadisə tarixi baxımdan araşdırılmışdır. Kitabda qeybin hər iki dövrü: həm kiçik qeyb dövrü («ğeybəti-suğra»), həm də böyük qeyb dövrü («ğeybəti-.kübra») nəzərdən keçirilmişdir

Hicri-qəməri ۲۶۰-۳۲۹-cu illəri əhatə edən kiçik qeyb dövrünü araşdırmaq üçün mənbələr nəzərdən keçirilmiş, imamın dövrünün ictimai-siyasi və ideoloji vəziyyəti analiz edilmiş, uyğun dövrün tarixi şəraiti və imamların həmin dövrə hazırlığı tədqiq olunmuş, məxfi vəkillik tədbiri, kiçik qeyb dövründə bu dörd nümayəndənin rolu, qeyb .dövrünün necə başlaması və onun dəlilləri kimi məsələlər təhlil olunmuşdur

Hicri-qəməri ۳۲۹-cu ildə başlayıb, bu günədək davam edən böyük qeybət dövründə də şiə tarixi nəzərdən keçirilmiş, uyğun dövrün hərəkatları və mövcud hakimiyyətləri, fəqihlərin keçdiyi mübarizə yolu, qısa şəkildə də olsa, həzrət Mehdi (ə) ilə bağlı mə’lumatlar tədqiq olunmuşdur. Əsrin imamı həzrət Mehdi (ə) ilə tanışlıq istiqamətində

## BİRİNCİ FƏSİL

### QEYB DÖVRÜNÜN TARİXİ MƏNBƏLƏRİ İLƏ TANIŞLIQ VƏ ONLARIN ARAŞDIRILMASI

On ikinci imamın qeybə çəkilmə hadisəsi e'tiqadi və tarixi baxımdan araşdırıla bilər. Hicri ۴-cü əsrin ilk yarısından başlayaraq bir çox alimlər həzrətin qeybini yalnız e'tiqadi baxımdan araşdırmışlar. Hansı ki, bu hadisənin tarixi yönümləri də vardır. Belə görünür ki, qeyb hadisəsi ilə imamət inancı arasındakı sıx bağlılıq şiə kəlamı bəhsində daha .geniş yer tutduğundan hadisənin tarixi yönümləri ikinci plana keçmişdir

Əlinizdəki kitabda məqsədimiz hadisəni tarixi baxımdan araşdırmaq olmuşdur. Kitabda on ikinci imamın (ə) qeybinin tarixi şəraiti, məxfi vəkillik idarəçiliyi, qeyb dövründə bu .idarəçiliyin rolu tarixi araşdırmanın əsas mövzularını təşkil edir

### MƏNBƏLƏRİN ARAŞDIRILMASI

On ikinci imamın (ə) qeybə çəkilmə hadisəsini araşdırarkən bu mövzuda yazılmış kitablardan, eləcə də bə'zi rical və tarix kitablarından istifadə etmək olar. Hər üç .mənbəni qısa şəkildə araşdıracağıq

### QEYB MÖVZUSUNDA YAZILMIŞ KİTABLAR

Bu mövzuda yazılmış kitabları üç qrupa bölmək olar. Bu kitablardan bir qismi on birinci imam Həsən Əsgərinin (ə) həyatı dövründə yazılmış kitablardır. Digər iki qrup kitab kiçik qeyblə böyük qeyb arası və böyük qeyb dövründən bu günədək yazılmış .kitablardır

.İmam Həsən Əsgərinin (ə) şəhadətindən(۱) qabaq yazılmış kitablar .۱

İmamların səhabələri və şagirdləri on bir imamın həyatı dövründə dörd yüzə yaxın kitab yazmışlar. Bu kitablar «Dörd yüzlük üsul» («Əl-üsulul-ərbəə miət») adı ilə məşhurdur. Bu kitablar növbəti IV və V əsrlərdə şiə rəvayətləri toplumunun əsasını təşkil etmişdir. Bu kitabların bə'zilərində peyğəmbərlər və imamlardan imam Mehdinin (ə) qeybi ilə bağlı hədislər nəql olunmuşdur. Nümunə olaraq imamiyyə kitablarından doqquzuncu və onuncu imamın vəkili Əli ibn Məhzyarın «Əl-məlahim» və «Əl-qaim» kitablarını, Həsən ibn Məhbubun «Əl-məşixə» kitabını, Fəzl ibn Şazanın «Əl-ğeybət»

.kitabını göstərə bilərik

.Kiçik qeyb («Ğeybəte-Suğra») dövründə, yə’ni hicri ۲۳۹-۲۶۰-cı illərdə yazılmış kitablar .۲

Bu kitabların əksəri əvvəlki dövrə aid mənbələrə əsaslanmışdır. Bu dövrə aid əsərlərin müəllifləri on ikinci imam (ə) vasitəsi ilə rəhbərlik edilən vəkalət qurumunda



---

.Hicri-qəməri ۲۶۰-ci il; miladi ۸۷۴-cü il [۱] -۱

məxfi fəaliyyət göstərən fəqihlər və təbliğatçılar olmuşdur. Ona görə də bu kitablarda qeyd olunan mühüm mə'lumatlarla tarix kitablarında rastlaşmaq mümkünsüzdür. Bu kitablara nümunə olaraq, İbrahim ibn İshaq Nəhavəndinin «Əl-ğeybət», Əbdüllah ibn Cə'fər Həmirinin «Əl-ğeybət vəl-heyrət», İbn-Babəvəyhin «Əl-imamət vət-təbsirə minəl-heyrət» kitablarını göstərmək olar. Məşhur İslam alimi Kuleyni də öz «Kafi» kitabının mühüm bir hissəsini «Əl-höccət» adı altında qeyb məsələlərinə həsr etmişdir. Kuleyni öz mə'lumatlarında imamlar haqqındakı ümumi mə'lumatlara, həmin dövrdə imamın səfirlərinə istinad etmişdir. Kuleyni on ikinci imamın (ə) qeybi haqqında imamlardan nəql olunmuş hədisləri toplamışdır. O, öz kitabında verdiyi mə'lumatları qədim vaqifiyyə və imamiyyə yazıçılarından, eləcə də Həsən ibn Məhbub, Əbdüllah ibn Yəqub Usfuri, Həsən ibn Səmaətdən nəql etmişdir. İmamiyyənin məfxi fəaliyyətləri haqqında on ikinci imamın vəkillərinin rəvayətləri əsas götürülmüşdür.

٣. Hicri ٣٢٩-cu ildən başlayaraq böyük qeyb dövrü ilə bağlı yeni bir tarixin əsası qoyulur.

İmamın qeybi uzun çəkdiyindən və günün suallarına cavab vermək zəruəti yarandığından başqa yazılara da ehtiyac duyulmalıdır. Bu səbəbdən də şiə fəqihləri və alimləri uyğun mövzuda çox dəyərli əsərlər yazmışlar. Bu dövrün əsərlərini imamiyyə məzhəbində olanlar üçün əqidə əsası kimi götürmək olar. Həmin dövrün beş əsəri ilə tanış olaq: No'maninin «Əl-ğeybət», Səduqun «Kəmalud-din və Təmamun-ne'mət», Şeyx Müfidin «Əl-Füsulul-işrət fil-ğeybət» və «Əl-irşad», Şeyx Tusinin «Əl ğeybə» əsərləri.

## RİCAL KİTABLARI

Rical kitablarında rəvayətçilərin və hədis toplayanların elmi bioqrafiyasından, e'tiqadi və siyasi baxışlarından danışıldığı üçün bu kitablar on ikinci imamın (ə) siyasi tarixinin araşdırılmasında əhəmiyyət kəsb edir. Bu kitablar oxucunu imamlarla onların ardıcılları, vəkilləri arasındakı əlaqələrlə tanış edir.

İmamiyyə alimləri hazırkı mövzumuzla bağlı dörd rical kitabı tərtib etmişlər. Kəşşinin «Mə'rifətun-naqilin ənil-əimmətus-sadiqin», Şeyx Tusinin «Əl-fehrest» və «Ər-rical», Nəcaşinin «Fehreste əsmae musənnəfiş-şiə» kitabları.

## TARİX KİTABLARI

Tarix kitabları dedikdə uyğun mövzu haqqında mə’lumat verən ümumi tarixi mənbələr .nəzərdə tutulur

Tarixçi Təbəri kiçik qeyb dövründə yaşamışdır. Onun «Tarixe-Təbəri» adı ilə məşhur olan əsərində on ikinci imamın (ə) vəkillərinin fəaliyyəti haqqında heç bir mə’lumat verilmir. Bu bir

daha onu göstərir ki, onların fəaliyyətləri gizli olmuşdur. Amma kitabda ismailiyyə kimi şiə qruplarının mübarizələri haqqında mə’lumat verilir və həzrət Mehdi (ə) haqqında .Peyğəmbərdən nəql olunmuş hədislər bu qrupların dilindən çatdırılır

Tarixçi Məs’udi böyük qeyb dövründə yaşamışdır. O, öz kitablarında Abbasi hakimlərinin imamlar və onların ardıcılları ilə amansız rəftarı haqqında ətraflı mə’lumat .vermişdir

Tarixçi İbn-Əsir (hicri-qəməri ۶۳۰-cu il) «Əl-amil fit-tarix» kitabında on ikinci imamın (ə) vəkilləri haqqında mə’lumat verir və həmin dövrdə baş vermiş bir sıra ixtilafları .işıqlandırır

Müasir dövrümüzdə, son onilliklərdə də qeyb dövrü ilə bağlı əsərlər yaranmışdır. Bu kitablarda on ikinci imamın (ə) qeyb tarixi, həzrətin siyasi həyatı işıqlandırılmışdır. Həzrətin (ə) siyasi tarixinin açıqlanmasında, onun məxfi vəkillərinin fəaliyyətləri ilə tanışlıqda bu kitabların mühüm rolu var. Bu kitablardan bə’zilərinin adını çəkirik: Ayətullah Safi Gulpayqaninin «Muntəxəbul-əsər fil-imaməs-sani əşr», Seyyid Məhəmməd Sədrin «Tarixul-ğeybətus-suğra», «Tarixul-ğeybətul-kubra». Doktor Casim Hüseynin «On ikinci imamın (ə) qeybinin siyasi tarixi», Baqir Şərif Əl-Qurəşinin «Həyatul-.imam Muhəmməd əl-Məhdi (ə)» əsərləri

Əlinizdəki kitabda başqa tarixi əsərlərdən və hədis kitablarından da istifadə olunmuşdur. Xüsusi ilə də böyük qeyb dövrü və böyük qeyb dövründə müsəlmanların .ictimai-siyasi düşüncə vəziyyəti ardıcıl şəkildə araşdırılmışdır

## XÜLASƏ

On ikinci imamın qeyb hadisəsi e’tiqadi və tarixi baxımdan araşdırıla bilər. Bu hadisənin tarixi şəraitinin araşdırılması və qeyb dövründə vəkalət qurumunun rolu ilə tanışlıq üçün ilk öncə müraciət edilmiş mənbələrlə tanış olmaq lazım gəlir. Bu mənbələr üç :qismə bölünə bilər

;Qeyb hadisəsi mövzusunda yazılmış kitablar

;Rical kitabları

.Tarixi kitablar

Müasir dövrdə yazılmış kitablardan doktor Casim Hüseynin və Seyyid Məhəmməd .Sədrin kitablarını qeyd etmək olar

## İKİNCİ FƏSİL

## ON İKİNCİ İMAMIN HƏYATINA QISA BİR BAXIŞ

Bu fəsildə on ikinci imamın (ə) tarixinə müfəssəl şəkildə varmazdan qabaq onun anadan olduğu dövrə, anadan olduqdan sonra baş vermiş hadisələrə və onun .həyatının müxtəlif mərhələlərinə qısa bir nəzər salacağıq

### İMAMIN DÜNYAYA GÖZ AÇMASI

İmam Həsən Əgərinin oğlu şiələrin on ikinci imamı həzrət Mehdi hicri ۲۵۵, miladi ۸۶۹-cu il, ۱۵ şəbanda, cümə günü sübh çağı Samirra şəhərində dünyaya göz açdı. İmamın anadan olması gizli saxlanıldığından onun doğum ili haqqında fərqli mə'lumatlar .verilmişdir

Həzrət Mehdinin dünyaya gəlməsi aşkar tarixi gerçəklikdir. Onun dünyaya gəlişini imamlardan, şiə alim və tarixçilərindən əlavə, bir çox sünni tarixçiləri və mühəddisləri də təsdiq etmişdir. Bə'zi kitablarda altımış beşə yaxın belə alimin və onun kitabının adı .çəkilmişdir

### İMAMIN ADI

İmamın adı öz babası həzrət Peyğəmbər kimi Məhəmməd olmuşdur. Bütün tarixçilər və mühəddislər yekdil olaraq qəbul edirlər ki, bu adı ona həzrət Peyğəmbər (s) özü qoymuşdur. İmama bu adın verilməsi təsadüfü deyil. Peyğəmbər (s) öz gəlişi ilə dünya əhlini azğınlıqdan və cəhalətdən qurtardığı kimi, onun övladı on ikinci imam da öz .zühuru ilə bəşəriyyəti zülmətdən çıxarasıdır

### İMAMIN LƏQƏBİ

Həzrətin ən məşhur ləqəbləri «Mehdi», «Qaim», «Müntəzər», «Höccət», «Xələfe-Saleh», «Bəqiyyətullah», «Mənsur», «Sahibul-Əmr», «Vəliyyul-Əsr» və «Sahibəz-Zəmandır». Ən məşhur ləqəb isə Mehdidir. Bütün bu ləqəblərin səbəbləri vardır. Məsələn həzrət ona görə Mehdi adlandırılmışdır ki, haqqa hidayət edəndir. Ona Qaim ləqəbinin verilməsinin səbəbi haqq yolda qiyam etməsidir. Həzrətə ona görə Müntəzər deyirlər ki, mö'minlər onun intizarındadır. Həzrətin «Höccət» adlandırılmasının səbəbi onun Allah

tərəfindən xalqa dəlil gətirilməsidir. Həzrətin üzüyünün qaşında da onun həmin ləqəbi .yazılmışdır

## İMAMIN ANASI

Həzrətin anası haqqında müxtəlif rəvayətlər nəql olunmuşdur. Məs’udinin bildirdiyinə görə, imamın anası Nərcis adlı bir kəniz olmuşdur. Şəhidin nəzərincə həmin xanım Zeyd Ələviyyənin Məryəm adlı qızı olmuşdur. Şeyx Tusi isə belə bildirir ki, İmamın anasının adı Reyhanə olmuşdur, amma onu Nərcis də adlandırmışlar. Şeyx Müfid isə bu xanımın adının Nərcis olduğunu zikr edir. İmam Həsən Əsgərinin bibisi də Nərcis adı üzərində dayanmışdır. Bə’zi alimlərin fikrincə, həmin xanımın adı həm Nərcis, həm də başqa adlar ola bilər. (Şeyx Tusinin ehtimal etdiyi Seyqəl adı istisna olunur.) Bu adların həmin xanımın imam Cavadın (ə) qızı Həkimə tərəfindən verilməsi ehtimal edilir. Həmin dövrün adamları kənizləri müxtəlif adlarla çağırardılar. Nərcis, Reyhanə, Süsəngül adlarıdır. Səduq nəql etdiyi rəvayətlə bu ehtimalı daha da gücləndirir. O, Ğiyasa istinad edərək bildirir ki, imam Həsən Əsgərinin canişini cümə günü dünyaya gəldi; Həzrətin anasının adı Reyhanə idi, amma onu Nərcis, Süsən, Seyqəl də çağırardılar. Hamiləlik dövründə nurlu olduğu üçün ona Seyqəl adını vermişdilər. Seyyid Məhəmməd Sədr də öz kitabında həzrətin anasının adları haqqında ətraflı təhlil .aparır

On ikinci imamın anasının milliyyəti haqqında da müxtəlif fikirlər var. Səduq bir rəvayətə əsasən onun Rum qeysərinin oğlu Yə’şunun qızı Məlikə olduğunu bildirir. Onu da qeyd edir ki, xanımın anası həzrət Məsihin həvarilərindən biri olan Şəm’unun nəslindəndir. Onun fikrincə, xanım əsir götürülmüş və imam Hadinin göndərildiyi adam .Bağdad qul alverçilərindən alınmışdır

.«Kuleyni deyir: «İmamın anası Sudanın şimal əyalətlərindən olan Nobədəndir

No’mani və Səduq digər bir rəvayət nəql edirlər. Onların nəzərincə, imamın anası qara bir kəniz olmuşdur. Bə’zi alimlər şeyx Tusinin nəql etdiyi rəvayəti əsas götürürlər. .Onun fikrincə həmin xanım imamın bacılarından birinin (Həkimə) evində böyümüşdür

Ən əsası odur ki, bu xanım öz əzəməti ilə əsrin imamının anası olmaq ləyaqətini qazanmışdır. İmam Həsən Əsgərinin bibisi Həkimə onu yüksək qiymətləndirərək, özünü bu xanıma xidmətçi bilmişdir. Həzrət Peyğəmbər (s), Əmirəl-mö’minin (ə) bu .xanımı öz ailələrinin ləyaqətli xanımlarından saymışlar

On ikinci imamın doğumu haqqında imam Həsən Əsgərinin bibisi Həkimənin verdiyi

mə’lumatlar daha dəqiqdir. Həkimə xanımın nəql etdiyi rəvayət hicri ۳۴۵-ci ildə dünyasını dəyişmiş Məs’udi tərəfindən e’tibarlı sayılmışdır. Şeyx Səduq imam Cavadın :qızı Həkimənin dilindən belə nəql edir

Əbu Məhəmməd Həsən ibn Əli adam göndərib məni öz yanına çağırdı və dedi: «Ey bibi,» bu axşam bizimlə iftar et. Çünki şə’banın on beşidir və bu gecə Allah-təala öz höccətini yer üzündə zahir edəcəkdir». Ondan soruşdum: «Anası kimdir?» Buyurdu: «Nərcis». :Soruşdum

Canım sənə fəda olsun! Axı mən onda hamiləlik əlaməti görməmişəm». Buyurdu: «Nə» dedimsə, o da olacaq». Otağa daxil olub salam verdim. Nərcis yaxınlaşıb ayaqqabılarımı ayağımdan çıxardı və mənə dedi: «Mənim xanımım, necəsiniz?» Ona dedim: «Sən mənim və mənim ailəmin xanımısan». Amma o bu sözlərə e’tiraz etdi. Dedim: «Qızım! Bu gecə Allah-təala sənə elə bir oğul əta edəcək ki, dünya və axirətin mövlası, ağası olacaq». Utandığından çöhrəsinə qızartı çökdü. Məğrib namazını qıldıqdan sonra iftar etdim və yatdım. Gecə yarı yuxudan durdum ki, işa namazını qılım. Mən namaz qılanda Nərcis yatmışdı. Onda heç bir hamiləlik əlaməti görünmürdü. Sonra oturub nafilə namazı qıldım. Yatağıma uzandım, amma çox keçməmiş yenidən qalxdım. Nərcis hələ də yuxuda idi. Nəhayət, ayağa qalxdı, nafilə namazı qılıb yenidən .yerinə uzandı

Həkimə sözlərinə belə davam edir: «Otaqdan bayıra çıxdım, fəcr tülusunu (günün ağartısını) görüm. O hələ də yatdığından imam Həsən Əsgərinin (ə) intizarı məni şübhəyə saldı. Elə həmin anda imamın səsi eşidildi: «Ey bibi! Tələs vaxt çatmışdır». Mən oturub Qur’anın «Səcdə»(١) və «Yasin» surələrini oxudum. Bu vaxt Nərcis yerindən qalxdı. Mən ona yaxınlaşıb dedim: «Allahın salamı olsun sənə, bir şey hiss edirsənmi?» O cavab verdi: «Ey bibi, bəli». Sonra ona dedim: «Özünü ələ al və aram ol». Bu vaxt yuxu mənə qalib gəldi və mürgülədim. Bir az sonra intizarında olduğumuz mövlamın səsi məni yuxudan oyatdı. Örtüyü üstündən qaldırdıqda onu səcdə vəziyyətində gördüm. .«Onu qucağıma aldım, körpə pak və təmiz idi

Əbu Məhəmməd məni səslədi və dedi: «Ey bibi! Oğlumu mənim yanıma gətir». Onun əmrinə itaət etdim. İmam Həsən Əsgəri (ə) dilini körpənin ağzına qoyub astaca əllərini onun gözlərinə, qulaqlarına və dizlərinə çəkdi. Sonra dedi: «Ey oğlum, danış». Uşaq dil açıb danışdı və imamın cavabında dedi: «Şəhadət verirəm ki, bir Allahdan başqa mə’bud yoxdur. O birdir, şəriksiz və oxşarsızdır. Şəhadət verirəm ki, Məhəmməd (s) Allahın rəsuludur». Sonra Əmirəl-mö’méninə (ə) və imamlara ardıcıllıqla salam verdi, .atasının adına çatdıqda dayandı

Əbu Məhəmməd dedi: «Ey bibi, onu anasının yanına apar ki, ona salam desin, sonra isə yanıma qaytar». İmamın dediyi kimi etdim və körpəni yenidən qaytarıb əvvəlki yerinə qoydum. İmam Həsən Əsgəri (ə) mənə buyurdu: «Ey bibi! Yeddi gün onun görüşünə

gəl». Növbəti gün Əbu Məhəmmədə salam vermək üçün gəldim. Pərdəni qaldırdıqda mövlamı yerində görmədim. İmamdan soruşdum: «Canım sənə fəda olsun! Mövlam haradadır?» Həzrət buyurdu: «Bibi, onu Musanın anası öz övladını tapşırdığı kəsə tapşırdım».

Həkimə deyir: «Yeddinci gün gəldim, imama salam verib oturdum. Əbu Məhəmməd buyurdu:

səh:۱۱

---

۱- [۲] ۴۰-cı surə.

Oğlumu mənim yanıma gətir». Körpəni bələyib imamın yanına gətirdim. İmam doğum» günü etdiyi hərəkətləri təkrarladı və körpə həmin gün dediklərini yenidən dedi. Sonra isə bu ayəni oxudu: «Bismillahir-Rəhmanir-Rəhim. Biz yer üzünün müstəz'əflərinə (zəif düşmüşlərinə) minnət qoyub, onları xalqa rəhbər və yer üzünün varisləri etmək, yer üzündə onlara qüdrət vermək, Fir'ona, Hamana və onların qoşunlarına qorxduqları .(şeyi göstərmək istədik».(١)

## GİZLİ DOĞUŞ

Həsən Əsgərinin (ə) imamət dövründə Bəni-Abbas hakimlərində dərin bir nigarançılıq vardı. Onları narahat edən həzrət Peyğəmbər (s) və mə'sum imamlardan nəql olunmuş çoxsaylı hədislərdə imam Həsən Əsgərinin (ə) dünyanı ədalətlə dolduracaq övladının dünyaya gəlməsi xəbəri idi. Bu şəxs bütün batil hakimiyyətləri süquta uğratmalı, yer üzündə zülmün kökünü kəsməli idi. Abbasilərin bu uşağın dünyaya .gəlməsinə mane olmaq istəkləri imamı narahat edirdi

Bütün bu səbəblərə görə də imam Mehdinin (ə) dünyaya gəlişi xalqdan gizli saxlanılırdı. İmam Riza (ə) buyurur ki, həzrət Mehdinin (ə) xüsusiyyətlərindən biri onun dünyaya gizli gəlişidir. Çoxsaylı hədislərdə bildirilir ki, həzrət Mehdinin (ə) həzrət İbrahim və .həzrət Musaya oxşarlıqları vardır

İmam dünyaya gəldikdən sonra imam Həsən Əsgərinin (ə) səhabələri və yaxınlarından savay kimsə onun gəlişindən xəbər tutmadı. Uyğun hadisədən kimlərin .xəbər tutması haqqında söhbətimizin davamında danışacağıq

## İMAMIN XÜSUSİYYƏTLƏRİ

Mühəddislər və tarixçilər həzrət Peyğəmbərdən (s) və mə'sum imamlardan nəql olunmuş rəvayətlərə əsasən öz kitablarında həzrət Mehdinin (ə) xüsusiyyətləri .haqqında mə'lumatlar vermişlər. Onlardan bə'zilərini nəzərdən keçiririk

Həzrət Mehdinin (ə) çöhrəsi gənc və buğdayı, qaşları hilal və dartılmış, gözləri qara və iri, çiyinləri enli, dişləri parıltılı, burnu gərilmiş və gözəl, alını uca və parlaq, sümükləri möhkəm, əlləri və barmaqları iri, yanaqları arıq və azca sarımtıl, sağ yanağında müşki bir xal, əzələləri möhkəm, saçları qulaqlarına tökülmüş, vücudu mütənasib və gözəl,

.görünüşü xoş və iki çiyni arasında peyğəmbər nişanəsi kimi bir nişanə

Həzrət Peyğəmbər (s), İslamın girami xanımı həzrət Fatimə (s) övladı olması imam



---

Qəsəs» surəsi, ayə ۵-۶» [۳] -۱

Mehdinin (ə) səciyyəvi xüsusiyyətlərindəndir. Onun iki qeyb dövrü olmuşdur. Həzrət .yer üzündə zülm-sitəm ərşə dirəndiyi bir vaxt ədaləti bərpa edəsidir

Bəli, Mehdi (ə) belə bir şəxsiyyətdir. Onun özünün, zühurunun dəqiq sadalanmış əlamətləri vardır. O hazırda qeybdədir. Həzrət Mehdi (ə) haqqın xəlifəsi, mütləq vəlidir. O, övliyaların sonuncusu, canişinlər canişini, son xilaskardır. O gələcək ki, Kə'bəyə istinad edərək peyğəmbər bayrağını əlinə alsın, Allahın dinini canlandırsın, bütün yer üzündə ilahi hökmləri rəhbər etsin. O, əlində qılınc gələr və yer üzünü bürümüş fitnə-.fəsadın kökünü kəsər. Bütün yer üzündə mehribanlıq və ədalət hakim olar

Həzrət (ə) qiyam və cihad, ibadət və təcəhhüd, xüzu və xüşu, zöhd və sadəlik, səbr və dözüm, ədalət və ehsan əhlidir. Həzrət (ə) elm və biliyin zirvəsi, ədalət və bərəkətin .tə'minatçısıdır

Həzrət Mehdinin (ə) xarakteri, tərbiyəvi, ictimai-siyasi və digər xüsusiyyətləri .haqqında söhbətlərimizin davamında bəhs edəcəyik

## QEYB DÖVRÜ

Həzrət Mehdinin (ə) həyatını üç dövrə bölmək olar: İxtifa (pünhan olma), kiçik qeyb dövrü, böyük qeyb dövrü. Həzrətin zühur dövrü və zühurdan sonrakı dönəm də onun .həyatının tərkib hissələrindən sayıla bilər

Bəli, həzrətin həyatının ilk dövrü onun gizli halda yaşadığı ixtifa dövrüdür. Bu dövr onun dünyaya gəlişindən (hicri ٢٥٥) atası imam Həsən Əsgərinin (ə) dünyadan köçməsinədək (hicri ٢۶٠) davam etmişdir. Bu beş il müddətində həzrət atası ilə .yaşamışdır

Həmin vaxt imam Həsən Əsgərinin (ə) iki əsas vəzifəsi olmuşdur: Öz övladını Abbasi xəlifələrindən qorumaq və onun on ikinci imam olduğunu sübut və e'lan etmək. İmam Həsən Əsgəri (ə) hər iki işin öhdəsindən ən üstün şəkildə gəldi. O həm övladını qorudu, həm də münasib fürsətlərdə onu öz yaxınlarına tanıtdırdı. Abbasilərin təhlükəsi səbəbindən həzrət Mehdidən (ə) yalnız müəyyən adamlar xəbər tuta bilirdi. Əbu Haşim Cəfəri, Əhməd ibn İshaq, Həkimə, Xədicə, imam Həsən Əsgərinin (ə) bibiləri .imam Mehdinin (ə) dünyaya gəlişindən agah olmuşdular

Müaviyə ibn Həkəm, Məhəmməd ibn Əyyub ibn Nuh, Məhəmməd ibn Osman Əmri nəql edirlər ki, qırx şiə müsəlman imamın hüzurunda idi. Həzrət (ə) övladını bizə göstərib buyurdu: «O, məndən sonra sizin imamınız və mənim canişinimdir. Ona itaət edin, ətrafından dağılmayın ki, həlak olarsınız və dininiz əlinizdən çıxar. Onu da bilin ki, bu gündən başlayaraq onu görməyəcəksiniz».

İmam Həsən Əsgəri (ə) övladının həyatını hifz etmək üçün onu e’tibarlı bir yerə göndərmək qərarına gəldi. Tarixi mənbələrin bildirdiyinə görə o öz övladını əvvəlcə Samirrada, sonra isə Mədinədə gizlətdi. İmam Mehdi (ə) Mədinədə ata nənəsinin himayəsində yaşayırdı. Səduqun nəql etdiyinə əsasən imam Həsən Əsgəri (ə) övladı .dünyaya gələndən qırx gün sonra onu namə’lum bir yerə göndərdi

Məs’udinin bildirdiyinə görə imam Həsən Əsgəri (ə) hicri ٢٥٩-cu ildə öz anası Hədisdən həccə getməsini istədi. Hədis və onun nəvəsi Əhməd ibn Mütəhhərin nəzarəti altında Məkkəyə yola düşdü. Olsun ki, onlar həcc əməllərini yerinə yetirdikdən sonra Mədinəyə üz tutdular. Bir çox rəvayətlərdə də bu baxış təsdiqlənir. Çünki Əbu Haşim Cə’fəri imam Həsən Əsgəridən (ə) ondan sonrakı canişin haqqında soruşduqda imam .«buyurdu: «O Mədinədədir

Bə’zi alimlərin araşdırmalarına əsasən daha çox ehtimal etmək olar ki, on ikinci imam öz uşaqlıq dövrünün əsas hissəsini Mədinədə keçirmişdir. Çünki imam Həsən Əsgəri (ə) övladının İraqda qalacağı təqdirdə onu gözləyən təhlükəni düzgün .qiymətləndirmişdi

Biz növbəti söhbətlərimizdə Abbasilərin imam Mehdini (ə) ələ keçirmək üçün .göstərdikləri sə’ylər haqqında danışacağıq

**(«KİÇİK QEYB («ĞEYBƏTE–SUĞRA**

Hicri ٢۶٠-cı ildə imam Həsən Əsgərinin (ə) şəhadətindən sonra qısa müddətli qeyb dövrü başlandı və imamın bu qeybi hicri ٣٢٩-cu ilə qədər davam etdi. Demək, kiçik qeyb dövrü yetmiş il çəkmişdir. Bu dövr nisbətən qısa zamanı əhatə etdiyindən ona kiçik qeyb dövrü demişlər. Böyük qeyb dövrünə şiələrin hazırlığında kiçik qeyb dövrü .mühüm rol oynamışdır

Kiçik qeyb dövründə imam insanların nəzərlərindən qeybdə olsa da, imamla təmasda olanlar var idi. Həmin bu dövrdə imamın xüsusi naibləri onunla əlaqə saxlayırdılar. Hər bir şiə müsəlman həmin naiblər vasitəsi ilə imama müraciət edib, öz müşkülünü həll edə bilirdi. Bə’zən bu naiblər vasitəsi ilə insanlar qrup şəklində imamla görüşə gəlmişlər. İmamın xüsusi naibləri dörd nəfər olmuşdur və onları «nəvvabe-ərbəə»

:adlandırmışlar. Böyük şiə alimlərindən ibarət olan bu insanlarla tanış olaq

Əbu Əmr (Osman ibn Səid Əmri) hicri ۲۶۰-۲۶۷-ci illərdə, naiblik vəzifəsini yerinə .۱ yetirmişdir; ۲. Əbu Cə’fər (Məhəmməd ibn Osman Əmri) hicri ۲۶۷-۳۰۵-ci illərdə imamın səfiri olmuşdur; ۳. Əbül-Qasim (Hüseyn ibn Ruh Növbəxti) hicri ۳۰۵-۳۲۶-cı illərdə naiblik vəzifəsini icra etmişdir; ۴. Əbül-Həsən (Əli ibn Məhəmməd Səmmuri) hicri ۳۲۶-۳۲۹-cu .illərdə imamın naibi olmuşdur

Bu dörd şəxsin həyat və fəaliyyətləri ilə kitabın altıncı fəslində tanış olacaqsınız. Onlar .öz məxfi vəkillik qurumları vasitəsi ilə şiələri böyük qeyb dövrünə hazırlamışlar

## («BÖYÜK QEYB («ĞEYBƏTE–KÜBRA

İmam Mehdinin (ə) həyatının üçüncü mərhələsini böyük qeyb dövrü təşkil edir. Kiçik qeyb dövrü başa çatdıqdan sonra böyük qeyb dövrü başlamışdır və bu günədək davam edir. Həzrət imamın qəbulu, rəhbərliyi və bütün yer üzünə hakimiyyəti üçün .şərtlər ödəndiyi vaxt həzrət zühur edəsidir

Böyük qeyb dövrü insanlar üçün geniş imtahan meydanıdır. Məhz bu mərhələdə insanlar, mö'minlər və onların iman və əməlləri sınaqdan keçirilir. Böyük qeyb dövrü ərzində Allahın höccəti olan imam Mehdi (ə) bulud arxasındakı günəş tək qeyb pərdəsi .arxasından bəşəriyyəti öz nurundan faydalandırır

Qeyb özü iki mərhələyə bölündüyü kimi, naiblik də iki mərhələyə bölünür: Kiçik qeyb dövründəki xüsusi naiblik və böyük qeyb dövründəki ümumi naiblik. Xüsusi naiblik dövründə imam müəyyən şəxsləri özünə naib tə'yin edir və onların adlarını bildirir. Ümumi naiblik dövründə isə imam naibliyin şərtlərini bəyan edir və bu şərtlərə malik olan hər bir insan imamın naibi sayılır. İmamın naibi cəmiyyətin dini və dünyəvi işlərinə .rəhbərlik edir

Şeyx Tusi, Şeyx Səduq, Şeyx Təbərsi İshaq ibn Əmmarın belə dediyini nəql edirlər: «Mövlamız həzrət Mehdi (ə) şiələrin qeyb dövründəki vəzifələri haqqında belə buyurmuşdur: «Baş vermiş hadisələr zamanı bizim hədislərimizi nəql edənlərə üz tutun ki, onlar mənim höccətim sayılırlar, mən isə Allahın onlara olan höccətiyəm». Təbərsi öz «Əl-ehticac» kitabında imam Sadiqin (ə) belə buyurduğunu nəql edir: «Fəqihlərdən hər biri nəfsini qorusa, dininə nəzarətçi olsa, nəfs istəklərinə qarşı çıxsa, mövlanın .«əmrlərinə müt'i olsa, ona təqlid etmək vacibdir

Bu yolla böyük qeyb dövründə müsəlmanlara rəhbərlik vəzifəsi vəliyye-fəqihin üzərinə düşmüşdür. Onun göstərişlərini yerinə yetirmək vacibdir. Fətva vermək, mühakimə etmək, hökm çıxarmaq səlahiyyətləri fəqihlərə çox-çox əvvəllər mə'sum imamlar tərəfindən verilmişdirsə də, fəqih hakimiyyəti qeyd olunan tarixdən rəsmi şəkil

almışdır və həzrətin zühurunadək davam edəsidir. Həzrət Mehdinin (ə) zühurundan .sonra bütün hakimiyyət Allah övliyalarının ixtiyarına veriləsidir

## XÜLASƏ

Bütün şiə və sünni tarixçilərinin və mühəddislərinin dediyinə əsasən, imam Mehdi (ə) şiələrin on ikinci imamı və peyğəmbərin son canişinidir. O hicri ۲۵۵-ci (۲۵۶) ildə, ۱۵

şə’ban tarixində Samirra şəhərində cümə günü sübh erkən dünyaya göz açmışdır. Atası imam Həsən Əsgəri (ə), anası dövrünün ən pak qadınlarından sayılan Nərcis .olmuşdur

Həzrətin ən məşhur ləqəbi Mehdidir və üzüyünün qaşında onun «höccət» ləqəbi nəqş .olunmuşdur

Həzrətin əksər xüsusiyyətləri sadalandığından yalan iddialara yer qalmır. Onun həyatı :bir neçə dövrə bölünmüşdür

İxtifa dövrü-bu dövr imam Həsən Əsgərinin şəhadətinədək beş il davam etmişdir. Bu ;dövrdə həzrəti yalnız peyğəmbər ailəsinə yaxın insanlar görə bilmişlər

Həzrətin həyatının ikinci dövrü yetmiş il davam etmiş kiçik qeyb dövrüdür. Bu dövr imam Həsən Əsgərinin (ə) şəhadət anından başlayaraq hicri ۳۲۹-cu planlarədək davam etmişdir. İmamın dörd xüsusi naibindən sonuncusu da məhz həmin ildə dünyasını .dəyişmişdir

Həmin bu dövrdə şiələr öz sualları ilə həmin dörd naib vasitəsi ilə həzrətə müraciət etmişlər. Həmin dörd şəxs böyük şiə alimlərindən olan təqvalı şəxslərdir. Osman ibn .Səid, Məhəmməd ibn Osman, Hüseyn ibn Ruh Növbəxti, Əli ibn Məhəmməd Səmmuri

Həzrətin həyatının böyük qeyb dövrü adlanan dövrü hicri ۳۲۹-cu ildən başlayaraq bu günədək davam etməkdədir. Onun yer üzünə rəhbərliyi üçün şərait yarananadək bu dövr davam edəsidir. Həmin bu dövrdə imam öz naiblərinin xüsusiyyətlərini sadalamışdır. Bu xüsusiyyətləri daşıyan hər bir şəxs onun naibi sayılır. Belə bir məqam .imamın özü və digər imamlar tərəfindən layiqli şəxslərə verilir

səh:۱۶

## ÜÇÜNCÜ FƏSİL

## KİÇİK QEYB DÖVRÜNDƏN QABAĞ ABBASİLƏR ZAMANINDA İCTİMAİ–SİYASİ VƏ İDEOLOJİ VƏZİYYƏT

Kiçik qeyb dövrünün siyasi tarixini daha yaxşı bilmək, on ikinci imamın (ə) qeybə çəkilməsinin səbəblərini və şəraitini öyrənmək üçün həmin dövrün ictimai-siyasi ideoloji vəziyyətini araşdırmaq zəruridir.

Abbasilər sülaləsinin xilafəti beş əsrdən uzun çəkdi (hicri ١٣٢-٦٥٦; miladi ٧٩٤-١٢٥٨). Bu xilafət Əbül-Əbbas Səffahın hakimiyyətindən başladı və bu hakimiyyət Bağdadda tatarlar tərəfindən süquta uğradılanadək davam etdi. Tarixçilər Abbasilərin xilafət tarixini dörd hissəyə bölürlər:

Hicri ١٣٢-٢٣٢; miladi ٧٤٩-٨٤٧; ilkin Abbasilər dövrü və ya farsların nüfuz dövrü;

Hicri ٢٣٢-٣٣٤; miladi ٨٤٦-٩٤٥; ikinci Abbasilər dövrü və ya türklərin nüfuz dövrü;

Hicri ٣٣٤-٤٤٧; miladi ٩٤٥-١٠٥٥; üçüncü Abbasilər dövrü və ya farslardan Ali-Buyə dövrü;

Hicri ٤٤٧-٦٥٦; miladi ١٠٥٥-١٢٥٨; dördüncü Abbasilər dövrü və ya Səlcuq türklərinin nüfuz dövrü.

Biz ikinci Abbasilər dövrünü, yə’ni Mütəvəkkilin xilafət zamanını, türklərin nüfuz dönəmini araşdırmaq fikrindəyik. Həmin dövrdə Mö’təsimin xilafəti zamanı türklər xilafət qurumuna daxil oldu, xilafət mərkəzi Bağdaddan Samirraya köçürüldü və kiçik qeyb başladı. Bu araşdırma Samirra şəhərinin mərkəzə çevrilməsi prosesinə bir baxışdır. Bu dövr bə’zi xüsusiyyətlərinə görə ilkin Abbasilər dövrünə bənzəsə də, onun fərqli cəhətləri çoxdur. Həmin dövrün özünəməxsus xüsusiyyətlərini sadalamaq olar. Bu xüsusiyyətlər uyğun dövrün ictimai-siyasi vəziyyətini və ideoloji durumunu əks etdirir. Həmin dövrdə şiələrin vəziyyətini və rəhbərliyin ictimai qurumunu ayrıca nəzərdən keçirəcəyik.

### SİYASİ VƏZİYYƏT

١. Mərkəzin Bağdaddan Samirraya köçürülməsi.

Samirra şəhəri («Surrə mən rəa») hicri ۲۲۰-ci ildə abbasi xəlifəsi Mö’təsim tərəfindən paytaxt seçildi və hicri ۲۲۱-ci ildə onun göstərişi ilə abad edildi. Elə həmin il də paytaxt .bu şəhərə köçürüldü

Bəs bu şəhərin salınmasında məqsəd nə idi? Mö’təsim hakimiyyətə gəldikdə anası Mardə türk kənizi olduğundan və Mö’təsim türklərin köməyi ilə hakimiyyətə gəldiyindən türklərə qarşı xüsusi bir münasibət bəsləyirdi. Mö’təsim türk qulamları almağa maraqlı idi. Onun bu marağı nəticəsində Bağdadda dörd min türk vardı. Onlar xəlifənin göstərişi ilə fərqli

libaslar geyinir və öz görkəmləri ilə başqa döyüşçülərdən seçilirdilər. Xəlifə onlara .Bağdad küçələrində süvari hərəkət etməyə icazə vermişdi

Bağdad əhalisi türklər tərəfindən incidilirdi. Onlar şəhər əhli ilə olduqca kobud rəftar edirdilər. Camaat bə'zən türk döyüşçülərinə hücum edib onları öldürürdü. Canı boğaza yığılmış Bağdad əhli Mö'təsimə müraciət edərək dedi: «Əgər türk qoşununu bizdən uzaqlaşdırmasan, səninlə savaşa qalxacağıq». Mö'təsim təəccüblə soruşdu: «Necə savaşacaqsınız?» Dedilər: «Sübhün oxları ilə!» Mö'təsim soruşdu: «Bu sözdə məqsədiniz «!nədir?» Cavab verdilər: «Sənə lə'nət yağdıracağıq

Məşhur tarixçi İbn-Əsir bildirir ki, Mö'təsimin paytaxtı Bağdaddan Samirraya köçürməsinin əsas səbəbi onun öz qoşununa inanmaması idi. İbn-Əsir yazır: «Hicri ۲۲۰-ci ildə Mö'təsim Samirra məhəllinə gələrək, burada şəhər salmaq qərarını verdi. O, açıq-aşkar bildirirdi ki, öz qoşunundan qorxur. Deyirdi ki, əgər qoşun bir dəfə ayağa qalxsa, onun bütün qulamlarını qətlə yetirər. Mö'təsim elə bir yer seçmək istəyirdi ki, .bir hadisə baş verdiyi təqdirdə səhra vasitəsi ilə qiyamçılara hücum edə bilsin

Elə həmin vaxtdan da Abbasilər xilafətinin mərkəzi əlli doqquz il müddətində Samirraya köçürüldü. Samirra xilafətin mərkəzi olduğu vaxt çox inkişaf etdi. Samirra tarixində yazıldığına görə şəhərdəki binanın uzunluğu səkkiz fərsəxdən uzun idi. Amma xilafət mərkəzi Bağdada qaytarıldıqdan sonra Samirra sür'ətlə xarabaya çevrilməyə başladı. Samirrada qalan imam Hadi (ə) və imam Həsən Əsgərinin (ə) qəbirləri və imam Mehdinin (ə) qeyb məkanı oldu. Hicri VII əsrin əvvəllərində dünyasını dəyişmiş Yaqut Həməvi Samirra xarabalıqlarını belə təsvir edir: «Həzrət Mehdinin (ə) sərdabəsi və Kərx məhəlləsindən savay bütün Samirra xarabaya dönmüşdür. Şəhəri seyr edən insanı dəhşət bürüyür. Hansı ki, yer üzündə belə bir gözəl və geniş şəhər .olmamışdı

Samirra Abbasilər xilafətinin mərkəzi olduğu vaxt hakimiyyətdə yeddi xəlifə oldu: Mö'təsim (hicri ۲۱۸-۲۲۷), Vasiq (hicri ۲۲۷-۲۳۲), Mütəvəkkil (hicri ۲۳۲-۲۴۷), Müntəsir (hicri ۲۴۷-۲۴۸), Müstəin (hicri ۲۴۸-۲۵۲), Muəttəz (hicri ۲۵۲-۲۵۵), Möhtədi (hicri ۲۵۵-۲۵۶), .(Mö'təməd (hicri ۲۵۶-۲۷۹

Hicri ۲۷۹-cu ildə Mö'təməddən sonra Mö'təzəd hakimiyyətə gəldi. Onun hakimiyyəti

.dövründə xilafətin mərkəzi yenidən Bağdada köçürüldü

## TÜRKLƏRİN NÜFUZU VƏ HAKİMİYYƏTİ

Uyğun dövrün mühüm xüsusiyyətlərindən biri türklərin xilafətdəki bütün əsas işləri əllərinə alması idi. Xüsusi ilə qoşun türklərin əlində idi. Ona görə də ikinci Abbasilər dövrü

türklərin nüfuz dövrü adlandırılır. Əsasən Mö’təsimin dövründə türklərə yaranmış marağın əsas səbəbi farsların hakimiyyətindən qurtarmaq arzusu idi. Türklər Mütəvəkkili qətlə yetirməklə öz nüfuzlarını zirvəyə qaldırdılar. Türklər öz döyüşkənlikləri ilə seçilir, idarəçilik işlərində isə özlərini göstərə bilmirdilər. Xəlifələrin əyyaşlığı səbəbindən onların nüfuzu günbəgün artırdı. Xilafətin idarəçiliyində Buğayi-Şərafiye-Küçək və Vəsif ibn Baqir Türki adlı iki türk başqalarından seçilirdilər. Bu iki :şəxsin xəlifəyə tə’siri haqqında, hətta belə bir şe’r də qoşulmuşdur

,Xəlifə oturmuş bağlı qəfəsdə

.Vəsiflə Buğanın məhbusu olmuş

Onların dediyin höccələyərək

.Tutu tək oturub xəyala dalmış

İbn-Təbatəba deyir: «Türklər Mütəvəkkili öldürdükdən sonra ölkəyə nəzarəti tam ələ aldılar. Onlar o qədər qüdrətlənmişdilər ki, xəlifə onların əlində sanki əsir olmuşdu. .«Onlar istədikləri vaxt xəlifəni öldürə bilərdilər

Aşağıda nəzərinizə çatdırılacaq əhvalatlar türklərin xilafətdə nüfuzunu və qüdrətini .əyani şəkildə göstərir

Bir gün Müəttəz xəlifəlik taxtına oturdu. O, yaxınlarını ətrafına toplayıb münəccimləri də’vət etdi və onlardan xəlifəliyinin nə qədər çəkəcəyi barədə soruşdu. Məclisdəkilərdən biri dedi: «Mən xəlifənin ömrünü münəccimlərdən də dəqiq deyə bilərəm. O, türklər istəyənə qədər yaşayacaq». Bütün məclisdəkilər onun sözlərini ... gülüşlə qarşıladılar

Bir gün bir qrup türk abbasi xəlifəsi Müttəzin qəsrinə daxil oldu. Türklər xəlifəni onun öz otağında yerə yıxıb bəs deyincə kötəklədilər, əynindəki pal-paltarlarını cırıb-dağıtdılar, özünü isə qəsrin həyətində günəşin altında saxladılar. Günəşin istisindən xəlifə bir ayağını götürüb o birisini qoyurdu. Sonra ona yenidən işgəncə verərək otağına apardılar. Bir qrup adam də’vət edib xəlifənin xilafətdən uzaqlaşması barədə şəhadət aldılar. Sonra onu ac-susuz saxlayıb yarıcan halda diri-diri sərdabədə dəfn

.etdilər

## TƏLƏSİK TƏ’YİNATLAR VƏ QADINLARIN BU İŞDƏ ROLU

Hər hansı bir siyasi quruluşun zəifləməsinin səbəblərindən biri, yersiz tə’yinatlar və aramsız vəzifə dəyişiklikləridir. Abbasilər dövlətinin nazirlər qurumundakı dəyişikliklər, bu

işdə rol oynayan rüşvətxorluq uyğun xilafətin tənəzzülünün əsas səbəblərindəndir. Bu işdə xəlifələrin arvadlarının və analarının da xüsusi rolu olmuşdur. Xəlifələrin həvəsbaz arvadlarının bu işdəki rolunu unutmaq olmaz. Məsələn, Mütəvəkkilin arvadı Müstəini hakimiyyətdən uzaqlaşdırıb, öz oğlu Müəttəzi onun yerinə tə’yin etdi. Doktor İbrahim Həsən qadınların hakimiyyətdə rolunu ətraflı şəkildə araşdırmış, onların müdaxilələri .haqqında ətraflı mə’lumatlar vermişdir

## VƏZİRLƏRİN VƏ ƏMİRLƏRİN ZÜLMÜ

Əksər abbasi vəzirləri və əmirləri zalım adamlardı. Onlar xalqı təhqir edir, var-yoxunu əlindən alır, bütün haqlarını tapdayırdılar. Onlar öz azğınlıqlarında kimsədən çəkinmirdilər. Həmin dövrdə baş vermiş haqsızlıqlar dillər əzbəri idi. Müxtəlif xəlifələrin .və onların vəzirlərinin zülmü yerə-göyə sığmırdı

Abbasi Müntəsirin dövründə onun vəziri Əhməd ibn Əlxəsib süvari halda yol ilə gedərkən bir kişi ona yaxınlaşıb şikayət edir. Vəzir atdan düşmədən ayağı ilə həmin adamın sinəsinə bir təpik vurur. Kişi yerindəcə keçinir. Həmin dövrün şairlərindən biri :bu hadisəni qələmə da almışdır

:Xilafət kürsüsündə oturana söyləyin

.Vəziri harınlayıb təpik atır millətə

,Qoy ayağın bağlayıb, canımızı qurtarsın

.Xalqın malı-puluyla çatmışdır o sərvətə

Xəlifə Vasiqin dövründə də onun vəziri Məhəmməd ibn Əbdül Məlik Əzzəyat xalqa işgəncə vermək üçün təndir düzəltmiş və onun içində mıxlar qurmuşdu. Maraqlıdır ki, .bu şəxs nəhayətdə özü həmin təndirdə canını əldən verdi

Xilafətin başqa mə’murları da vəzirlərdən az zülm etmirdi. Bu zülmlər səbəbindən ayrı-ayrı məntəqələrdə tez-tez qiyamlar qalxırdı. Bu barədə azca sonra danışacağıq. Söhbətimizin davamında həmin dövrün ictimai vəziyyətini araşdıracaq, cəmiyyəti .bürümüş rüşvətxorluq, satqınlıq, mə’mur özbaşınalığı haqqında söhbət edəcəyik

## DAXİLİ E’TİRAZLAR VƏ QİYAMLAR

Bir tərəfdən xəlifə və onun mə’murlarının əyyaşlığı, beytül-malı qarət etməsi, digər bir tərəfdən geniş xalq kütlələrinə edilən zülm ölkə daxilində çaxnaşmalar yaradırdı. .Bütün bu qiyamların səbəbi xilafətin zalımlığı və zəifliyi idi

Bə’zən ölkə daxilindəki çaxnaşmalar şər insanlar tərəfindən törədilirdi. Xaricilərin «Xəvaric» qiyamını buna misal göstərmək olar. Bə’zi hərəkatların səbəbi isə xalqa verilən dözülməz işgəncələr, türklərin istilası idi. Üçüncü qisim e’tirazların əsasını peyğəmbər ayinlərinin ələvilər tərəfindən müdafiəsi təşkil edirdi. Əlbəttə ki, bu sayaq qiyamlar da bir-birindən fərqlənirdi. Qiyamı qaldıranların xalisliyi onun necəliyində də tə’yinedici rol oynayırdı. Ümumi şəkildə peyğəmbər ayinlərinin müdafiəsinə qalxanlar böyük qəhrəmanlıqlar göstərir, zalım xəlifələrə e’tirazlarını bildirirdilər. Söhbətimizin davamında həmin dövrün diqqəti daha çox cəlb edən e’tirazlarını nəzərdən keçirəcəyik.

## BAĞDAD ÇAXNAŞMASI

Bağdad həmin dövrdə xilafət mərkəzi olmasa da, bir çox fitnə və çaxnaşmalar məhz orada baş verirdi.

Hicri ۲۴۹-cu ildə Bağdadda döyüşçülər və şakiriyyə qiyam qaldırdı. Bütün xalq qiyamçılara qoşuldu. Qiyamçılar zindanlara hücum çəkib məhbusları azad etdilər. Kütlə Bağdadın hər iki körpüsünü məhv etdi. İki dövlət nümayəndəsinin də imarəti qarət edildi. Bu qiyamın səbəblərindən biri Mütəvəkkili qətlə yetirmiş türklərə e’tiraz idi. Çünki türklər istədikləri xəlifəni öldürür, istədikləri şəxsi onun yerinə tə’yin edirdilər. Bu məsələlərdə müsəlmanların və dinin məsləhəti nəzərə alınmırdı. Hicri ۲۵۲-ci ildə Bağdad qoşunu öz haqqını tələb edərək qiyama qalxdı. İlk əvvəl onlara müəyyən məbləğ pul verməklə sakitləşdirə bildilər. Amma çox keçmədi ki, qiyam yenidən qızışdı. Onlar özlərinə başçı tə’yin edərək, xəlifə Müəttəzin xətibini dinləmək istəmirdilər. Qiyamçılar Bağdad körpüsünü ələ keçirib, ətrafdakı dükanları qarət etdilər. Bütün Bağdad od tutub yanırdı. Nəhayət, qiyamçılardan ikisinin xəyanəti nəticəsində qiyam Məhəmməd ibn Əbdüllah ibn Tahir tərəfindən yatırıldı.

## SAMİRRA ÇAXNAŞMALARI

Hicri ۲۴۹-cu ildə bir qrup namə’lum şəxs Samirrada qiyam qaldıraraq, zindanlara hücum etdi və məhbuslar azad edildi. Xilafətin ixtiyarında olan qulamlar qiyamçılara hücum etsələr də, xalq qiyamçılara qoşularaq onları məğlubiyyətə uğratdı.

Hicri ۲۵۱-ci ildə Samirrada xalq qiyam qaldırdı. Bütün zərgər bazarı qarət edildi. Qarət edilmiş insanlar İbrahim Muəyyidə şikayət etdilər. Bir iş görməkdə aciz olan bu şəxs «yaxşı

olardı ki, mallarınızı və pullarınızı evlərinizdə saxlayaydınız» deyərək onları özündən .kənarlaşdırdı

## XƏVARİC FİTNƏSİ

Xəvaric fitnəsi hicri ۲۵۲-ci ildə başladı. Onların qiyamının başlanğıc nöqtəsi rəhbərləri Müsavirin ayağa qalxması oldu. Müsavir hicri ۲۵۴-cü ildə uyğun məntəqənin əksər yerlərini istila etmişdi. Onun qarşısını almaq istəyən xəlifə nümayəndəsi məğlub olduqdan sonra Müsavir daha çox nüfuz qazandı, əmirin evinə od vurub, məscidə gəldi və camaat namazında pişnamaz dayandı. Hicri ۲۵۵-ci ildə Müsavirlə döyüşə çıxan xəlifə qoşunu da müvəffəq ola bilmədi. Müsavir o qədər qüvvə əldə etdi ki, İraqın əksər şəhərləri onun hakimiyyəti altına keçdi. Artıq xəlifəyə xərac da göndərilmirdi. Nəhayət, hicri ۲۶۳-cü ildə saysız-hesabsız qarətlərdən sonra Müsavir dünyasını .dəyişdi

Müsavirdən sonra xəvaric arasında rəhbərlik məsələsində ixtilaf yarandı. Onlar bir-biri ilə savaşa qalxdılar. Nəhayət, Harun ibn Əbdüllah başçı seçildi. Ətrafında xeyli .qüvvənin toplandığını görən Harun bir çox məntəqələri nəzarət altına aldı

## SAHİBE–ZƏNCİN QİYAMI

Bu qiyam uyğun dövrün ən təhlükəli qiyamlarından idi. Bu qiyam Abbasilər xilafəti üçün türklərdən daha təhlükəli sayılırdı. Qiyam Bəsrədə başladı və Bağdad darvazalarınadək irəlilədi. İraqın böyük bir hissəsi bu qiyamın tə'siri altında idi. Abbasilər xilafətinin süqutu üçün real zəmin yaranmışdı. Bu qiyamda on minlərlə insan .öldürüldü, minlərlə insanın namusu ayaq altda qaldı, onlarla şəhərə od vuruldu

Sahibe-zənc hicri ۲۵۵-ci ildə Bəsrədə qiyam qaldırdı. Onun adı Əli ibn Məhəmməd idi. Özü bəni-Əbdül-Qeys qəbiləsindən idi. Bə'zi tarixçilər onun əsil adının Behbud olduğunu və əslən İranın Rey vilayətindən gəldiyini bildirirlər. O, ətrafına adam toplamaq məqsədi ilə özünü Ələvi kimi təqdim edir və İslamın əbədi şəhidi Zeyd ibn Əli ibn Hüseynin nəvəsi olduğunu bildirirdi. Belə bir şəxsin özünü İslam aləmində müstəsna xidmətləri olmuş bir ailəyə aid etməsi böyük zülm idi. İmam Həsən Əsgəri (ə) onun ələvi olduğunu rədd edərək buyurdu: «Sahibe-Zənc biz əhli-beytdən deyil». Bu

şəxs on beş il müddətində ara vermədən xalq arasında fəsad törətməklə məşğul oldu. Nəhayət hicri ٢٧٠-ci ildə öldürüldü; o, özünü ələvilərə aid etməkdən əlavə, məzlum xalqlara rəhbər olduğunu bəyan edirdi. Zalım hakimlərin sitəmi altında əzilən kütlələr onun bu şüarlarına aldanırdılar. O xalqın diqqətini cəlb etmək məqsədi ilə özünə «Sahibe-Zənc» adını götürmüşdü. Bu sözün mə’nası «qulların rəhbəri» deməkdir. Bə’zi tarixçilərin fikrincə Sahibe-Zəncin əqidəsinin

.kökləri Xəvaricdən olan Əzariqə firqəsinin əqidəsinə gedirdi

O ilkin olaraq Bəsrə qullarını ayağa qalxmağa çağırdı. Bütün qullara azadlıq və'd etdiyindən Sahibe-Zəncin ətrafında böyük kütlələr toplanırdı. O, kütlələrin qarşısında xütbə oxuyur, onlara azadlıq və sərvət və'd edirdi. Sahibe-Zənc kütlələr qarşısında .and içirdi ki, heç vaxt onlara münasibətdə hiylə işlətməyəcək

Qullar əlli, beş yüz nəfərlik qruplar şəklində ona qoşulurdular. O, qullardan əlavə, .əkinçiləri, kəndliləri və Abbasilərin digər müxaliflərini də qiyama çağırırdı

İş o yerə gəlib çatmışdı ki, qul sahibləri hər qulun müqabilində Sahibə-Zənc beş dinar ödəməyə razılaşmışdılar. Ağaların bu də'vətindən sonra Sahibe-Zəncə göstəriş verdi ki, hər bir ağaya və ağanın nümayəndəsinə beş yüz şallaq vurulsun. Fitnə beləcə alovlandı. Qullarda böyük bir inqilabi ruhiyyə yaranmışdı. Qiyamçılar Bəsrəni tutmaq qərarına gəldilər. Bəsrə əhli onların qarşısında üç gün müqavimət göstərsə də, axırda onların hiylələrinə aldanaraq təslim oldu. Qiyamçılar Bəsrə əhlinə toxunmayacaqlarını və'd etsələr də, şəhərə daxil olduqdan sonra şəhər əhlini qırmağa başladılar. Bütün şəhər və şəhərdəki məscidlər yandırıldı. Qiyamçılar Abadan, Əhvaz, Abilə, Əbül-xəsib .şəhərlərində də eyni cür rəftar etdilər

Hökumətin göndərdiyi qoşunun başçıları, o cümlədən Musa ibn Buğa qiyamçılarla döyüşdə məğlub oldu. Qiyamçıları yalnız Əbu Əhməd Müvəffəq Təlhə ibn Mütəvəkkil məğlub edə bildi. Bu şəxs elə bir müvəffəqiyyət qazandı ki, onun qardaşı xəlifə Mö'təmidin yalnız adı qaldı. Qoşun başçıları Müvəffəqin ölümündən sonra onun oğlu Əbül-Abbasa bey'ət etdilər və ona Əl-Mö'təzid Billah ləqəbini verdilər. Şübhəsiz ki, Mö'təzid də malik olduğu şöhrət və qüdrəti Sahibe-Zənclə döyüşlərdə əldə etmişdi. .Xilafət Bağdada köçürüldükdən sonra ilkin xəlifə də məhz bu şəxs oldu

## ƏLƏVİLƏRİN QİYAMLARI

Həmin bu dövrdə peyğəmbər ayinlərini əsas tutaraq ələvilər də bir çox qiyamlar qaldırdılar. Onlar öz qiyamları ilə xəlifələrin həddi aşmış zülmünə e'tiraz edir, xəlifələrin .bütün nöqtələrində səslərini qaldırırdılar

Uyğun qiyamlar haqqında danışmazdan qabaq xəlifələrin bu dəstədən olan insanlara

etdiyi zülmlərə nəzər salaq. Xəlifə Mütəvəkkil rəsmi olaraq Əli (ə) övladlarını düşmən tuturdu. Mütəvəkkilin ələvilərə etdiyi zülmün bütün xəlifəlik dövründə misli görünməmişdi. O, ələviləri iqtisadi mühasirəyə alır, onlara ehsan edilməsinə icazə vermir, göstərişini pozanları ciddi cəzalandırırdı. Onun cəzasından qorxan xalq .ələvilərə yardım etməkdən çəkinirdi

Ələvilər elə bir yoxsulluq həddinə çatmışdılar ki, bütün ələvi qadınların yalnız bir köynəyi vardı. Onlar bu köynəyi növbə ilə geyib namaz qılardılar. Bəli, çılpaq qalmış qadınlar çadırları tərk edə bilmirdilər. Elə həmin dövrdə Mütəvəkkil eyş-işrətə kisə-kisə pul xərcləyib, rəqqasələrin ayağı altına qızıl dinarlar səpirdi.

Həmin dövrün böyük yazıçısı Əbu Bəkr Xarəzmi Abbasilərin ələvilərə etdiyi zülmləri qələmə alaraq, Mütəvəkkilin cinayətləri haqqında belə deyir: «Hidayət rəhbərlərindən bir rəhbər, Peyğəmbər ailəsindən bir seyyid dünyadan getdikdə kimsə onun dəfnində iştirak etmir, ona qəbir qazılmır. Amma Abbasilərin təlxəyi öləndə özünü ədalətli sayan böyüklər, qazılar onun dəfnində iştirak edirlər. Peyğəmbər ailəsinin fədakar nümayəndələri məzlumiyyətdə qaldığı halda, təlxəklər üçün əzadarlıq mərasimləri qurulur! Yolunu azmışlar Abbasilərin əzizidir. Onlar yalnız şiələri qətlə yetirir, övladının adını «Əli» qoyanı qanına qəltan edirlər.

Mütəvəkkilin on iki min kənizi vardı. Amma peyğəmbər ailəsindən olan seyyidlər bir kəniz saxlamaq imkanından məhrum edilmişdi. Xümsün halal, sədəqənin haram olduğu peyğəmbər ailəsi fəqirliyin son həddində həlak olurdu. Biri qılıncını, o biri libasını girov qoyurdu. Onların yeganə günahı peyğəmbər nəslindən olmaları idi. Onlar yalnız Fatimə (s) övladları olduqları üçün əzaba düçar edilirdilər. Axı imam Hüseynin (ə) qəbrini şumlamış, oranı əkin sahəsinə çevirmiş bir qövm haqqında nə deyim!»

Mütəvəkkil Misirdəki hakiminə ələvilərlə aşağıdakı qaydalarda rəftar etməyi göstəriş vermişdi: «Heç bir ələviyə heç bir mülk verilməsin, heç bir ələvi atla gəzməsin və başqa şəhərlərə getməsin; ələvilərin birdən artıq qulu ola bilməz; əgər ələvi ilə qeyri-ələvi arasında mübahisə olarsa, qazı əvvəlcə qeyri-ələvini dinləsin, sonra ələvinin dediklərinə qulaq assın».

Təkcə Mütəvəkkil yox, elə başqa abbasi xəlifələri də şiə imamlarının və onların tərəfdarlarının qanına susamışdılar. Bu dövrdə şiə imamları qısa ömür sürmüş, xəlifələr

tərəfindən şəhadətə yetirilmişlər. İmam Cavad (ə) ٢٥ il, imam Hadi (ə) ۴١ il, imam Həsən Əsgəri (ə) ٢٨ il həyat sürmüşdür. Hansı ki, imamların hər hansı qiyamda iştirak .etməsi haqqında heç bir dəlil sübut olmamışdır

Biz bə’zi qiyamlarda imamların rolundan, onların abbasi xilafətinin sütunlarını sarsıtmaq üçün gördüyü işlərdən, ələvilərin müdafiəsində tutduqları mövqedən danışmadan, həmin dövrdə baş vermiş qiyamları və bu qiyamların rəhbərlərinin adlarını sadalamaqla kifayətlənirik. Bu qiyamlar Mö’təsimin xəlifəliyindən Mö’təmidin :xəlifəliyinin sonunadək yarım əsri əhatə edir

Məhəmməd ibn Qasimin qiyamı; bu şəxsin künyəsi Əbu-Cə’fər olmuşdur. O daha .١ çox sufi ləqəbi ilə tanınır. Çünki həmişə ağ yundan libas geyərmiş. Məhəmməd elm, fiqh, din və zöhd əhli olmuş, gözəl əxlaqı ilə seçilmişdir. O öz danışıqlarında daim ədalət .və tövhidin müdafiəsinə qalxmış, zeydiyyə, carudiyyə əqidəsinin tərəfdarı olmuşdur

O, Mö’təsimin dövründə Taliqanda qiyam qaldırdı. Əbdüllah ibn Tahir hicri ٢١٩-cu ildə onu həbs etdi və Mö’təsimin hüzuruna göndərdi. Məhəmməd xalqı peyğəmbər əhli-beytinin yoluna də’vət edirdi. Bə’zilərinin fikrincə, ona zəhər verilmişdir. Bə’zi zeydiyyə ardıcılları onun imam olduğuna inanırlar. Bə’ziləri isə onun sağ olduğuna və bir gün zühur edəcəyinə inamlı idilər. Məhəmməd zeydiyyə firqəsi tərəfindən qeybdə olan .Mehdi (ə) kimi qəbul olunur

Məhəmməd ibn Salehin qiyamı; künyəsi Əbu-Əbdüllah olmuş bu şəxs öz şücaəti ilə .٢ tanınmışdır. O, Əbu-Talib ailəsinin mədhində şe’rlər yazmışdır. Məhəmməd Mədinə yaxınlığındakı bir məntəqədə Mütəvəkkilə qarşı qiyam qaldırmışdır. Mütəvəkkil onun üzərinə qoşun göndərmiş və bu qoşun Məhəmmədi məğlub edərək, məntəqə əhlinə divan tutmuş, Məhəmmədi isə Samirraya gətirmişdir. Mütəvəkkilin göstərişi ilə .Məhəmməd Samirrada zindana salınmışdır

Yəhya ibn Ömərin qiyamı; künyəsi Əbül-Hüseyn olan bu şəxs Müstəinin xilafəti .٣ dövründə Kufədə qiyam qaldırmışdır. Yəhya zahid, müttəqi, abid, alim, çox şücaətli bir insan olmuşdur. Yəhya öz qiyamından qabaq imam Hüseynin (ə) qəbrini ziyarət etmiş və zəvvarları öz məqsədindən xəbərdar etmişdir. Həmin vaxt Kufəyə daxil olmuş və öz .qiyam məqsədini aşkarlamışdır

Bə’zi tarixçilər Yəhyanın qiyamının əsas səbəbi kimi onun Mütəvəkkil və türklər tərəfindən sıxıntıya salınmasını göstərirlər. Amma Əbül-Fərəc İsfəhani öz «Məqatilut-Talibin» kitabında bildirir ki, Yəhyanın qiyamının məqsədi yalnız Allahın razılığı olmuşdur. O, Kufədə xalqı peyğəmbər əhli-beytinin yoluna də’vət etmiş və ona çoxları qoşulmuşdur. Hətta Bağdad əhalisinin böyük bir hissəsi Yəhyanı rəhbər seçmişlər. Hansı ki, Bağdad əhli heç vaxt Yəhyadan qeyrisini dini rəhbər kimi qəbul etməmişdir. Kufənin bir çox düşüncəli və

.tədbirli insanları Yəhyaya bey’ət etmişlər

Hüseyn ibn İsmail onunla vuruşmuş və bu böyük insanı öldürüb başını Samirraya, Müstəinə göndərmişdir. Müstəin də öz növbəsində Yəhyanın başını Bağdada .göndərmişdir ki, xalqın ibrət götürməsi üçün onun başını meydanda dirəyə taxsınlar

Yəhyanı böyük məhəbbətlə sevən xalq onun ölümünə ağlamış, müsibətinə şe’rlər qoşmuşlar. Əbül Fərəc İsfəhani deyir: «Abbasilər xilafəti dövründə qətlə yetirilmiş heç .»bir ələvi üçün belə əzadarlıq keçirilməmiş, haqqında bu qədər şe’rlər yazılmamışdır

Həsən ibn Zeydin qiyamı; bu şəxs hicri ۲۵۰-ci ildə Təbəristanda qiyam qaldırdı və .۴ həmin məntəqəni özünə tabe etdi. Sonra Amul və Reyə hücum edərək həmin şəhərləri də özünə tabe etdi. Sonra Təbəristandan Qorqana hücum edildi. Qorqan böyük qurbanlar hesabına ələ keçirildi. Həsənin ölümündən sonra qardaşı Məhəmməd onun canişini oldu. Məhəmməd ۲۷۷-ci ildə Deyləmi tutdu. Bu iki qardaşın hər ikisi xalqı peyğəmbər əhli-beytinin yoluna də’vət etmişlər. Həsən ibn Zeyd fəqih, abid, səxavətli .bir insan olmuşdur

Həsən ibn Əli Həsəninin qiyamı; bu şəxs Məhəmməd ibn Zeyddən sonra .۵ Təbəristanda hakim olmuş, dünyasını dəyişdikdən sonra oğlu onun yerini tutmuşdur. Sonra isə qiyama Həsən ibn Qasim başçılıq etmişdir. Bu şəxs Təbəristanda qətlə .yetirildi. Hər üç şəxs peyğəmbər ailəsinin razılığı üçün qiyam qaldırmışdı

Məhəmməd ibn Cə’fər ibn Həsənin qiyamı; o hicri ۲۵۰-ci ildə Reydə qiyam qaldırdı və .۶ xalqı Təbəristan hakimi Həsən ibn Zeydin tabeçiliyinə də’vət etdi. O, Xorasan əhli ilə savaşda məğlub oldu və əsir düşdü. Onu Nişabura Məhəmməd ibn Əbdüllah ibn .Tahirin yanına apardılar. Məhəmməd zindana salındı, zindanda da dünyasını dəyişdi

Əhməd ibn İsanın qiyamı; bu şəxs hicri ۲۵۰-ci ildə Rey şəhərində Ərəfə günü bayram .۷ namazından sonra qiyam qaldırdı, xalqı əhli-beytin yoluna də’vət etdi. Əhməd .Məhəmməd ibn Tahirin qoşunu ilə vuruşdu və onu məğlub etdi

Həsən ibn İsmailin qiyamı; bu şəxs hicri ۲۵۰-ci ildə Qəzvin və Zəncanda qiyam .۸ qaldırdı və hökumət nümayəndələrini bu şəhərdən qovdu. Hicri ۲۵۲-ci ildə Sahib

Deyləm və İsa ibn Əhməd ibn Ələvi ilə birlikdə Reyə hücum etdi və şəhəri ələ keçirdi. Şəhər əhli onlara iki milyon dirhəm məbləğ ödəyərək canlarını xilas etdilər. Hicri ۲۵۳-cü .ildə Musa ibn Buğa Qəzvində onunla döyüşdü və onu məğlub etdi

Hüseyn ibn Məhəmmədin qiyamı; bu şəxs ۲۵۱-ci ildə Kufədə qiyam qaldırdı və . ۹ xəlifənin hakimini şəhərdən sürgün etdi. Müstəin Hüseynin qiyamını yatırmaq üçün Məzahim ibn Xaqanı onun üstünə göndərdi. Qiyam yatırıldı və şəhər yandırıldı. Məs’udi .«deyir: «Tərəfdarları onu tənha qoyduğundan Hüseyn gizlənməyə məcbur oldu

səh:۲۶

Məhəmməd ibn Cə’fərin qiyamı; o əvvəldə adı çəkilmiş Hüseyn ibn Məhəmmədin .۱۰ canişini olmuşdur. Kufədə qiyam qaldırmış Məhəmmədi Məhəmməd ibn Tahir hiylə işlədərək Kufə hakimi tə’yin etmiş, sonra həbs edərək Samirraya göndərmişdir. O .ölənədək zindanda qalmışdır

İraqın Neynəva məntəqəsindəki ələvi bir şəxsin qiyamı; Bu şəxs hicri ۲۵۱-ci ildə .۱۱ qiyam qaldırmışdır. Onun üzərinə göndərilmiş qoşun qiyamı yatırmış və bu şəxsi həbs .edərək Kufəyə göndərmişdir

İsmail ibn Yusifin qiyamı; bu şəxs hicri ۲۵۱-ci ildə Məkkədə qiyam qaldırmış, həmin il .۱۲ də dünyasını dəyişmişdir. Ondan iyirmi yaş böyük qardaşı Məhəmməd ibn Yusif onun canişini olmuşdur. Bu insanlar Məkkə əhlinə olmazın məşəqqətlərini vermişlər. Müəttəz Əbul-Sacı onun üzərinə göndərmiş və qiyam yatırılmışdır. Məhəmməd Məkkədən qaçaraq, Bəhreynə üz tutmuşdur. İsmail ibn Yusiflə Məkkə əhli arasında .baş vermiş döyüşdə İsmailin qardaşı Həsən ibn Yusif və Cə’fər ibn İsa öldürülmüşdür

İbn Musa ibn Əbdüllahın qiyamı; bu şəxs İsmail ibn Yusifdən sonra Mədinədə qiyam .۱۳ .qaldırmışdır

Əli ibn Əbdüllah Talibin qiyamı; bu şəxs Mər’əşi adı ilə tanınmışdır. O hicri ۲۵۱-ci ildə .۱۴ .Amulda qiyam qaldırmış, Əsəd ibn Cəndan tərəfindən məğlub edilmişdir

Əhməd ibn Məhəmmədin qiyamı; bu şəxs hicri ۲۵۵-ci ildə Bərqə və İsgəndəriyyə .۱۵ arasındakı məntəqədə qiyam qaldırmış və xilafət iddiasında olmuşdur. Misir əmiri Əhməd ibn Tulun bu qiyamı yatırmaq üçün onun üzərinə qoşun çəkmişdir. Əhməd böyük fədakarlıqlardan sonra öldürülmüşdür. Onun başı Misirə ibn Tuluna .göndərilmişdir. O da öz növbəsində qiyamçının başını Mö’təmədə çatdırmışdır

Əli ibn Zeyd və İsa ibn Cə’fər ələvinin qiyamı; bu iki şəxs hicri ۲۵۵-ci ildə Kufədə .۱۶ qiyam qaldırmışlar. Müəttəz onların üstünə böyük bir qoşun göndərmişdir. Səhabələri .dağıldığından hər iki şəxs məğlub edilmişdir

Əli ibn Zeydin qiyamı; bu şəxs ikinci dəfə təklikdə hicri ۲۵۶-cı ildə Kufədə qiyam .۱۷ qaldırdı. Xəlifənin nümayəndəsini qovub şəhəri ələ aldı. Mö’təmidin onun üzərinə

göndərdiyi qoşun məğlub edildi. Xəlifənin göndərdiyi ikinci qoşun böyük çətinliklərdən .sonra Əli ibn Zeydi məğlub etdi. Əli və onun tərəfdarlarının bir çoxu qətlə yetirildi

۱۸. İbrahim ibn Məhəmmədin qiyamı; bu şəxs ibn Sufi adı ilə tanınmışdır. O hicri ۲۵۶-cı ildə Misirdə qiyam qaldırmış və Əsna şəhərini tutmuşdur. Misir hakimi onun üzərinə qoşun göndərmiş, amma ibn Sufiyə məğlub olmuşdur. Növbəti dəfə göndərilən qoşun qiyamı yatırmış və qiyamçıların böyük əksəriyyəti qətlə yetirilmişdir. İbrahim qiyam yatırıldıqdan

sonra qaçıb meşələrdə gizlənmişdir. Hicri ۲۵۹-cu ildə növbəti dəfə Misirdə qiyam qaldırmış və xalqı qiyama çağırmışdır. Misir hakimi ibn Tulun növbəti dəfə onun üzərinə qoşun çəkmiş və onu məğlub etmişdir. İbrahim Məkkəyə qaçmış, Məkkə valisi tərəfindən tutulub ibn Tulunun hüzuruna göndərilmişdir. İbn Tulun onu bir müddət zindanda saxlayıb, sonradan azad etmişdir. İbn Sufi azad edildikdən sonra Mədinəyə .getmiş və ömrünün sonunadək orada qalmışdır

## NÜFUZ ALTINDA OLAN MƏNTƏQƏLƏRİN MUXTARİYYATI

Bura qədər deyilənlər Abbasilər xilafətinin daxili vəziyyətini işıqlandırdı. Abbasilərin xarici siyasəti, onların nüfuzu altında olan məntəqələr haqqında iki xüsusiyyəti qeyd etmək olar: Əvvəla, Abbasilər xilafətinin nüfuzu altında olan məntəqələrin muxtariyyatı vardı. Onlar bir çox işlərdə mərkəzi hökumətə tabe deyildilər. Onlar istədikləri vaxt azad şəkildə savaşa qalxırdılar. Bu məsələ onların fatehlik arzuları ilə bağlı idi. Söhbətimizin bu hissəsində Abbasilərin nəzarəti altında olan Əndəlos, şimali .Afrika, İran, Misir kimi məntəqələrin vəziyyəti ilə tanış olacağıq

## ƏNDƏLOS

Əndəlos İspaniyanın cənubunda yerləşən tarixi vilayətin adıdır. Əndəlos təkcə uyğun dövrdə yox, bu dövrdən əvvəl və sonra da müstəqil olmuşdur. «Əddaxil» adı ilə məşhur olan birinci Əbdürrəhman Əndəlosə nəzarət etdiyi vaxt yalnız iyirmi ay müddətində öz xütbələrində abbasi xəlifəsinin adını çəkmişdir. Bununla belə, Əndəlos heç bir .cəhətdən abbasi xilafətindən asılı olmamışdır

## (ŞİMALİ AFRİKA (TUNİS VƏ DİGƏR MƏNTƏQƏLƏR

Şimali Afrika Ali-Əğləb əmirlərinin hakimiyyəti altında müstəqil olmuşdur. Bu ölkədə yalnız xütbələr zamanı abbasi xəlifəsinin adı çəkilər və pul sikkələrinin üzərində xəlifənin nəqşi əks olunardı. Bu vəziyyət Fatimilərin babası Əbu-Əbdüllah, «Məhdiye-Afrikayi» hökumətini təşkil edənədək davam etdi. Ale-Əğləbin hakimiyyəti hicri ۲۹۶-cı ildə başa çatdı. Bu hadisələr zamanı Samirra və Bağdad hökumətlərinin bu məntəqədə .heç bir rolu yox idi

## İRAN

Mö’təsimin dövründə Fars və Məvəraun-nəhr məntəqələri savaş meydanına çevrilmişdi. Zəncan, Ərdəbil, Azərbaycan məntəqələrində Babək xürrəmi ilə xəlifə nümayəndələri Afşin və Buğay arasında silahlı qarşıdurma yaranmışdı. Bu cərəyan ٢٢١-ci ildən ٢٢٣-cü ilədək davam etdi. Nəhayət, Babək Mö’təsimin əmri ilə öldürüldü və .başı Xorasana göndərildi. Babəkin bədəni Samirrada dardan asıldı

Hicri ٢٢٤-cü ildə Mazyar Təbəristanda Mö’təsimin əleyhinə qiyam qaldırdı və onun qoşunu ilə savaşa qalxdı. Hicri ٢٣٤-cü ildə Mütəvəkkilin zindanından qaçmış Məhəmməd ibn Buəys səkkiz il müddətində Azərbaycanda çaxnaşmalar yaratdı. .Nəhayət, hökumət nümayəndəsi Buğaye-Şərafi onu məğlub edib şəhəri geri qaytardı

Buğa ibn-Buəysi Samirraya apardı, zindanda onun boynundan ağır bir daş asdı. İbn-.Buəys elə bu halda da dünyasını dəyişdi

Hicri ٢٣٨-ci ildə Tiflisdə İshaq ibn İsmail ilə Buğanın qoşunu arasında qarşıdurma oldu. Buğa şəhəri yandırdı. Şəhər sənubər şaxələrindən hazırlandığı üçün qısa bir müddətdə yanıb külə döndü. Şəhərdə əlli minə yaxın insan tələf oldu. Canını qurtaranlar əsir götürüldü. Buğanın döyüşçüləri hətta meyitləri də tikə-tikə doğrayıb, pal-paltarlarını .qarət edirdilər

Hicri ٢٥٣-cü ildə, Müəttəzin dövründə Həmədan kənarında Əbdül Əziz ibn Əbu Delf ilə iyirmi min qiyamçı füqəra və xəlifə ordusu arasında döyüş oldu. Xəlifə ordusuna Musa ibn Buğa rəhbərlik edirdi. Bu döyüşdə Əbdül Əziz məğlub oldu və onun tərəfdarları .öldürüldü

Yə’qub Ləys Qəffar dünyasını dəyişdikdən sonra Fars və İraq şəhərləri Yə’qub qoşununun hücumlarına mə’ruz qaldılar. Yə’qub Ləys onunla döyüşmək gücündə olmayan abbasi xəlifələrinə dostluq münasibətləri göstərmək istəyirdi. Çarəsiz qalmış xəlifələr onunla müdara edir, istəklərini nəzərə alırdılar. Yə’qub daim İranı Abbasilərin hakimiyyəti altından azad etmək istəyirdi. Sadəcə, bu istəyini aşkarlamırdı. Yalnız ölüm yatağında olduğu vaxt qasidlə xəlifəyə belə bir xəbər göndərdi: «Hazırda mən xəstə və gücsüzəm. Əgər ölsəm, mən sənin əlindən rahat olaram, sən də mənim əlimdən asudə olarsan. Yox əgər sağalıb ayağa dursam, aramızda döyüş öz sözünü deyəcək». Yə’qubun ölümündən sonra qardaşı Əmr ibn Ləys onun canişini oldu. Amma Əmr

.xəlifəyə məktub yazıb ona itaətini bildirdi

Hicri ۲۶۱-ci ildən başlayaraq Nəsr ibn Əhməd Samani böyük istiqlal əldə etdi və Mavəraunnəhrdən Buxaraya, Səmərqənddən Xorasanadək nəzarəti əlinə aldı. Nəsr .hicri ۲۷۹-cu ildə dünyasını dəyişdi və qardaşı İsmail ibn Əhməd onun canişini oldu

**MİSİR**

Misir hakimi Əhməd ibn Tulun türk idi və türk Babəxyal hicri ۲۵۴-cü ilə Müəttəzin .dövründə onu hakim göndərmişdi

Əhməd müstəqil fəaliyyət göstərirdi və işləri günbəgün irəli gedirdi. O ölüm .gününədək xəlifəyə heç bir ehtiyac duymasa da, onunla düşmənçilik etmədi

## SURİYA

Suriya və onun Hələb, Həməs, Dəməşq kimi şəhərləri başqalarının hədəfinə .çevrilmişdi və bu ərazilərdə qanlı döyüşlər gedirdi

## MOSUL

Mosul və onun ətrafındakı şəhərlər, eləcə də, həmin məntəqənin kürd əhalisi digər İslam şəhərləri kimi hücumlara mə'ruz qalırdı. Mosul hicri ۲۵۳-cü ildə qətl-qarət olundu. Xəlifənin qüvvələri tərəfindən işgəncələrə mə'ruz qalan bu əhali qiyam qaldırdı. Nəhayət, xəlifənin nümayəndəsi Mosuldan çıxarıldı. Mosul xəlifənin hakimiyyətini .qəbul etmək istəmədiyindən uzun illər boyu savaş meydanına çevrildi

## FƏTHLƏRİN MƏQSƏDLƏRİNİN DƏYİŞMƏSİ

Şübhəsiz ki, İslam fəthlərinin əsas məqsədi insanların zülm-sitəmdən xilas edilməsi və ilahi nizam altında yaşaması olmalı idi. İslam qanunlarına əsasən hər hansı bir məntəqəyə qədəm qoymuş İslam qoşunu əvvəlcə xalqı İslama də'vət etməli, onların doğru yola gəlməsinə çalışmalıdırlar. İslamda cihadın xüsusi şəraiti vardır. Təəssüf ki, .haqqında danışdığımız dövrdə fəthlərdə uyğun məqsədlərdən əsər-əlamət görünmür

İbn Əsir deyir: «Abbas ibn Fəcr ibn Yə'qub hicri ۲۳۷-ci ildə İbn-Sur qalasına hücum etdi, oradakı əhalini əsir götürərək, var-dövlətini qarət etdi. Xeyli insan qılıncdan keçirildikdən sonra Abbas Qəsryannə şəhərinə üz tutdu, bu şəhəri də qarət edib .yandırdı

O hicri ۲۳۷-ci ildə Qəsryannəni növbəti dəfə qarət etdikdən sonra Qətaniyyə, Sərqusə, Növtəs, Rəxus şəhərlərinə qoşun çəkdi. Xeyli qənimət ələ keçirdikdən sonra şəhərləri yandırdı. Bu şəxs hicri ۲۴۳-cü ildə yenidən Qəsryannə şəhərinə hücum etdi. Özünü müdafiə etmək istəyən xalq qılıncdan keçirildi və Abbas növbəti dəfə Sərqusə

şəhərinə üz tutdu. Bu şəhərdə də eyni cür rəftar etdikdən sonra Qəsrul-Hədid məntəqəsinə hücum edildi. Həmin qəsrdə yaşayan rumlular ona on beş min dinar verib sülh bağlamaq istəsələr də, Abbas onların təklifi ilə razılaşmayıb onları təslim olmağa vadar etdi. O şəhər əhlindən yalnız iki yüz nəfərini azad edib, qalanlarını əsir götürdü və qəsri viran qoydu».

Gördüyümüz kimi, uyğun dövrdə xəlifələr və onların nümayəndələri tərəfindən həyata keçirilmiş fəthlərdə İslam prinsipləri köklü şəkildə pozulmuşdur. Nə döyüşdən əvvəl, nə də döyüşdən sonra hücuma mə’ruz qalmış xalqlar İslama də’vət olunmamış, İslam .qanunlarının ziddinə olaraq, əsirlər qılıncdan keçirilmiş, şəhərlər yandırılmışdır

İbn-Əsir digər bir yazısında qeyd edir ki, abbasi xəlifəsi Müntəsir hicri ۲۴۸-ci ildə türk Vəsifi rumlularla döyüşə göndərdi. Belə bir məsləhəti ona vəziri Əhməd ibn Xəsib verdi. Vəsifin bu döyüşə göndərilməsinin səbəbi vəzir ilə onun arasındakı ixtilaf idi. Xəlifə öz vəzirinin tə’kidi ilə Vəsifi on iki min döyüşçü ilə dörd il müddətinə sərhəd keşiyinə və .rumlularla döyüşə göndərdi

Deyilənlərdən belə görünür ki, İslam fəthi adı altında şəxsi məqsədlər güdülürdü, .hakimiyyətin başında duranlar öz çirkin niyyətlərini həyata keçirdilər

## İCTİMAİ VƏZİYYƏT

İctimai vəziyyət deyəndə cəmiyyəti təşkil edən ayrı-ayrı təbəqələrin müxtəlif baxımlardan mövqeləri nəzərdə tutulur. Cəmiyyətdə mövcud olan adət-ənənələr, .bayramlar, ev və geyim formaları, yemək çeşidləri cəmiyyətin simasını əks etdirir

Biz yuxarıda sadalanan bütün səciyyələri araşdırmaq fikrində deyilik. Həmin dövrün ictimai vəziyyəti ilə tanış olmaq üçün yalnız təbəqələrin vəziyyətini nəzərdən keçirəcəyik. Həmin dövrdə xəlifələrin eyş-işrətə aludə olması səbəbindən cəmiyyətdə köklü şəkildə bir-birindən fərqlənən iki təbəqə yaranmışdı: fəqirlər və varlılar. Cəmiyyətin əksəriyyətini məhrum təbəqə təşkil edirdi. Xəlifə və onun ətrafında .olanlarla adi xalq kütlələri arasında böyük uçurum yaranmışdı

Söhbətimizin bu hissəsində xəlifələrin eyş-işrətə aludəliyindən, onların saysız-hesabsız əyləncə məclislərindən qısaca danışmaq fikrindəyik. Həmin dövrdə xəlifə və onun ətrafındakıların dünyapərəstliyi, gecələri işrət məclislərində keçirməsi, qadına və azğın həyat tərzinə aludəçiliyi diqqəti cəlb edir. Biz saray adamlarının həyatından .yalnız bə’zi səhnələri təsvir etməklə kifayətlənəcəyik

## ƏYYAŞLIQ

Əyyaşlıq bütün abbasi xəlifələrinin səciyyəvi xüsusiyyəti idi. Qeyd etməliyik ki, həmin dövrdə abbasi xəlifələrinin harınlığı vəsvəgəlməz dərəcədə iyrənc idi. Abbasi xəlifələri öz ömürlərinin böyük bir hissəsini əllərində şərab camı, kənizlərin ağuşunda keçirmişlər. Onlar üçün ən qiymətli şey ağılı başdan çıxaran şərab və ay üzlü kəniz idi. :Bəsrə qazisi abbasi xəlifələrinin halını belə nəzmə çəkmişdir

səh:۳۱

Xalqa hakim olan bu kəslər əslən

.Tar-kaman, rəqqasə quludur bilsən

Bir çox şairlər xəlifələrin, eyş-işrət məclisləri haqqında şe’rlər yazmışlar. Məs’udinin bildirdiyinə görə dünya işrətinə qapılmış Mütəvəkkilin dörd min kənizi vardı. Bu xəlifə o qədər harınlamışdı ki, hətta bir gecə öz eyş-işrət məclisinə imam Hadini (ə) məcburi şəkildə gətirmişdi. O, əlindəki şərab camını imama uzatdıqda imam buyurmuşdu: «Mənim ətim-qanım heç vaxt şərab görməyib . . .» Bu istəyindən əl çəkən Mütəvəkkil imamdan bir şe’r oxumasını istəmişdi. İmam elə bir şe’r oxumuşdu ki, xəlifənin işrət .məclisi əzadarlığa çevrilmişdi

## QƏSRLƏR

Abbasi xəlifələri və onların ətrafındakılar gözəl, əzəmətli qəsrlər tikməyə böyük maraq göstərirdilər. Həmin dövrdə xəlifələrin qəsrləri öz genişliyi ilə bir şəhəri xatırladırdı. Qəsrin ərazisini müxtəlif tikililər, bağlar, arxlar bəzəyirdi. Mütəvəkkil bir qəsri tikib qurtaran kimi o birinin tikintisinə başlayırdı. O iyirmiyə yaxın qəsr tikmişdi. Qəsrlərə «Şah», «Gəlin», «Bürc», «Mütəvəkkiliyyə» kimi adlar verilirdi. Bu qəsrlərin xərci iki yüz yetmiş dörd milyon dirhəmi aşırdı. Mütəvəkkilin ən gözəl qəsri «Bürc» qəsri idi. Bu qəsr qızıl və gümüş təsvirlərlə bəzədilmişdi. Onun xərci bir milyon yeddi yüz min dinarı .aşmışdı

## ŞADLIQLAR

Abbasi xəlifələri ardıcıl şəkildə ağılasığmaz xərclər aparan kef məclisləri və şadlıqlar keçirərdilər. Mehdi Abbasi oğlu Harunu evləndirərkən onun şadlığına əlli milyon dirhəm pul sərf etmişdi. Toy gecəsi onun gəlini Zübeydənin libası tamamilə dürdən idi. Hələ o .vaxtadək belə bir libas görən olmamışdı

Hişam ibn Əbdül Məlikin arvadı özünə başdan ayağa qızıldan olan libas hazırlatmışdı. Bu libasda o qədər cəvahirat vardı ki, xəlifənin arvadı onu geydikdə yeriməyə çətinlik .çəkirdi

Əddiyarat» kitabında nəql olunur ki, Mehdi Abbasi öz qardaşı qızı Ümmi-Cə’fəri öz oğlu»

Rəşidə alarkən misilsiz bir hazırlıq görmüşdü. Ümmü-Cə’fər üçün hazırlanan ləl-cəvahir, zər-ziba taclar, əklillər, qızıl və gümüş qübbələr, ətirlər heç bir toyda görünməmişdi. Onun səh:۳۲

öz arvadı üçün ləl-cəvahirdən hazırlatdırdığı köynək haqqında tarixi mənbələrdə qeyd .olunmuşdur

Mənbələrdə xəlifələrin beytül-malı israf etməsi barədə mə’lumatlar verilir. Qeyd olunur ki, Mehdi Abbasi oğlu Hadi onun əlini öpərkən oğluna üst-üstə dağ tək .qalaqlanmış və başında otuz min dinarlıq qırmızı yaqut olan bir xəzinə bağışladı

Mütəvəkkil oğlu Əbdüllah Müəttəzin sünnət məclisində elə bir xərc çəkmişdi ki, dövrün tarixçiləri bu barədə ətraflı şəkildə yazmışdılar. Uzunluğu yüz, eni əlli addım olan xalça döşənmiş qəsrdə dörd min qonaq qəbul olunmuşdu. Məclisdə qızıl taxtlar düzülmüşdü. Mütəvəkkilin əmri ilə məclisdəkilərin başına iyirmi milyon dirhəm səpilmiş, üzərində sünnət mərasimi qeyd olunmuş bir milyon dirhəm bər-bərlərin, sünnət edənin, qulamların və xidmətçilərin başına səpilmişdi. Müəttəzi sünnət edən şəxsdən həmin gün nə qədər qazandığı barədə soruşulduqda o demişdir: «Səksən neçə min dinar, qızıl üzük və cəvahir». Beləcə bu sünnət mərasiminin xərci səksən altı milyon dirhəmi aşmışdır. Doktor Şövqi bu əhvalatı danışdıqdan sonra deyir: «Bu qayda ilə hesabsız halda milyonlarla dinar və dirhəm xərclənirdi. Məclisdəkilər özlərini min bir gecə əfsanələrində hiss edirdilər. Xalqın yolunda sərf olunası xəzinəni bu sayaq axmaqcasına israf edirdilər. Hansı ki, xalq olduqca kasıb yaşayır, qan-tər içində üzülürdü. Xalqın qan-təri sayəsində toplanmış xəzinə xəlifənin haram məqsədləri yolunda havaya sovrulurdu. Xəlifə sarayı şərab badələrinin dövrə vurduğu .meyxanaya döndərmişdi

Məs’udi yazır ki, tarixin heç bir dövründə Mütəvəkkilin xilafəti dövründəki kimi .bədxərclik olmamışdı

Bir gün Mütəvəkkil öz saraylarından birində eyş-işrət məclisi qurmuşdu. Öz xidmətçilərindən farsların keçirdiyi «Şad kolah» məclisləri haqqında soruşur. Ona deyirlər ki, bu məclislərin gül-çiçəksiz keçirilməsi mümkün deyil. Həmin vaxt gül-çiçək fəsli olmadığından Mütəvəkkil vəziri Übeydüllah ibn Yəhyanı çağırıb deyir: «Göstəriş ver ki, mənim üçün iki buğda dənəsi ağırlığında dirhəmlər hazırlansın». Übeydüllah soruşur: «Ya əmirəl-mö’minin, nə qədər dirhəm istəyirsiniz?» Mütəvəkkil deyir: «Əlli milyon dirhəm». Übeydüllahın göstərişi ilə həmin dirhəmlər hazırlanır. Mütəvəkkil göstəriş

verir ki, bu dirhəmlərin bir hissəsini qırmızı, bir hissəsini sarı, bir hissəsini isə qara rəngə boyasınlar. Sikkələrin bir hissəsi isə öz rəngində saxlanılır. Mütəvəkkil yeddi yüz xidmətçini yanına çağıraraq onlara göstəriş verir ki, rəngarəng geyinsinlər. Küləkli bir gündə qırx qapısı olan xeymələr qurulur. Mütəvəkkil gündə bir yerdə süfrə açdırıb əlvan libaslı xidmətçilərin arasında kefə məşğul olur və göstəriş verir ki, hazırlanmış dirhəmləri ətrafdakıların başına səpsinlər. Külək

əsdikcə yüngül dirhəmlər havada gül ləçəkləri kimi fəzaya qalxır. Doktor Şövqi bildirir ki, bütün bu əhvalatlar xəlifələrin dəlilik həddinə çatmış rahatlığından doğurdu. Amma .xalq xəlifənin gözü qarşısında yoxsulluğun son həddində yaşayırdı

## KEF MƏCLİSLƏRİ

Abbasilərin gündəlik kef məclisləri, rəqqasələrə ağılagəlməz hədiyyələri, mütrüb musiqilər və harın şadlıqlar min bir gecə nağıllarını xatırladırdı. Bir sözlə, xəlifələrin qəsrləri eyş-işrət yuvasına çevrilmişdi. Onlar günün böyük hissəsini sərxoş olardılar. Təkcə xəlifələrin yox, eləcə də vəzirlərin, əmirlərin qəsrləri şeytənət yuvasına .çevrilmişdi

Hadi Abbasi İbrahim Mosulini öz sarayına də'vət edib saatlarla onun nəğmələrini .dinləyər və böyük hədiyyələr verərdi. Bir dəfə xəlifə ona yüz əlli min dinar bağışlamışdı

İbrahimin səsindən vəcdə gələn xəlifə məclisin sonunda İbrahimi xidmətçiyə qoşub xəzinəyə göndərmiş və istədiyi şeyi götürməyə icazə vermişdi. İbrahimin öz sözünə görə, o beytülmal xəzinəsinə daxil olub, cəmi əlli min dinar götürmüşdü. İbrahim deyir .ki, əgər Hadi uzun ömür sürsəydi evimizin divarları da qızıl və gümüşdən olardı

Mütəvəkkil də əvvəlki xəlifələrdən geri qalmırdı. Təbəri nəql edir ki, Mütəvəkkil «Cə'fəri» adlı qəsrini tikib qurtardıqdan sonra xanəndələri və rəqqasları oraya toplayıb .kef məclisi keçirdi və məclisin sonunda onlara iki milyon dirhəm bağışladı

## HƏDİYYƏLƏR

Xəlifələr müsəlmanların büdcəsindən, beytül-maldan təkcə xanəndə və rəqqasələrə yox, eləcə də bütün qohum-əqrəbalarına paylayırdılar. Mütəvəkkil anası Şücayə ildə altı yüz min dinar hədiyyə verirdi. Bu qadın dünyasını dəyişdikdən sonra ondan beş milyon dinar pul, bir milyon dinar dəyərində cəvahirat, ildə dörd yüz min dinarlıq məhsul verən əkin sahəsi qalmışdı. Mütəvəkkilin arvadı, Müəttəzin anası Ümmü-Qəbihə əri və oğlu tərəfindən ağlagəlməz dəyərə malik hədiyyələr alırdı. Qoşunun əlli min dinarlıq ehtiyacını tə'min etməkdə aciz olan Müəttəz öldükdən sonra anasının evindən bir milyon səkkiz yüz min dinar nağd pul, üç kisə cəvahirat tapıldı. Bütün .bunların dəyəri iki milyon dinara çatırdı

Xəlifələr onların və onların hakimiyyətlərinin haqq olduğunu, xəlifələrin peyğəmbərlərə imamlardan da yaxın olduğunu nəzmə çəkən, öz şe’rlərində ələvilərə qarşı nifrət oyadan şairlərə də böyük mükafat verirdilər. Mütəvəkkil onun xəstəlikdən şəfa tapması haqqında qəsidə yazmış İbrahim ibn Müdəbbirə əlli min dirhəm hədiyyə verdi. Bundan əlavə vəzirə göstəriş verildi ki, İbrahim qazanclı bir işə

tə’yin olunsun. Əbül-Şəbəl Əlbürcəmi xəlifəni mədh edən şe’rinə görə otuz min dirhəm pay aldı. Xəlifəyə şərab badəsi verən qulu mədh etmiş şe’rinə görə Hüseyn ibn Zəhhak Xəli öz şe’rinin hər beytinə görə min dinar hədiyyə aldı. Əbül-Şəmt öz qəsidəsinə görə iki yüz min dinar mükafat əldə etdi. O, Mütəvəkkildən dəfələrlə belə mükafatlar .almışdı

İbn-Əsir Əbül Şəmtin dilindən belə nəql edir: «Mən Mütəvəkkilə rafiziləri (ələviləri) təhqir edən şe’rlər oxudum. O məni Bəhreyn və Yəmamə əmiri tə’yin etdi və başqa dörd xələt verdi. Müntəsirdən də xələt aldım. Sonra Mütəvəkkil məni üç min dinarla mükafatlandırdı. Daha sonra əvvəlki şe’rimə oxşar bir şe’rimə görə Mütəvəkkildən on .«min dirhəm hədiyyə aldım

.Mütəvəkkil onun işrət məclislərini qızışdıran təlxəkləri də səxavətlə mükafatlandırardı

Bir gün Mütəvəkkil soyuq bir qış günü göstəriş verdi ki, saray xonsası(١) İbadəni suya atsınlar. İbadə ölümlə çarpışdığı vaxt xəlifə onu sudan çıxartmağı əmr etdi. Sonra ondan soruşdu: «Halın necədir?» İbadə dedi: «O dünyanı görüb gəldim». Mütəvəkkil güldü və dedi: «Qardaşım Vasiqin halı necə idi?» İbadə dedi: «Yolum cəhənnəmdən .düşmədi». Mütəvəkkil güldü və İbadəyə xələt verdi

Mütəvəkkilin digər əyləncələrindən biri bu idi ki, çirkin və cahil bir şəxs olan şair Əbül-Übəri mancanağa qoyub göyə atsın. Şair havaya qalxanda xəlifə deyərdi: «Yolu açın, yolu açın!» Şair havada uçub suya düşərdi, sonra onu balıq kimi torla tutardılar. Bu əyləncənin müqabilində Mütəvəkkil ona hədiyyə verərdi. Məs’udi yazır: «İstənilən bir .«sahədə ixtirası, baməzəliyi olan adam Mütəvəkkildən hədiyyə alırdı

## SÜFRƏLƏR

Abbasi xəlifələrinin, onların vəzirlərinin və əmirlərinin xüsusiyyətlərindən biri də yemək-içməkdə israfa yol vermələri idi. Onlar əlvan süfrələr açar, bu süfrələri qızıl-.gümüş qablarla bəzəyərdilər

Xəlifə Mə’munun gündəlik xərci altı min dinar idi. Bu məbləğin böyük hissəsi xörəklərin hazırlanmasına sərf edilirdi. Xəlifə Harun Ərrəşid hər gün otuz növ xörək bişirtdirərdi. Onun süfrəsi on min dirhəmə başa gələrdi. Onlar bu süfrələr haqqında şe’rlər

.yazdırardılar

səh:۳۵

---

Xonsa: Həm qadın və həm də kişi cinsiyyət üzvünə malik olan anormal şəxs (qız- [۴] -۱
.(oğlan

Doktor İbrahim Həsən «Tarixul-İslam» kitabında və Doktor Şövqi «Əl əsrul-əbbasiyyune-sani» kitabında xəlifələrin qarınqululuğu haqqında ətraflı mə'lumat vermişlər. Abbasilərin aşpazxana israfçılığı haqqında Doktor Zəhravi də öz kitabında .ətraflı şəkildə bəhs etmişdir

Abbasi xəlifələri çeşidli təamlara ağılasığmaz məbləğlər xərcləməkdən əlavə, öz arvadlarına, övladlarına, kənizlərinə böyük məbləğdə pullar xərcləyərdilər. Onlar xilafətə çatmaq üçün bey'ət almaq məqsədi ilə xeyli rüşvət paylayardılar. Əlbəttə ki, bütün bu xərclər məşəqqətlər içində üzülən xalqın üzərinə düşürdü. Sadə bir ailənin ailə xərci iyirmi beş dirhəmdən çox olmurdu. Amma xəlifələrin, məsələn, Mütəvəkkilin .illik şəxsi xərci yetmiş altı milyon beş yüz iki min dirhəmi aşırdı

Haqqında danışılan fəsad və israfçılıqlar əksər dövlət mə'murlarına xas bir xüsusiyyət idi. Xəlifə Vasiq hicri ٢٢٩-cu ildə öz dövlət katiblərindən bir çoxunu zindana saldı. Əhmədi ibn İsraildən səksən min dinar, Süleyman ibn Vəhəbdən dörd yüz min dinar, Həsən ibn Vəhəbdən on dörd min dinar, İbrahim ibn Reyhandan yüz min dinar, Əhməd .ibn Xəsibdən bir milyon dinar, Əbül-Vəzirdən yüz qırx min dinar müsadirə olundu

Mütəvəkkil öz xəlifəliyinin qırxıncı günü vəziri Əbul-Zəyata qəzəblənərək onun bütün var-yoxunu müsadirə etdi. Yeni tə'yin olunmuş vəzir Əbul-Vəzirin də saray ömrü çox çəkmədi. Hicri ikiyüz otuz üçüncü ildə xəlifə onu da işdən kənarlaşdıraraq, var-yoxunu müsadirə etdi. Təbərinin nəql etdiyinə görə Mütəvəkkil böyük dövlət katiblərindən olan Ömər ibn Fərəc Zuxxəciyə qəzəbləndiyi vaxt onun mülkünü müsadirə etdi, evindən əlli dəvə yükü qiymətli xalçalar və başqa əşyalar çıxarıldı. Müsadirə olunmuş malın qiyməti yüz iyirmi min dinar həddində göstərilir. Vəzirin qardaşının da yüz əlli min dinarlıq mülkü müsadirə edildi. Adi bir katibin mülkü belə bir həddə çatdıqda, .vəzirlərin-əmirlərin var-dövləti haqqında danışmağa dəyməz

Mütəvəkkil hicri iki yüz otuz yeddinci ildə öz qazisi Əhmədə qəzəblənərək onun bütün mülkünü müsadirə etdi və övladlarını zindana saldı. Qazinin oğlu Əbul-Vəlid yüz iyirmi min dinar nağd və iyirmi min dinar dəyərində cəvahir verib öhdəsinə götürdü ki, mülkünü satmaqla on altı milyon dirhəm xəzinəyə ödəyəcəkdir. Yalnız bundan sonra xəlifə onu azad etdi. Xəlifə cəzalandırdığı qazinin yerinə Yəhya ibn Əksəmi tə'yin etdi.

Üç il sonra Yəhya da əvvəlki qazinin aqibəti ilə rastlaşdı. Hicri iki yüz altımışıncı ildə o işdən kənarlaşdırıldı, yetmiş beş min dinar pul və Bəsrədə böyük torpaq sahəsi .müsadirə edildi

Maraqlıdır ki, o bu sərvəti üç il ərzində necə toplaya bilmişdi? Şair bu barədə gözəl :demişdir

,Şah xalqın bağından alma dərərkən

.Qullar ağacını çıxarar kökdən

Doktor Şövqi öz kitabında bə’zi vəzir və əmirlərin, eləcə də katiblərin qazancları, torpaq sahələri, oğurluğu, rüşvətxorluğu, bağları, mənzilləri, kənizləri, xidmətçiləri, .mühafizləri, süfrələri, geyimləri haqqında mə’lumat vermişdir

O, öz kitabının sonunda bildirir: «Bəli, dövlətin malı bu sayaq talan edilir. Oğrular isə yalnız vəzirlər, əmirlər və katiblərdir. Xalqın yoxsulluqdan əzab çəkdiyi bir vaxtda bu .insanlar rifah içində yaşayırlar. Ölkədəki fəsad mərkəzi elə saraydır

Belə görünür ki, həmin dövrdə əksər dövlət işçiləri oğurluq və rüşvətxorluqla məşğul imişlər. Hər bir dövlət mə’muru vəzifə əldə etmək üçün xeyli rüşvət verir və sonradan verdiyi məbləği qazanmağa çalışırdı. Bə’ziləri vəzirlik məqamına görə beş yüz min dinar verirdi. Onlar yaxşı bilirdilər ki, qısa bir zamanda verdikləri məbləği çıxaracaqlar. Bu hissənin sonunda yoxsul təbəqənin halını nəzərdən keçirmək yaxşı olardı. Bu zümrəni əkinçilər, fəhlələr, qulluqçular, sənətkarlar təşkil edirdi. Bu təbəqənin min bir əzabla əldə etdiyi qazancın böyük bir hissəsi dövlətin harın hakimlərinin əlinə keçirdi. Söhbətimizin əvvəlində yada saldığımız qiyamların da əsas bir hissəsini həmin bu .məzlum təbəqənin yaşamaq arzusu alovlandırırdı

:Həmin dövrün məşhur şairlərindən olan Cahiz öz yoxsulluğunu belə bəyan edir

Alim daxmasında şükür qılırkən

.Varlı qan ağlayır tamah qəmindən

,Aqil bir tikəyə qane olası

.Nadan yağ içində haray salası

,Zəmanə insanı alçatmış necə

.Ucalmazdım Allah istəməyincə

Ölümü yatmaqdan üstün tutan mən

.Arabir aldanıb umdum da yerdən

Təbəssümlə varın qoruyan kəsə

.Baxıb yenə döndüm ilkin həvəsə

Öz dövrünün böyük ədiblərindən olan Cahiz ağır yoxsulluq içində yaşayırdı. Hansı ki, düşüncəsiz və nadan insanlar dövlət qurumunda yer tutaraq, rifah içində ömür sürürdülər. Cahiz əvvəlcə bir miqdar ruzi xatirinə onlara üz tutmaq istəyir. Amma bir qədər sonra anlayır ki, bu iş

onun insanlıq şərafətinə sığmır. Əgər uyğun dövrdə məşhur bir şair belə bir fəqirlikdə yaşayırsa, adi tələbələrin, təhsil ardınca gedənlərin haqqında danışmağa dəyməz. Həmin dövrün üzücü fəqirliyini təsvir edən, öz yoxsulluğundan danışan digər bir şair :Əbul-Ə’yandır. O deyir

,Şükr olsun, nə atım, nə qulamım var

.Qulamım övladdır, kənizim arvad

,Qaşqabaqlı üzə ehtiyacım yox

.Əyilməkdən xoşdur kasıb bir həyat

:Başqa bir şe’rdə isə belə oxuyuruq

,Böyüklər at üstə, mən ayaqyalın

.Süvarilər baxır üstdən aşağı

,Ya Rəbb, ya mənə də minik əta et

.Ya alçaqları et mənim sayağı

Həmin dövrün digər tanınmış bir şairi Səid ibn Vəhəb fəqirlikdən fəryad edərək belə :deyir

,Kimi bu dünyadan alır kamını

.Kimi də oturub seyrinə ancaq

,Alçaqlar yuxarı ucalır hər an

.Ucalar nədənsə sayılır alçaq

Uyğun dövrün ədibləri elə bir sarsıntıya düçar olmuşdular ki, hətta elmin yalnız :fəqirliklə nəticələnməsi qənaətinə gəlmişdilər. Bu qeydlərdən birində deyilir

,Ey elmin təkinə baş vuran insan

.Bir sənət ardınca tələs durmadan

,And olsun insana ruzi bölənə

.Düşmən olasıdır biliyin sənə

:Növbəti bir şe’rdə deyilir

,Soyuq külək dolur iliklərimə

səh:۳۸

.Bir şey də tapmıram bürüyəm tənə

,Çöhrəmi qaraltmış qışın sazağı

.Hansı dərddən qorxdum durdu ayağı

:Başqa bir şe’rdə fəqirlik belə təsvir olunur

Susuz səhralarda sığınacaqsız

.Qəmli bir yolçuyam odsuz-ocaqsız

.Aman, bu yerlərə kimsə tutmaz üz

.İsti külək əsər gecə və gündüz

Həmin dövrün ədiblərindən biri də Yə’qub ibn Yəzid Təmmar olmuşdur. O, hökumətin mülkü olan bir evdə yaşayır və iki ayda yetmiş dirhəm icarə ödəyərmiş. Kasıblıq :səbəbindən bu icarəni ödəyə bilməyən şair belə gileylənir

Ya Rəbb, məni üzən bu fəqirliyin

.Dünyada çarəsi tapıla çətin

,Bu zəhərli borcdan haraya qaçım

.Qüssədən, kədərdən ağardı saçım

Şair öz dözülməz yoxsulluğunu yuxarıdakı misralarla təsvir edir. Bir cəmiyyətdə ki, düşüncə sahibləri fəqirlik girdabında çabalayır, həmin cəmiyyətin sadə adamlarının həyatı haqqında danışmağa ehtiyac qalmır. İslam dünyasının sərvətləri saraylarda xanəndələrə, rəqqasələrə xərclənirdi. Abbasilər öz işrət məclislərinə xalqın alın təri ilə .rövnəq verirdilər

## İDEOLOJİ VƏZİYYƏT

İdeoloji durum baxımından həmin dövrdə diqqəti cəlb edən odur ki, Mütəvəkkil dövlətin rəsmi məzhəbi sayılan e’tizal əqidəsindən əhli-hədis əqidəsinə keçdi. O

aşkarcasına Mö’təzilə və şiələri əzmək və əksəriyyəti sünnə əhli olan əhli-hədisə yol .açmaq siyasəti yeridirdi

E’tizal əqidəsinin yaranışı haqqında müxtəlif fikirlər var. Bə’zilərinin nəzərincə, bu əqidə hicrətin ilk əsrində, əməvilər dövründə Vasil ibn Ətanın öz ustadı Həsən Bəsridən ayrılması nəticəsində yaranmışdır. Deyilənlərə görə, bu əqidə İraqda formalaşmış və .beş əsasa malik olmuşdur

E’tizal məktəbində ağıla ifrat şəkildə istinad edilir. Onlar bu xüsusiyyətlərinə görə hətta avropada intibah dövründə formalaşmış ağılı əsas götürən bə’zi cərəyanlara oxşadılırlar. Xəlifə Mə’munun dövrünədək e’tizal məzhəbi ölkənin siyasi həyatında heç bir rol oynamırdı. Amma Mə’mun bu əqidəni dövlətin rəsmi məzhəbi seçdi və onun himayəsi ilə e’tizal məktəbi çiçəkləndi. Bə’zi tədqiqatçılar tarixi dəlillər göstərərək bildirirlər ki, Mə’munun əsil məqsədi şiə imamlarını, əsasən də, imam Rizanı (ə) siyasi səhnədən götürmək idi. Mə’mun məcburi şəkildə imam Rizanı (ə) özünə vəliəhd tə’yin etdi. Digər bir tərəfdən yunanların fəlsəfə və məntiq kitablarını tərcümə etdirməklə müəyyən məqsədlər güdürdü. İmamın vəliəhdliyə tə’yin olunmasında məqsəd xalqın imama münasibətini dəyişmək idi. Mə’mun çalışırdı ki, imam Rizanı (ə) vəliəhd tə’yin etməklə onu dünyapərəst bir insan kimi tanıtdırsın. O, yunan mətnlərini tərcümə etdirməklə əhli-beyt maarifini ikinci plana keçirməyə çalışırdı. Amma ilahi elmdən bəhrələnən imam onun bütün istəklərini puça çıxarırdı. Buna görə də Mə’mun imamı .öldürməkdən başqa çarə görmürdü

Əba-Silət deyir: «Mə’mun müxtəlif şəhərlərdən mütəkəllimləri (filosofları) ətrafına yığırdı ki, imamla mübahisədə onu məğlub edə bilsin. Amma yəhudilərdən, məsihilərdən, məcusilərdən və digər əqidə nümayəndələrindən kim imamla mübahisəyə girirdisə, məğlub olurdu. Mə’mun bu yolla öz məqsədinə çata .«bilmədiyindən imama zəhər içirməklə onu qətlə yetirdi

Mə’mun özü e’tizal məzhəbini qəbul etdikdən sonra xalqı da bu yola sürükləməyə çalışdı. O xalqa qəbul etdirmək istəyirdi ki, Qur’an yaradılmış bir şeydir. Bu isə mö’təzilə məktəbinin nəzəriyyələrindən biri idi. Mə’mun hicri iki yüz on səkkizinci ildə Bağdad hakiminə məktub yazıb Qur’anın yaranmış olması məsələsinin təsdiqi üçün alimlər arasında mübahisələr təşkil etməsini istədi. Bağdad hakiminə tapşırdı ki, bu əqidəyə qarşı çıxanları sıxıntıya salın. Mə’munun nəzərdə tutduğu əqidədə olmayanların, şəhadətlərinin qəbul edilməməsi tapşırılırdı. Mə’munun əslində əqidə təftişinin bir növü olan bu hərəkəti tarixdə «Mihnətul-Qur’an» adı ilə məşhurdur. Mə’mun öz vəliəhdi Mö’təsimə də vəsiyyət etmişdi ki, xalqa bu əqidəni qəbul etdirsin. Elm və bilikdən xəbərsiz olan Mö’təsim də öz növbəsində uyğun əqidəyə qarşı çıxanları .cəzalandırırdı. Hətta bə’zi alimlərə şallaq da vurulurdu

Mö’təsimdən sonra eyni yolu Vasiq davam etdirdi. Onun təzyiqləri Bağdad xalqında ciddi narazılıq yaratmışdı. Vasiq müsəlman əsirlərlə Rum əsirləri dəyişilərkən müsəlmanlıq ölçüsü kimi Qur’anın məxluq olması inancını əsas götürürdü. Əsirlərdən .hər hansı biri bu əqidəyə qarşı çıxdıqda müsəlman sayılmır və dəyişdirilmirdi

Hər halda abbasi xəlifələrinin zülmü bir həddə çatmışdı ki, müxaliflərə olmazın işgəncələri verilir və zindanlar ağzınadək doldurulurdu. Əhməd ibn Hənbəl uyğun nəzəriyyəyə müxalif olduğu üçün şallaqlandı və bir müddət həbs edildi. Vasiqin hakimiyyəti dövründə Bağdad əhli Əhməd ibn Nəsr Xüzainin başçılığı altında qiyam qaldırdı. Vasiq qiyamı yatırdı və qiyamın rəhbərini qətlə yetirdi. Şafeinin şagirdlərindən olan Yusif ibn Yəhya Buvəyti işgəncələrə mə'ruz qalaraq dünyasını dəyişdi. Xəlifələrin .bu sayaq tədbirləri xalqda e'tizal əqidəsinə nifrəti artırırdı

Nəhayət, Vasiq dünyasını dəyişdi, hakimiyyətə Mütəvəkkil gəldi. Mütəvəkkil mö'təzilə və şiə əqidəsinə qarşı çıxaraq əhle-hədis üsulunu himayə etməyə başladı. O, bu yolla xalqın rəğbətini qazana bildi. Uzun illər xəlifələrin mö'təzilə əqidəsini müdafiə etməsindən cana yığılmış xalq Mütəvəkkilin tədbirini razılıqla qarşıladı. Xalq Mütəvəkkilə münasibətdə ifrata vararaq, ona bid'əti aradan qaldırmış, ilahi sünnəni .bərpa etmiş bir şəxs kimi sitayiş edirdi

Mütəvəkkil bu yolla onun üçün daha böyük təhlükə yaradan ələvilərin qarşısını aldı. O, mö'təzilə və şiə əqidəsini aradan qaldırmaq üçün xüsusi tədbirlər planı hazırlayırdı. O, əvvəlcə Mə'munun əqidə təftişini aradan qaldıraraq, şiələrə zidd şüarlar verməyə başladı. Sonra Vəzir ibn Zəyatı işdən uzaqlaşdırıb, onun yerinə şiə əqidəsinə qarşı .barışmaz mövqedə olan Cürcərayi və İbn-Xaqanı tə'yin etdi

Mütəvəkkilin üçüncü işi yeni ordunun yaradılması oldu. Orduya ələviyə müxalif mövqedə dayanan Suriya, Əlcəzair, Cəbəl, Hicaz, hətta Əbna əhli cəlb edildi. O öz şiə müxaliflərinə qarşı sərt tədbirlər görərək, hətta imam Hüseynin (ə) qəbrini xaraba .qoymağa cür'ət etdi

Onun başqa bir tədbiri sünni əqidəsinə əsaslanaraq rəvayət mənbələrinin tərtibi oldu. .İbn Əbu-Şeybənin «müsənnəfi», Buxarinin «Səhihi», Müslümün «Səhihi» bu qəbildəndir

## XÜLASƏ

Kitabın bu fəslində qeyb dövrünün bə'zi səbəblərinin anlaşılması, ikinci Abbasilər dövründə ictimai-siyasi vəziyyət və ideoloji baxışların nəzərdən keçirilməsi üçün, eləcə də, imamın qeybi ərəfəsində Samirradakı vəziyyətlə tanış olmaq üçün zəruri

:məsələləri sadaladıq

;Xilafət mərkəzinin Bağdaddan Samirraya köçürülməsi.۱

;Türklərin nüfuz və hakimliyi.۲

;Davamlı vəzifə dəyişiklikləri.۳

;Qadınların xilafət hakimiyyətində nüfuzu.۴

;Vəzirlərin və əmirlərin zülmü.۵

;Daxili çaxnaşmalar.۶

;Nüfuz altında olan məntəqələrin muxtariyyatı.۷

.İslam fəthlərinin mahiyyət və hədəflərinin dəyişdirilməsi.۸

İctimai vəziyyəti araşdırarkən qeyd etdik ki, cəmiyyət imkanlılardan və məhrumlardan ibarət olmaqla iki qütbə bölünmüşdür. Xəlifələrin, vəzirlərin, əmirlərin harın həyat tərzi .ilə fəqirlərin həyat tərzi müqayisə edildi

İdeoloji vəziyyəti nəzərdən keçirərkən Mütəvəkkilin e'tizal əqidəsindən əhli-hədis əqidəsinə üz tutması haqqında danışdıq, mö'təzilə əqidəsinin siyasi səhnədən çıxarılmasının və əhli-sünnə əqidəsinin dövlətin siyasi üsulu seçilməsi proseslərini .nəzərdən keçirdik. Uyğun gedişlərin səbəbləri də müəyyən həddə aydınlaşdırıldı

## DÖRDÜNCÜ FƏSİL

## KİÇİK QEYB DÖVRÜ ASTANASINDA ŞİƏLƏRİN İCTİMAİ–SİYASİ VƏ DÜŞÜNCƏ DURUMU

Kitabın bu fəslində qeyb dövrü astanasında şiəliyin ictimai-siyasi vəziyyəti və ideoloji durumunu nəzərdən keçirəcəyik. İslamın mühüm və əsil bir qrupu olan şiəlik zalım .xəlifələr və onların hakimiyyəti ilə ən barışmaz müxaliflərdən idilər

Bu dövrdə düşüncə baxımından mə'sum imamların tərbiyəsi altında formalaşmış mübariz şagirdlər çox olmuşdur. Mə'sum imamların bu şagirdlərə tə'lim olunmuş üsulu «dörd yüzlük» kitablarda öz əksini tapmışdır. Şiəliyin e'tiqadi və fiqhi əsasları məhz bu .kitablarda toplanmışdır

Siyasi baxımdan vəziyyət son həddə böhranlı olmuşdur. Şiə imamları mühasirədə saxlanılmış, ciddi təqiyyə etmələrinə baxmayaraq, nəzarət məqsədi ilə Mədinədən Samirraya gətirilmişlər. Şiələr öz imamları ilə çox çətinliklə əlaqə yaradırdılar. Bu mərhələdə mübarizənin çətinliyi səbəbindən şiələrin məxfi vəkalət qurumu formalaşmışdır. Bu qurumun əsasları imam Sadiq (ə) tərəfindən qoyulmuşdur. Qurum imam Həsən Əsgərinin (ə) dövründə ən nüfuzlu dövrünə çatmışdır. Ciddi mütaliə və araşdırmasız məxfi vəkalət qurumunun bu dövrdəki rolunu anlamaq çətindir. İmam (ə) bu mərhələdə dəqiq və gizli təmaslarla uyğun qurumu genişləndirə bilmiş və nəticədə .şiəliyin yayılmasına müvəffəq olmuşdur

Abbasilərin hakimiyyətini sarsıtmaq məqsədi güdən bə'zi ələvi qiyamlarının imamları tərəfindən himayə olunması onların bu mərhələdə tarixi əhəmiyyətli .mübarizələrindəndir

İctimai baxımdan şiələr xəlifələrin ciddi təzyiqi altında olmuşlar. Onların var-dövlətləri müsadirə, canları ölüm təhlükəsi altında olmuşdur. Şiələr mühüm vəzifələrdən uzaqlaşdırılmış və dözülməz həddə sıxıntıya salınmışlar. Bə'zi şiələr təqiyyə (əqidəni gizləmək) yolu ilə sarayda vəzifə tuta bilmiş və bu vəzifədən məqamında istifadə .etmişdir

Bu dövrdə azad fəaliyyət göstərə bilməsə də, digər imamlar kimi xalq arasında böyük .nüfuza malik olmuşlar

Kuleyni Bust və Sistan əhalisindən olan bəni-hənifəli bir şəxsin adından belə nəql edir: «Mö’təsimin xilafətinin əvvəllərində imam Cavad (ə) həccə gedərkən mən də onunla idim. Bir gün süfrə başında əyləşdiyimiz vaxt saray adamlarından da orada vardı. Mən imama dedim: «Sənə fəda olum, bizim hakimimiz əhli-beyti sevən bir insandır. Onun divanında mənim

üçün vergi tə’yin olunmuşdur. Əgər məsləhət bilsəniz, ona bir namə yazar və tapşırarsız ki, mənə yaxşılıq etsin». Əbu-Cə’fər (imam Cavad) buyurdu: «Mən onu tanımıram». Mən ərz etdim: «Sənə fəda olum, sizə dediyim kimi, o, siz əhli-beyti sevənlərdəndir. Əgər ona məktub yazsanız mənim üçün faydalı olar». İmam kağız götürüb yazdı: «Bismillahir-Rəhmanir-Rəhim. Bu naməni gətirən şəxs sənin gözəl məzhəb və məramın haqqında danışdı. Həqiqətən, yalnız xeyirli olası bir əməl sənin üçün faydalıdır. Qardaşlarına yaxşılıq et və bil ki, Allah-təala səndən bir buğda və xardal dənəsinin ağırlığında da sorğu edəsidir». Həmin şəxs sözünə belə davam edir: «Sistana varid oldum. İmamın məktub məsələsi şəhər hakimi Hüseyn ibn Əbdüllah Nişaburiyə çatdığından hələ şəhərə iki fərsəx qalmış özü məni qarşıladı. Məktubu ona verdim. Məktubu öpüb gözlərinin üstünə qoydu və mənə dedi: «İstəyin nədir?» Dedim: «Sənin divanında mənim üçün vergi nəzərdə tutulmuşdur». Göstəriş verdi ki, məni həmin vergidən azad etsinlər və dedi: «Nə qədər ki, mən hakiməm, vergi ödəməyəcəksən». Sonra ailə üzvlərimin sayı haqqında soruşdu. Mən onun sualına cavab verdim. Göstəriş verdi ki, ailə ehtiyaclarımın tə’mini üçün mənə maaş ayrılsın. .Nə qədər ki, bu hakim sağ idi vergi ödəmədim və tə’yin olunmuş məbləği aldım

## DÜŞÜNCƏ DURUMU

Uyğun dövrdə şiələr əqidə baxımından üstün bir mövqeyə malik idilər. İmam Sadiq (ə) tərəfindən ciddi məzhəb proqramı hazırlanmış, hədislər əsaslı şəkildə toplanmışdı. Hədislərin düzgünlüyü imamlar tərəfindən müəyyənləşdirilirdi. Eləcə də, hədis tanıyan və şiə e’tiqadını, fiqhini başqa firqələrin qarşısında müdafiə edə bilən şagirdlər, .səhabələr tərbiyə olunmuşdu

İmamların vəzifələrindən biri də İslam və vəhy mədəniyyətinin hifz və dinin uydurma hədislərdən qorunması idi. Uyğun dövrün səciyyəvi xüsusiyyətlərindən biri bu dövrdə imam Həsən Əsgərinin (ə) düşüncələri sufiyyə, vaqifiyyə və sair yanlış baxışlardan qoruması olmuşdur. E’tiqadi və fiqhi sualların imam tərəfindən yetərli şəkildə .cavablandırılması şiələri onları hədələyən büdrəmələrdən qoruyurdu

İmam Hadi (ə) şiələrdən birinin Qur’anın məxluq olması barədə verdiyi suala belə cavab yazmışdı: «Bismillahir-Rəhmanir-Rəhim. Allah bizi və səni bu sayaq fitnələrdən

qorusun. Bu halda böyük bir ne’mətə çatmış olarıq. Əks-təqdirdə fəlakətə və azğınlığa düçar olasıyıq. Bizim nəzərimizcə, Qur’anın məxluq və ya qədim olması barədə mübahisə etmək elə bir bid’ətdir ki, bu bid’ətə sual verən də, onu cavablandıran da şərikdir. Çünki belə bir sual verən ona layiq olmayan bir şeyin axtarışındadır, cavab verən isə gücündə olmayan bir mövzunu

aydınlaşdırmaqdan ötrü zəhmət çəkir. Allahdan başqa xaliq yoxdur. Ondan başqa hər şey məxluqdur. Qur’an da Allahın kəlamıdır. Qur’ana özündən bir ad vermə ki, azğınlardan olarsan. Allah-təala buyurur: «Müttəqilər o kəslərdir ki, batinlərində öz Allahından qorxar və cəza günündən çəkinərlər». Allah bu buyuruğunu bizim halımıza şamil edəydi!»

İmam Həsən Əsgərinin (ə) mühüm işlərindən biri də şiələri qeyb dövrünə hazırlamaq idi. Şiələrin qeyb haqqında rəvayətlərdən bəhrələnməsi, onlara həzrət Höccətin (ə) dünyaya gəlişi barədə müjdə verilməsi, şiələrin vəkillərə müraciət edə bilməsi, bə’zi üsul və fiqh kitablarının təsdiq olunması həmin hazırlığın tərkib hissələrindən idi. Hətta Samirra şəhərində imamlar onlara ünvanlanmış suallara nümayəndələr vasitəsi ilə cavablar verirdilər. Onlar bu yolla öz şiələrini qeyb dövrünə, imamla vasitəli əlaqə saxlamağa hazırlayırdılar. On ikinci imam (ə) kiçik qeyb dövründə məhz bu üsulla fəaliyyət göstərir və öz şiələrini böyük qeyb dövrünə hazırlayırdı.

## SİYASİ VƏZİYYƏT;

SİYASİ VƏZİYYƏT; İMAM HƏSƏN ƏSGƏRİNİN (Ə) MƏDİNƏDƏN SAMİRRAYA KÖÇÜRÜLMƏSİ VƏ CİDDİ NƏZARƏT ALTINA ALINMASI

İmam Həsən Əsgəriyə (ə) qarşı, eynən bir vaxt Mə’munun imam Riza (ə) və imam Cavada (ə) qarşı yürütdüyü siyasətlər izlənilirdi. Mütəvəkkil imam Hadiyə (ə) qarşı hansı tədbirləri görmüşdüsə, imam Həsən Əsgəriyə (ə) qarşı da eyni tədbirlər görülürdü. Onu saraya gətirib, fəaliyyətlərini məhdudlaşdırmaq, onunla şiələr arasında ayrılıq salmaq istəyirdilər. Həzrət öz atası kimi nəzarət altında idi. Həzrət bazar ertəsi və cümə axşamları günləri sarayda xəlifə ilə görüşməli idi.

Hələ bir vaxt imam Hadiyə (ə) qarşı uyğun tədbirlərin görülməsi səbəbi onun Mədinədəki fəaliyyətlərinin Mütəvəkkili narahat etməsi idi. O vaxt imam Hadi (ə) məcburi şəkildə Mədinədən Samirraya gətirildi və ciddi nəzarət altına alındı. Bə’zən silah axtarmaq bəhanəsi ilə imamın otağına soxulub axtarış apardılar.

İmam Hadidən (ə) sonra imam Həsən Əsgəri (ə) iyirmi iki yaşında imamət məs’uliyyətini öhdəsinə götürdü və iyirmi səkkiz yaşından şəhadətinədək Samirrada

.xəlifənin mə’murlarının nəzarəti altında oldu

## İMAM HƏSƏN ƏSGƏRİNİN (Ə) SİYASİ MÜBARİZƏ ÜSULLARI

Ciddi nəzarət altında olan imamın xüsusi mübarizə üsulları vardı. İmam özünü zahirən ,siyasətdən uzaq göstərməklə şiələrin hökumətdə vəzifə tutmasına şərait yaradır

eləcə də, öz ardıcıllarını xəlifənin tə’qiblərindən qoruyurdu. İmamın şiələri arasında məxfi vəkillər qurumunun təşkili xüsusi əhəmiyyət kəsb edirdi. İmam Sadiq (ə) dövründə bünövrəsi qoyulmuş qurum imam Həsən Əsgəri (ə) dövründə xeyli genişlənə bilmişdi. Bu qurumun fəaliyyətləri haqqında növbəti fəsildə daha geniş danışacağıq. İndi isə təqiyyə (əqidəni gizlətmə) siyasəti və onun böyük əhəmiyyətinə .ötəri bir nəzər salacağıq

Təqiyyə haqqında qısa şəkildə bunu demək olar ki, təqiyyə gizli mübarizə yoludur. .Təqiyyə gizlənmək, fəaliyyətsiz oturmaq deyil

Şiə əqidəsi zalım qüvvələrin hakimliyi dövründə məhz təqiyyə vasitəsi ilə yaşamış və həyatını davam etdirmişdir. Şiə tarixində təqiyyənin böyük rolu olmuşdur. Təqiyyə anlamını dərk etmədən şiə imamlarının fəaliyyətlərini təhlil etmək mümkünsüzdür. Bizim təqiyyə haqqındakı mühakimlərimizdə siyasətsizlik, sadəlövhlük, zəiflik, qorxaqlıq, dünyapərəstlik kimi ittihamlar eşidilməkdədir. Gəlin təqiyyə haqqında mə’sum imamların buyuruqlarına nəzər salaq: Uyğun buyuruqlardan təqiyyənin .məfhumu, zəruriliyi, məqsədləri, yönümləri, rolu və nəhayət, təqiyyə fiqhi aydın olur

Həzrət Əli (ə) Şəqşəqiyyə xütbəsində buyurur: «Əbu-Bəkr xilafəti bir köynək kimi geyindi və ondan yapışdı. Amma yaxşı bilirdi ki, dəyirman oxu dəyirmanda necədirsə, mən də xilafətdə eləyəm. Hökumət mənsiz dolanmaz. Çünki elm mənim qəlbimdən .üzü aşağı sellənir. Elm və bilik fəzasında məndən yuxarı pərvaz edə bilən yoxdur

Mən kənara çəkildim və qərara gəldim ki, kəsili əllərlə vuruşam və ya bu kor azğınlığa səbr edəm. Bu azğınlıq böyüyün belini qırır, körpəni qocaldır. Mö’mini əzaba salır ki, .Allahı ilə görüşə çatsın

Səbr etməyin bütün bunlardan daha üstün və daha ağlabatan olduğunu gördüm. Yaşlı göz, qubarlı sinə ilə səbr etdim. Mənə çatacaq mirasın qarət edildiyini görürdüm». Bəli, Əlinin (ə) təqiyyəsi belə idi. Tənhalıq və əlin kəsildiyi bir zamanda səbr etmək, fəaliyyət .üçün şərait hazırlamaq lazım gəlir

İmam Hadi (ə) buyurur: «Əgər desəm ki, təqiyyəyə göz yuman namazı tərk etmiş adam kimidir, doğru demişəm».(١) Rəvayətdən göründüyü kimi təqiyyə namaz qədər

.vacib bir əməldir

İmam Həsən Əsgəri (ə) öz dostunu təqiyyəyə sövq etmiş şiələrdən birinə belə buyurdu: «Sən o insanlardansan ki, Peyğəmbər (s) həmin zümrə haqqında buyurmuşdur: «Hər kəs bir başqasını xeyir bir işə sövq etsə, özü həmin işi görmüş kimidir». Sonra imam sözünə



---

.Vəsailuş-şiə» ۱۱-ci cild, səh. ۴۶۶» [۵] -۱

belə davam etdi: «Allah-təala sənin dostunun təqiyyəsinə xatir ona təqiyyəyə əməl edən və etməyənlərin, bizim şiə və dostlarımızın sayı qədər əcr və savab qərar verdi. Bu əməlin ən kiçik savabı yüz illik günahların bağışlanmasıdır. Dostuna əta olunacaq savablar onu bu işə sövq etdiyin üçün sənə də aid olacaq».(١) Təqiyyə müqabilində necə böyük mükafatlar nəzərdə tutulduğu rəvayətdən aydın görünür. Həzrətin dövründə təqiyyə o qədər vacib olmuşdu ki, həzrət şiələrin öz canlarını qorumaları üçün ona salam verməmələrini tələb edirdi. Hətta öz şiələrindən birinə belə buyurmuşdu: «Əgər təqiyyə etməzsənsə, öldürülərsən. Ya təqiyyə, ya da ölüm!»

## İCTİMAİ DURUM, ŞİƏLƏRİN VƏZİYYƏTİ

Söhbətimizin bu hissəsində şiələrin ictimai durumunu araşdıracaq, onların ictimai durum və rəhbərlik nüfuzunu nəzərdən keçirəcəyik. Həmin dövrdə əksər şəhərlərdə əhalinin şiə olmasına baxmayaraq, onlar yoxsulluq içində yaşayır, təzyiqlərə mə'ruz qalır, mühüm vəzifələrdən uzaqlaşdırılır, ən əsası isə, öz imamları ilə ünsiyyətdən məhrum edilirdilər.

## İMAMLA ÜNSİYYƏT

Həmin dövrdə imam öz şiələri ilə müxtəlif formalarda ünsiyyətdə olsa da, ona ciddi nəzarət olunduğundan və onunla ünsiyyətdə olan insanlara ağır işgəncələr verildiyindən imamla onun ardıcılları arasındakı əlaqə minimum həddə enmişdi. Uyğun əlaqənin zəifliyi səbəbindən şiələr arasında problemlər yaranırdı. İmam müxtəlif tədbirlərlə uyğun problemləri aradan qaldırmaq istəsə də, ünsiyyətin zəifliyi özünü büruzə verirdi.

## TƏZYİQ

Bu dövrdə şiələr abbasi xəlifələri tərəfindən ciddi təzyiqlərə mə'ruz qalırdılar. Söhbətimizin əvvəlində Mütəvəkkilin şiələrə və ələvilərə münasibətdə yol verdiyi cinayətlərdən, şakiriyyə qoşununun təşkil olunmasından, imam Hüseynin (ə) qəbrinin dağıdılmasından danışdıq. O, şiələrə daha çox təzyiq etmək üçün Misir hakiminə göstəriş vermişdi ki, talibləri İraqa sürgün etsin. Misir hakimi də bu göstərişə əməl etmişdi. Mütəvəkkil həmin vaxt hicri ۲۳۶-cı ildə onları ələvilərin sürgün yeri olan

Mədinəyə qovdu. Hicaz əhlinə xəbərdarlıq edildi ki, ələvilərlə yaxın ünsiyyətdə olmasınlar və onlara iqtisadi yardım göstərməsinlər. Bu əmri pozduğuna görə çox insanlar cəzalandırıldı. İsfəhaninin

səh:۴۷

---

.Təbərsi, «Ehticac» ۲-ci cild səh. ۲۶۶ [۶] -۱

yazdığına görə, Mütəvəkkil ələvilərə Mədinədə olmazın əziyyətlərini verirdi. Mədinədə ələvilər xalqın qalan hissəsindən tam şəkildə təcrid edilmişdilər. Onlar böyük ehtiyac .içərisində yaşayırdılar

### VƏZİFƏLƏRDƏN UZAQLAŞDIRMA

Mə’sudi yazır: «Mütəvəkkil yalnız şiə olduqları üçün İshaq ibn İbrahimi Samirra, Sirvanı Cəbəl hakimliyindən uzaqlaşdırdı. Eyni bəhanə ilə bir çox başqa insanlar da tutduğu vəzifələrdən kənarlaşdırıldılar. Onların əksəri təsdiq edirdilər ki, uyğun .məhrumiyyətlərin səbəbi onların imamla ünsiyyətdə olması idi

### İQTİSADİ İMKANLARIN MƏHDUDLAŞDIRILMASI

Mütəvəkkil Hüseyn (ə) övladlarına məxsus olan fədək torpaqlarını müsadirə etdi. Seyyid ibn Tavusun yazdığına görə, Fədək mülkünün gəliri iyirmi dörd min dinar təşkil edirdi. Mütəvəkkil Fədəki öz əlaltılarından olan Abdullah ibn Bəzyara bağışladı. Hicaz əhlinə ələvilərlə istənilən bir yaxınlıq və iqtisadi yardım qadağan edilmişdi. Əbül-Fərəc İsfəhani yazır: «Mütəvəkkil ələviləri iqtisadi sıxıntıya salırdı. Onlara yardımı qadağan .«edirdi. Onun bu göstərişinə qarşı çıxanlar ciddi cəzalandırılırdılar

### ŞİƏLƏRİN İCTİMAİ MƏQAMI VƏ RƏHBƏRLİK NÜFUZU

Hökumətin ciddi tədbirlərinə baxmayaraq, şiə imamlarının mə’nəvi nüfuzu get-gedə genişlənirdi. Hətta xəlifənin qəsri də nüfuz dairəsindən kənarda qalmamışdı. Xalq kütlələri ilə yanaşı bə’zi vəzirlər və əmirlər də yalnız imamları xəlifəliyə layiq bilir və onları qəlbən sevirdilər. Amma kimsə öz istəyini açıqlaya bilmirdi. İmam Hadinin (ə) ələvilər, kitab əhli, Mədinə əhli və şiələr arasında böyük nüfuzu vardı. İmamın nüfuzu ilə bağlı çoxlu əhvalatlar nəql olunur. Qeyd olunur ki, bir gün Mütəvəkkil çiban çıxartmışdı və bu çibanın irinləməsi səbəbindən ölüm yatağına düşmüşdü. Kimsə xəlifənin bu dərdinə əlac edə bilmirdi. Mütəvəkkilin anası Şüca nəzr etdi ki, əgər oğlum sağalıb ayağa dursa, öz malından böyük bir hissəsini imam Hadiyə (ə) göndərəcək. Mütəvəkkilin ən yaxın adamlarından olan Fəth ibn Xaqan Mütəvəkkilə dedi: «Yaxşı olar ki, imam Hadinin (ə) yanına bir adam göndərib xəstəliyinə çarə qılasan. Onun məsləhəti çox faydalı ola bilər: «Onun yanına bir adam göndər». Fəth ibn Xaqanın

.qayıtdı. Mütəvəkkil qısa bir vaxtda sağaldı

İmam Hadinin (ə) Mədinədə qalmasından narahat olan Mütəvəkkil onu Yəhya ibn Hərsəmə vasitəsi ilə Samirraya çağırdı. İmam öz ailəsi ilə birlikdə Samirraya yola .düşdü. İmamın təqvasından heyrətə gəlmiş Yəhya özü ona xidmət edirdi

Yə'qubi nəql edir ki, imam Yasəriyyəyə çatan kimi Bağdad hakimi İshaq ibn İbrahim onun görüşünə gəldi. Xalqın imama məhəbbətinə şahid olan İshaq onu bir gecə Bağdadda qonaq saxlamağa çalışdı. Yəhya Bağdad hakiminə imamla bağlı əhvalatı danışdıqdan sonra hakim dedi: «Bu şəxs həzrət peyğəmbərin övladıdır. Sən Mütəvəkkilin bu ailəyə münasibətini bilirsən. Əgər imam haqqında bir mənfi söz desən, onu öldürəcək və qiyamət günü Peyğəmbərə (s) cavab verməli olacaqsan». Yəhya dedi: «And olsun Allaha, mən ondan yalnız yaxşılıq görmüşəm.» Sonra Bağdadı tərk edib Samirraya yola düşdülər. Samirraya çatan kimi Yəhya tələsik özünü Vəsif Türkiyə çatdırdı və onu əhvalatdan xəbərdar etdi. Vəsif Yəhyaya belə dedi: «Ey Yəhya and olsun Allaha, əgər imamın başından bir tük əskik olsa, yalnız sən cavab verəcəksən . . .» .İshaq və Vəsifin imama münasibəti Yəhyanı heyrətə gətirdi

İmam elə bir nüfuz sahibi idi ki, o Mütəvəkkilin sarayına daxil olarkən bütün saray əhli .özündən ixtiyarsız ayağa qalxdı. Onlar tələsik qapıları açır, pərdələri qaldırırdılar

Nəql olunur ki, xəlifənin övladlarından biri üçün qurulmuş şadlıq məclisində imam da iştirak edirdi. İmam məclisə daxil olduğu vaxt hamı bir nəfər kimi ayağa qalxdı və . . . məclisi sükut bürüdü

Ələvi Məhəmməd ibn Həsən Əştər deyir: Atamla birlikdə Mütəvəkkilin qəsri qarşısında durmuşduq. Orada Abbasilər, taliblər və qoşun başçıları da vardı. Bu vaxt imam Hadi (ə) göründü. O, xəlifənin qəsrinə üz tutmuşdu. Onun gəlişini görənlər istisnasız olaraq atlarından düşdülər və ehtiram əlaməti olaraq ona yol verdilər. Cəmiyyətin imama göstərdiyi hörmət oradakılardan birini qəzəbləndirdi və həmin şəxs e'tiraz edərək dedi: «Bütün bu hörmət-izzət kimin üçündür?! Nə üçün bu gəncə bir bu qədər hörmət edilir? O nə məqam, nə də yaşca bizdən böyük deyil. And olsun Allaha, o qəsrdən çıxanda nə atdan düşəcək, nə də ayaq üstə dayanacağıq». Əbu-Haşim Cə'fəri onun cavabında dedi: «And olsun Allaha zəlilcəsinə ona ehtiram göstərəcəksən». Çox

keçməmiş imam qəsrdən çıxdı. Təkbir səsi ucaldı və hamı ayağa qalxdı Əbu-Haşim camaata üz tutub dedi: «Məgər azca əvvəl demirdinizmi ki, ona ehtiram göstərməyəcəksiniz?» Oradakılar dedilər: «And olsun Allaha, bu özümüzdən asılı olmadı. İxtiyarsız olaraq atdan düşdük və ona ehtiram göstərməyə məcbur olduq».

Bütün böyüklər imama ehtiram göstərir, onun rəhbərliyini və fəzilətli olduğunu qəbul edirdilər. Bu adamlardan biri də ələvi Zeyd ibn Musa ibn Cəfər idi. «Zəydunnar» adı ilə tanınan

bu şəxs həzrətin atasının əmisi sayılırdı. Bir gün Zeyd imamı görmək məqsədi ilə onun evinə üz tutur. Qapıda keşik çəkən Ömər ibn Fərəcdən xahiş edir ki, imamdan onunla görüş üçün icazə alsın. İmam icazə verir. Zeyd otağa daxil olur və imamın qarşısında ehtiram əlaməti olaraq iki dizi üstə əyləşir. Onun bu hərəkəti həzrətin imamətinin .e'tirafı idi

Başqa bir vaxt imamla görüşə gələn Zeyd onun məclisdə olmadığını görüb bir kənarda əyləşir. Az sonra imam məclisə daxil olur. İmamın daxil olduğunu görən Zeyd dərhal ayağa qalxır və ehtiram əlaməti olaraq ona öz yerini təklif edir. Həmin vaxt imam çox cavan, Zeyd isə yaşlı idi. Onun bu hərəkəti yalnız imamın məqamının və fəzilətinin e'tirafı sayıla bilərdi. Həzrətin imamət məqamını qəbul edənlərin hamısı eyni cür rəftar .edirdilər

Yəhya Mədinəyə, Mütəvəkkilin göstərişi ilə imam Hadini (ə) Samirraya gətirməyə göndərildiyi vaxt bu xəbəri eşidən Mədinə əhli elə ah-nalə çəkir ki, Yəhya deyir: «Mən belə bir şey nə görmüşəm, nə də eşitmişəm. Mən onlara təskinlik verməyə məcbur .«oldum. And içdim ki, imama heç bir təhlükə yoxdur

İmam təkcə müsəlmanlar və şiələr arasında nüfuzlu deyildi. Kitab əhlindən olanlar da ona xüsusi bir hörmətlə yanaşırdılar. Onlar həzrətə tez-tez hədiyyələr gətirir, öz .problemlərinin həllində ondan yardım istəyirdilər

Hibətullah ibn Əbu-Mənsur Mosulu belə nəql edir: «Məsihi Yusif ibn Yə'qub atamın dostlarından idi. Bir gün o Bağdada bizə qonaq gəldi. Atam ondan gəlişinin səbəbini soruşduqda Yusif dedi: «Abbasi Mütəvəkkil məni hüzuruna çağırıb. Amma səbəbini bilmirəm. Bu təhlükədən amanda qalmaq üçün (Allahın razılığı üçün) Əli ibn .«Məhəmməd ibn Əli Ərrizaya (ə) yüz dinar hədiyyə edəcəyəm

Mütəvəkkil Samirrada xalqın imam Hadi (ə) ilə görüşlərinə mane olardı. Bir gün həzrət (ə) Mütəvəkkilin qəsrində olduğu vaxt qəsrin ətrafında xeyli şiə toplanmışdı. Rəvayətçi nəql edir ki, onlardan bunun səbəbini soruşdum. Dedilər: «Gözləyirəm ki, mövlamız qayıtsın, onu görək, ona salam verək, sonra gedək». Soruşdum ki, məgər onu .«tanıyırsınız? Dedilər: «Bəli, hamımız onu tanıyırıq

## İMAM HƏSƏN ƏSGƏRİNİN (Ə) NÜFUZU

Söhbətimizin bu hissəsində imam Həsən Əsgərinin (ə) xəlifələrin, vəzirlərin, kitab əhlinin, alimlərin, şiələrin və digər zümrələrin yanındakı nüfuzunu nəzərdən .keçirəcəyik

səh:۵۰

Bə’zi xəlifələr, eləcə də, Mö’təməd çətinliyə düşdükdə imama üz tutar və ondan dua istəyərdi. Hətta bir dəfə imam zindanda olduğu vaxt, Mö’təməd onu azad edərək .cəmiyyətdə yaranmış çaxnaşmaları aradan qaldırmaq üçün göndərir

Bir gün imamın qardaşı Cə’fər xəlifə ilə öz qardaşının məqamı haqqında danışarkən xəlifə deyir: «Qardaşının məqamı bizim əlimizdə deyildir. Bu məqam Allah tərəfindən verilmişdir. Biz onun məqamını alçaltmağa nə qədər çalışdıqsa da, o, elm və ibadəti «. . . səbəbindən ardıcıl olaraq nüfuzunu artırdı

İmamın müasiri olmuş abbasi xəlifəsinin vəziri Übeyd ibn Xaqan deyir: «Əgər Bəni-Abbasilər xilafətdən uzaqlaşmış olsaydı, haşimilərdən yalnız o (imam Həsən Əsgəri (ə)) bu məqama layiq olardı. Yalnız o öz elmi, iffəti, hidayəti, səbri, zöhdü, ibadəti, gözəl əxlaqı, nəfs tərbiyəsi ilə xəlifəliyə layiqdir. Atası da onun kimi böyük, səxavətli, alim və .«xeyirxah idi

Əhli-beyt (ə) düşmənlərindən olan Əhməd ibn Übeydullah ibn Xaqan imam Həsən Əsgərinin ictimai məqamı və nüfuzu haqqında belə deyir: «Samirrada ələvilər arasında Həsən ibn Əli ibn Məhəməd Ərriza kimi rəftara malik, iffətli, əzəmətli, səxavətli, qohumlarının və xəlifələrin, eləcə də, bütün bəni-Haşimin hörmət etdiyi bir kəs görmədim. Təkcə onlar yox, bəlkə də bütün vəzirlər, saray xadimləri, qoşun başçıları həzrəti hamıdan böyük bilirdi». Həmin şəxs imamın misilsiz bir insan olduğunu belə qeyd edir: «Mən bəni-Haşimdən, sərkərdələrdən, saray xadimlərindən, qazilərdən, fəqihlərdən və başqalarından imamın haqqında yalnız xoş sözlər eşitdim. Onun rafizilərin (şiələrin) imamı olduğunu hamı bir ağızdan təsdiq edirdi. Hamı onun .«haqqında müsbət fikirdə olduğundan mən də onu yüksək məqam sahibi sayırdım

Saray əmirlərindən biri imam Həsən Əsgəri (ə) ilə rastlaşarkən dərhal atdan düşdü və ona ehtiram göstərdi. İmam ona buyurdu: «Yoluna davam et». Həmin şəxs həzrətə .ehtiram göstərərək geri qayıtdı

Mütəvəkkilin həmin dövrün ən üstün təbiblərindən sayılan həkimi Bəxtişu imamdan qan almağa gedən şagirdinə belə deyir: «İbn-Ərriza ondan qan almaq üçün bir nəfər göndərməyimi istəyib. Get bu işi gör və bil ki, o, səma altda yaşayanların ən biliklisidir. .«Məbada onun göstərişlərinə biganə olasan və ya ona e’tiraz edəsən

İmam öz dövrünün alimləri arasında yüksək məqam sahibi idi. Həmin dövrün tanınmış ədibi Cahiz Bəsrədə yaşamasına baxmayaraq imamın haqqında deyir: «Taliblərdən savay heç bir ərəb və qeyri-ərəb ailəsinə nəsib olmayıb ki, bütün sülalə alim, pak, pəhrizkar, cəsur, səxavətli, kəramətli olsun. Onlardan bə'zisi peyğəmbərin canişini, bə'ziləri canişinliyə namizəd olmuşlar. Onlar Həsən ibn Əli, ibn Məhəmməd, ibn Əli, ibn Musa ibn Cə'fər, ibn səh:٥١

Məhəmməd, ibn Əli, ibn Hüseyn ibn Əlidən ibarətdirlər. Kitab əhlindən olan bir çox alimlər də imamın məqamının yüksəkliyini e'tiraf edirdilər. Həzrət bu adamların haqqında buyurur: «And olsun Allaha ki, məsihilər bizim haqqımızı bə'zi müsəlmanlardan daha yaxşı tanıdı. Onların bə'ziləri həzrət vasitəsi ilə iman gətirib müsəlman oldular. İslamı qəbul edən kitab əhlinə Ənuş Nəsranini, Rahib Dir qulu misal .göstərmək olar

Məmələkətin hər yerindən insanlar həzrətin ziyarətinə tələsirdilər. İmamın saraya də'vət olunduğu gün bütün yol boyu imamı görməyə iştiyaqlı, gözüyaşlı insanlar toplanmışdı. Hətta yol bağlanmışdı və keçmək mümkünsüz olmuşdu. Ətrafda böyük həyəcan olsa da, imam qapıdan çıxdığı vaxt ətrafı sükut bürümüşdü. Onun görüşünə gələnlər heyrət içində susurdular. İzdiham imama yol verir və onu yaşlı gözlərlə .ötürürdülər. Yol boyu toplanmış izdiham imamın qayıdışını da belə gözləyirdi

Şeyx Səduq xəlifənin Qumdakı nümayəndəsi, əhli-beyt (ə) düşməni olan Əhməd ibn Übeydullah ibn Xaqanın dilindən belə nəql edir: «İmam Həsən Əsgərinin (ə) şəhadəti zamanı bütün bazarda tə'til oldu. Bəni-Haşim, əsgərlər, saray xadimləri, eləcə də, atam imamın dəfninə tələsirdilər. Həmin gün Samirra izdihamın çoxluğu və həyəcan .«baxımından qiyamət səhnəsini xatırladırdı

İmam Hadi (ə) və imam Həsən Əsgərinin (ə) böyük səhabələrindən olan Əbu-Haşim Cə'fərinin imam Həsən Əsgərini (ə) vəsf edən şe'rləri imamın öz şiələri arasındakı :məqamını gözəl əks etdirir. Əbu-Haşim deyir

,Bütün mö'cüzələr verilmiş ona

.Musaya e'cazlar verildiyi tək

,Peyğəmbərdə olan vəsidə də var

.İnanmasan, dəlil var ətək-ətək

## XÜLASƏ

Haqqında danışılan dövrdə şiələrin ictimai-siyasi və düşüncə, eləcə də, həmin dövrdə

.şiə rəhbərliyinin səciyyəvi xüsusiyyətləri vardır

Əqidə və düşüncə baxımdan mümkün böhranlı vəziyyətlərdən çıxmaq üçün şiə üsulu və hədisləri tərtib edilmiş, yetərli nəzəri əsaslar hazırlanmışdı. İslamı azğınlıqlardan qorumaq, əqidə ilə bağlı suallara cavab vermək, on ikinci imamın (ə) qeyb dövrü üçün .hazırlıq görmək uyğun dövrdə imamların fəaliyyət sahələrindən idi

Vəziyyət siyasi baxımdan analiz edildikdə görürük ki, həmin dövrdə şiə rəhbərliyi məcburi şəkildə Mədinədən Samirraya gətirilmiş və ciddi nəzarət altına alınmışdır. Mə’sum imamlar təqiyyə siyasətini seçərək vəkillər qurumunu gücləndirmiş və genişləndirmişlər. Onlar bə’zi ələvi qiyamlarını himayə etmiş, təqiyyə yolu ilə şiələrin .varlığını qorumuş, bə’zi şiələrin hakimiyyətdə vəzifə tutması üçün şərait yaratmışlar

Məsələyə ictimai baxımdan yanaşdıqda mə’lum olur ki, həmin dövrdə şiələr son yoxsulluq həddində yaşamış, daim təzyiqlərə mə’ruz qalmış, öz imamları ilə görüşdən məhrum edilmişlər. İmamlar ciddi şəkildə nəzarətə alındığı bir vaxt cəmiyyətin müxtəlif təbəqələri, eləcə də, geniş xalq kütlələri, alimlər, kitab əhli, hətta vəzirlər və .əmirlər də onların əzəmətli şəxsiyyətindən tə’sirlənmişdir

## BEŞİNCİ FƏSİL

## ŞİƏLƏRİN MƏSUM İMAM TƏRƏFİNDƏN QEYB DÖVRÜNDƏ HAZIRLANMASI

Qeyb və məhdəviyyət inancı müsəlmanlar, xüsusi ilə də şiələr arasında qədim tarixə malikdir. Çoxsaylı peyğəmbər və ələvi hədisləri vasitəsi ilə bu inanc müsəlmanların düşüncəsində özünə yer etmişdi. Dini mənbələrimiz bu məsələ haqqında mə’lumat verən peyğəmbər və imam rəvayətləri ilə zəngindir. Şeyx Tusi bu barədə deyir: «Qeyb dövründən çox-çox əvvəllər həzrət Mehdinin (ə) ata-babalarının verdiyi mə’lumatlar onun imamlığının dəlilidir. Xəbər verilir ki, həzrət Mehdi (ə) qeybə çəkiləsidir. Bu qeybin necəliyi izah olunur və hansı ixtilafların baş verəcəyi barədə mə’lumat verilir. Xəbər verilir ki, həzrət iki dəfə qeybə çəkiləsidir. Bu qeyb dövrlərindən biri o birindən daha uzundur. Birinci qeyb dövrünün müddəti mə’lum, ikinci qeyb dövrünün müddəti isə «.na’məlumdur

Şeyx Tusi öz sözünün davamında həzrət Mehdi (ə) və onun qeyb dövrü haqqında peyğəmbər və imamlardan nəql olunmuş rəvayətləri zikr edir. Şeyx Səduqun «Kəmalud-din və təmamun-ne’mət», ibn Əbu Zeynəb No’maninin «Əl-ğeybət» kitablarında uyğun mövzuda xeyli rəvayət nəql olunmuşdur. Sünni mənbələrində də bu mövzuda rəvayətlərlə rastlaşırıq. Tədqiqatçıların dediyi kimi bu rəvayətlərə əsaslanaraq iddia etmək olar ki, həzrət Mehdi (ə) və onun qeyb məsələsi şiə və sünni mənbələrində tam təsdiqlənmiş bir həqiqətdir. Ona görə də şiəlik iki yüz altımış il tarixə malik bir hazırlıqla qeyb dövrünə daxil olur. Şiə düşüncəsində qeyb və məhdəviyyət mövzularının incəlikləri də özünə yer tapır. Bu incəliklər həzrət peyğəmbər və imamlar tərəfindən bəyan olunmuşdur. Mövzunu daha da aydınlaşdırmaq üçün uyğun rəvayətləri nəzərdən keçiririk. Sonra isə imam Hadi (ə) və imam Həsən Əsgərinin (ə) qeyb dövrünə hazırlıq məqsədi ilə gördüyü işlərə nəzər salacağıq. İmam Mehdi (ə) və onun qeyb məsələsini aydınlaşdırmaq üçün əsasən üç kitaba müraciət edəcəyik: Şeyx Səduqun «Kəmalud-din və təmamun-ne’mət», No’maninin «Əl-ğeybət» və Şeyx Tusinin «Əl-ğeybət» əsərləri. Digər şiə və sünni mənbələrinə də müraciət edərək həzrət Mehdi .(ə) haqqında hədislərlə tanış ola bilərik

## ...İMAM MEHDİNİN (Ə) ANADAN OLMASI VƏ

İMAM MEHDİNİN (Ə) ANADAN OLMASI VƏ QEYBƏ ÇƏKİLMƏSİ HAQQINDA HƏZRƏT PEYĞƏMBƏR VƏ İMAMLARIN ÖNCƏDƏN XƏBƏR VERMƏSİ

Əbdür-Rəhman ibn Səmərə deyir: «Həzrət peyğəmbərə ərz etdim ki, ey Allahın rəsulu, mənə qurtuluş yolu göstər. Həzrət buyurdu: «İstəklərin ixtilafı və təfriqələr tüğyan etdiyi vaxt Əli ibn Əbutalibə (ə) üz tut. O, mənim ümmətimin imamı, məndən sonra onlara

mənim xəlifəmdir. Onun vasitəsi ilə haqq batildən ayrılar. Hər kəs ona sual versə, cavab alar, hər kəs ondan yol istəsə, yol göstərər, hər kəs haqqı axtarsa, onu Əlidə (ə) tapar. Ona sığınan kəs amanda qalacaq, ona arxalanan nicat tapacaq, ona iqtida edən hidayət olacaq. Ey Səmərə oğlu! Sizlərdən kim ona dost olsa, nicat tapacaq, ona düşmən olanlarınız isə həlak olacaq. Ey Səmərə oğlu! Əli (ə) məndən, onun ruhu mənim ruhumdan, onun batini mənim batinimdəndir. O, mənim qardaşımdır, mən isə onun qardaşı. O, dünya xanımlarının ağası qızım Fatimənin əridir. Mənim ümmətimin iki imamı və Behişt gənclərinin iki ağası ondandır. Yə’ni Həsən və Hüseyn, Hüseynin doqquz övladı. Onların doqquzuncusu mənim ümmətimin qaimidir. O, yer üzünü zülm .bürüdüyü bir vaxt qiyam edib, yer üzündə ədaləti bərpa edər

Abdullah ibn Abbas deyir: «Həzrət Peyğəmbər (s) buyurdu: «Allah-təala yer üzünə nəzər salıb məni özünə peyğəmbər seçdi. Sonra bir daha nəzər salıb Əlini (ə) imam olaraq seçdi. Mənə əmr etdi ki, onu özümə qardaş, vəli, vəsi, xəlifə və vəzir götürüm. Əli (ə) məndəndir. O, mənim qızımın əri, iki övladım Həsən (ə) və Hüseynin (ə) atasıdır. Bilin ki, Allah-təala məni və onları öz bəndələri üçün höccət etmiş, Hüseyndən (ə) məni vəziyyətimi hifz edəcək imamlar qərar vermişdir. Onların doqquzuncusu mənim əhli-beytimin qaimi, ümmətimin Məhdisidir. O xalq arasında surət, danışıq və rəftarca ən çox mənə oxşar olan şəxsdir. O uzun bir qeyb dövründən sonra zühur edər və ilahi əmri aşkarlayar. Yer üzünü zülm bürüdükdən sonra Allahın və mələklərin yardımı ilə o, .«ədaləti bərpa edər

Əbu-Həmzə imam Baqirdən (ə) nəql edir ki, həzrət Peyğəmbər (s) belə buyurdu: «Xoş o kəsin halına ki, mənim əhli-beytimdən olan qaimi görər, qeyb dövründə, qiyamından qabaq ona iqtida edər, onun dostunu dost, düşmənini düşmən tutar. Belə bir şəxs .«mənim dostlarımdandır və qiyamət günü ümmətimin ən əzizlərindəndir

### (İMAM ƏLİ (ə

Əsbəğ ibn Nəbatə deyir: Əmirəl-mö’minin Əli ibn Əbi-Talibin (ə) yanına getdim. O, gözünü yerə dikib dərin fikrə getmişdi. Ərz etdim ki, ya Əmirəl-mö’minin (ə), yoxsa yerə rəğbətiniz var. Həzrət buyurdu: «Yox, vallah! Heç vaxt nə yerə, nə də dünyaya rəğbətim olub. Məndən olan on birinci övladım haqqında düşünürəm. Yer üzündə

ədaləti bərpa edəcək Mehdi odur. O, qeybə çəkiləcək və bu qeyb ilə əlaqədar kimi hidayət olacaq, kimi yolunu azacaq». Əsbəğ deyir. Ərz etdim ki, belə bir iş olacaqmı? Həzrət buyurdu: «Bəli! Bu qəti bir işdir. Sən hara, belə bir məsələdən xəbərdarlıq hara?! Ey Əsbəğ! Onlar bu ümmətin seçilmişləridir və bu ailənin böyükləri olacaqlar». Ərz etdim ki, bəs ondan sonra nə olacaq!

Buyurdu: «Sonra Allah öz iradəsini yerinə yetirəcək. Çünki Onun istəkləri və məqsədləri .«var

Əbdül-Əzim Həsəni imam Cavaddan (ə) nəql edir ki, həzrət Əli (ə) belə buyurmuşdur: «Bizdən olan qaim üçün uzun bir qeyb dövrü var. Şiələri qaimin qeyb dövründə çoban ardınca gedən və onu tapa bilməyən sürü kimi görürəm. Hər kəs qaimin qeyb dövründə dinində möhkəm olsa, qeyb uzun çəkdiyindən qəlbi bərkiməsə, həmin şəxs qiyamət günü mənimlə və mənim dərəcəmdə olar. Sonra imam buyurdu: «Həqiqətən, bizim qaim qiyam edəndə onun öhdəsində kimsənin bey'əti yoxdu. Ona görə də məxfi .«şəkildə doğulmuş və özü qeybə çəkilmişdir

## (HƏZRƏT FATİMƏ (Ə

Cabir ibn Əbdullah Ənsari bir rəvayətdə həzrət Fatimənin (ə) əlində gördüyü vərəq haqqında danışırdı. O bildirir ki, bu vərəqdə təəccüblü bir parlaqlıq varmış və onda on iki imamın adı analarının adı ilə birlikdə qeyd olunubmuş. Sonuncu ad qaimin adı .olmuşdur

## (İMAM HƏSƏN MÜCTƏBA (Ə

Əbu Səid Əqisa nəql edir ki, İmam Həsən (ə) Müaviyə ilə sülh bağladıqdan sonra xalqın bir hissəsi onu məzəmmət etdi. Həzrət buyurdu: «Vay olsun sizə! Nə düşündüyümü bilmirsiniz. Nə etdimsə, şiələrin xeyiri üçün etdim. Məgər bilmirsinizmi ki, mən peyğəmbər buyuruğuna görə sizin imamınızam və mənə itaət etməyiniz vacibdir?! Bilmirsinizmi ki, mən behişt cavanlarının iki ağasından biriyəm?!» Camaat imamın buyuruğunu təsdiq etdi. Həzrət buyurdu: «Məgər bilmirsinizmi ki, Xızır gəmini deşdiyi, divarı bərpa etdiyi, uşağı öldürdüyü vaxt Musa qəzəbləndi?! Çünki o, bu işlərin səbəbini bilmirdi. Əslində isə bu işlərdə ilahi hikmət vardı. Məgər bilmirsinizmi ki, bizlərdən yalnız qaimin öhdəsində dövrünün zorlusuna bey'ət etmək borcu yoxdur?! Məryəm oğlu İsa ona iqtida edər, Allah-təala onun dünyaya gəlişini gizli saxlayar və onu qeybə çəkər. Bunun səbəbi odur ki, imam zühur etdiyi vaxt öhdəsində kimsənin bey'əti olmasın. O, qardaşım Hüseynin (ə) doqquzuncu, qadınlar Seyyidəsinin övladıdır. Qeybi dövründə Allah onun ömrünü uzatmışdır. Sonra onu öz qüdrəti ilə yaşı qırxdan az gənc .«şəklində aşkar edəcək. Bu ona görədir ki, Allahın hər şeyə qadir olduğu bilinsin

## (İMAM HÜSEYN (Ə

Əbdür-Rəhman ibn Əlhəccac imam Sadiqdən (ə), o həzrət isə imam Hüseyndən rəvayət edir ki, imam buyurmuşdur: «Mənim övladlarımdan doqquzuncusunda həzrət Yusif və həzrət Musanın sünnələri var. O, biz əhli-beytin qaimidir və Allah-təala onun əmrini bir gecədə islah

səh:۵۶

.«edər

Həmdanlı bir şəxs imam Hüseyndən (ə) belə eşitdiyini nəql edir: «Bu ümmətin qaimi mənim övladlarımdan doqquzuncusudur. Qeyb sahibi odur və onun mirası diri olduğu .«halda bölünər

Əbdürrəhman ibn Səlit deyir: «İmam Hüseyn (ə) buyurdu: «On iki Məhdi bizdəndir. Onların birincisi Əli ibn Əbi-Talib və sonuncusu mənim övladlarımdan doqquzuncusudur. Qaim imam odur. Allah onun vasitəsi ilə yer üzü öldükdən sonra onu dirildər və müşriklərin istəyinin ziddinə olaraq, haqq dini bütün dinlərə qalib edər. O qeybə çəkiləcək və bu qeybi bir qrup inkar edəcək. Başqa bir qrup isə öz əqidəsində sabit qalacaq. Onlara əziyyət veriləcək və deyiləcək: «Əgər düz deyirsinizsə, verdiyiniz və'də nə vaxt gerçəkləşəcək?» Bilin ki, onun qeybi zamanı əziyyətlərə və inkarlara səbr .«edən kəs Allah rəsulunun yanında qılıncla cihad edən kəs kimidir

## (İMAM SƏCCAD (ə

Əbu-Xalid Kabuli imam Səccaddan (ə) müfəssəl bir rəvayət nəql etmişdir. Rəvayətin xülasəsi belədir: «İmam Səccada (ə) ərz etdim ki, itaəti vacib edilmiş şəxslər haqqında mənə xəbər verin. Həzrət buyurdu: «Allah tərəfindən xalqın itaət etməsi vacib edilmiş kəslər Əmirəl-mö'minin Əli ibn Əbi-Talib, Həsən və Hüseyn, Əlinin iki övladlarıdır». Ərz etdim ki, ey mənim ağam, yer üzünün ilahi höccətsiz qalmayacağı rəvayət edilib. Səndən sonra höccət və imam kimdir? Həzrət buyurdu: «Övladım Məhəmməd, sonra Cə'fər». Sonra həzrət Peyğəmbərdən nəql olunmuş rəvayətə işarə edərək buyurdu: «Övladım Cə'fər dünyaya gələndə onun adını Sadiq qoyun. Çünki onun beşinci övladının adı Cə'fər olacaq və o yalandan imamlıq iddiası edərək Cə'fəri-Kəzzab (Yalançı Cə'fər) kimi tanınacaq. Allahın vəlisinin qeybi zamanı ilahi pərdəni kənara çəkmək istəyən odur». Sonra imam Səccad (ə) ağlayıb buyurdu: «Sanki Allahın vəlisinin əmrinin təftişinə təhrik edən Cə'fəri görürəm.» Sonra buyurdu: «Allahın vəlisinin, peyğəmbər vəsilərinin on ikincisinin qeybi uzun çəkəcək. Ey Əba-Xalid! Həqiqətən, qeyb dövründə onun imamlığına inananlar və zühurunun intizarını çəkənlər bütün dövrlərin əhalisindən üstündürlər. Çünki onlar ağıl və düşüncələrinin çoxluğundan sanki qeybi müşahidə edirlər. Allah-təala onları peyğəmbər yanında cihad edənlər dərəcəsində qərar

vermişdir. Onlar, doğrudan da, ixlaslı və həqiqi şiələrdir, eləcə də, Allahın dininə doğru .«də’vət edirlər. Ən böyük qurtuluş Fərəc (imamın zühuru) intizarıdır

## (İMAM BAQİR (Ə

Həzrət Mehdi, onun qeybi və zühuru, zühur əlamətləri haqqında imam Baqirdən (ə) və

səh:۵۷

Sadiqdən (ə) daha çox rəvayət nəql olunmuşdur. Onlar sadəcə, məsələnin kökünü .bəyan etməmiş, onun incəliklərinə də varmışlar

İbrahim ibn Ömər Kənasi deyir: «İmam Baqir (ə) buyurdu: «Həqiqətən, bu əmr sahibi üçün iki qeyb olacaq. İmam qiyam edəndə onun öhdəsində kimsənin bey’əti .«olmayacaq

Əbu-Bəsir nəql edir ki, imam Baqir (ə) buyurdu: «İmam Hüseyndən (ə) sonra doqquz .«imam gələr və onların doqquzuncusu qaimdir

Cabir Cö’fi nəql edir ki, imam Baqir (ə) buyurdu: «Xalq üçün elə bir dövr gələcək ki, həmin dövrdə onların imamları qeybə çəkiləcək. Xoş o insanların halına ki, dinlərində sabit qalacaqlar. Həqiqətin, onların ən kiçik mükafatı budur ki, Allah onlara xitabən buyurur: «Ey mənim bəndələrim, kənizlərim! Mənim sirrimə iman gətirdiniz və qeybimi təsdiq etdiniz. Mənim tərəfimdən sizin üçün ən yaxşı müjdə olsun. Sizsiniz mənim bəndələrim və kənizlərim. Sizdən qəbul edərəm və sizi bağışlayaram. Sizin vasitənizlə bəndələrimə mərhəmət yağışı nazil edərəm. Sizin xatirinizə bəndələrimdən bəla və «.əzabı uzaqlaşdıraram

## (İMAM SADİQ (ə

İmam Baqirə (ə) nisbətən uyğun mövzuda imam Sadiqdən (ə) daha çox rəvayət nəql olunmuşdur. Bu rəvayətlərdə imamın qeybinə, onun xüsusiyyətlərinə daha çox :toxunulmuşdur. Bu rəvayətlərdən bə’zilərini nəzərdən keçirək

Səfvan ibn Mehran nəql edir ki, imam Sadiq (ə) buyurdu: «Bütün imamları qəbul edib, həzrət Mehdini (ə) inkar edən kəs bütün peyğəmbərləri qəbul edib həzrət Məhəmmədi (s) inkar edən şəxs kimidir». Həzrətdən sual olundu ki, Mehdi sənin hansı övladındır? Buyurdu: «Yeddinci övladdan olan beşinci övlad. O, qeybə çəkilər və onun adını dilə .«gətirməyinizə icazə verilmir

Müfəzzəl ibn Ömər deyir: «İmam Sadiqə (ə) ərz etdim ki, kaş öz canişininizi bizə tanıtdıraydınız. Həzrət buyurdu: «Ey Müfəzzəl! Məndən sonra imam övladım Musadır. .«Son imam isə onun beşinci övladıdır

Müffəzəlin nəql etdiyi başqa bir rəvayətdə imam Sadiq (ə) buyurur: «Allah-təala məxluqları yaratmazdan on dörd min il əvvəl bizim ruhlarımızdan ibarət olan on dörd nur yaratdı». Həzrətdən bu on dörd nur haqqında soruşulduqda o buyurur: «Məhəmməd, Əli, Fatimə, Həsən, Hüseyn və Hüseynin övladlarından olan imamlar. Onların sonuncusu qeybə çəkildikdən sonra qiyam edəsi, Dəccalı öldürəsi və yer üzünü zülmdən qurtarası qaimdir».

Bə’zi rəvayətlərdə imam Sadiq (ə) öz şiələrini imamın qeybi məsələsinin qəbuluna hazırlayaraq onlara xəbərdarlıq edir. Əbu-Bəsir nəql edir ki, imam Sadiq (ə) buyurdu: «Əgər

sahibiniz qeybə çəkilsə, məbada onu inkar edəsiniz». Übeyd ibn Zürarə deyir: «İmam Sadiq (ə) buyurdu: «Xalq öz imamını itirər. Onların imamı həcc mərasimində iştirak edər. O, xalqı görsə də, xalq onu görməz».

Bə'zi rəvayətlərdə isə həzrətin qeybinin suğra və kübra olmaqla iki hissədən ibarət olduğu bildirilir.

Müfəzzəl ibn Ömər deyir: «İmam Sadiq (ə) buyurdu: «Əmr sahibinin iki qeybi olacaq. Onun qeyblərindən biri o qədər uzun çəkəcək ki, xalq onun dünyasını dəyişdiyini zənn edəcək. Bə'ziləri də belə düşünəcəklər ki, ona kiçik bir qrup itaət edir və onun yerini yalnız doğru yolda olanlar bilir».

Bu məzmunda rəvayətlər müxtəlif mənbələrimizdə, eləcə də, No'maninin «Əl-ğeybət» kitabında nəql olunmuşdur. O uyğun rəvayəti nəql etdikdən sonra bildirir: «Qeybin iki növ olduğunu göstərən hədislər mö'təbər hədislərdir. Allah-təala imamların kəlamının doğruluğunu aşkar etdi və qeyb iki növ oldu. Birinci qeyb dövründə imamla xalq arasında qərar tutan səfirlər vasitəsi ilə xalq öz suallarına cavab aldı. İkinci qeyb dövründə isə Allahın məsləhəti ilə səfirlər və vasitəçilər olmadı.»

## İMAM KAZİM (Ə)

Əvvəlki söhbətlərdə qeyd edildiyi kimi, şiə imamları daim şiələrin düşüncəsini qeyb məsələsinin qəbuluna hazırlayırdılar. İki yüz əlli il müddətində daim imamlarla olmuş şiələr imamın qeybə çəkilməsini hazırlıqsız qəbul edə bilməzdilər. Əgər qeyb inancının qəbulu üçün hazırlıq olmasaydı, çoxları yolunu azar, bu həqiqəti inkar edərdi. Ona görə də mə'sumlardan nəql olunmuş rəvayətlərdə uyğun mövzuda xəbərdarlıqlar olunur. İmam Kazimdən (ə) nəql olunmuş bir rəvayətdə buyurulur: «Məhəmməd ibn Yə'qub Kuleyni Əli ibn Cəfərə əsaslanaraq imam Kazimin (ə) belə buyurduğunu nəql edir: «Yeddinci övladdan olan beşinci imam qeybə çəkildiyi vaxt dininizdən ehtiyatlı olun. Həqiqətən, imam qeybə çəkilərkən bə'ziləri bu qeybə inanmaz. Bu Allah tərəfindən bir imtahandır.»

Davud ibn Kəsir Rəqqi deyir: «Əbül-Həsən Musa ibn Cəfərdən həzrət Mehdi (ə) haqqında soruşdum. O buyurdu: «O xalqdan qeybə çəkilmişdir.»

Əbdüs-Səlam ibn Saleh deyir: «Də’bəl ibn Əli Xüzaidən belə dediyini eşitdim: Mövlam imam Rizaya (ə) imam Mehdi (ə) ilə bağlı bir qəsidə oxudum. İmam qəsidəni dinləyib ağlamağa başladı və sonra buyurdu: «Ey Xüzai, bu iki beyti sənin dilinə ruhul-qüds gətirib. Bilirsənmi zühuruna işarə etdiyin kəs kimdir və nə zaman zühur edəcək?» Dedim: «Xeyr, ey mənim səh:۵۹

mövlam. Yalnız onu bilirəm ki, sizlərdən bir imam zühur edib yer üzünü ədalətlə dolduracaq». Buyurdu: «Ey Xüzai, məndən sonra imam övladım Məhəmməd, sonra, onun övladı Əli, sonra Əlinin övladı Həsən, sonra Həsənin övladı imam qaimdir. O, qeybə çəkildiyi vaxt zühuru gözlənilər, zühur etdiyi vaxt ona itaət edilər. Əgər dünyanın sonundan bir gün də qalmış olsa, doğrudan da, Allah həmin günü imamın zühur edəcəyi anadək uzadar. Dünya zülmlə dolduqdan sonra o dünyada ədaləti bərpa edər. Onun nə zaman zühur edəcəyi barədə Peyğəmbərdən soruşulduqda həzrət buyurmuşdur: «Onun zühuru qiyamətin bərpası kimidir. Allah-təala bu barədə .«buyurmuşdur ki, onu kimsə bilməz

## (İMAM CAVAD (ə

Rəvayətdə imam Cavadın belə buyurduğu nəql olunur: «Həqiqətən, məndən sonra imam övladım Əlidir. Onun fərmanı mənim fərmanımdır, onun dediyi mənim dediyimdir, ona itaət mənə itaətdir. Ondan sonra isə imam onun övladı Həsəndir». Növbəti imam haqqında həzrətdən soruşulduqda həzrət ağlayaraq buyurur: «Həsəndən sonra onun övladı qaim imamdır». Onun nə üçün qaim adlandırıldığı barədə sual verildikdə imam buyurur: «Çünki adı unudulduqdan və çoxları onun imamətini rədd etdikdən sonra qiyam edər». İmamın nə üçün müntəzir adlandırıldığı soruşulduqda həzrət buyurur: «Çünki o uzun müddətli qeybə çəkilər və xalis mö'minlər onun zühurunun intizarında olarlar. Şəkkahlar onu inkar edəcək və xatirəsini məsxərəyə «.qoyacaqlar. Bə'ziləri onun zühur vaxtı haqqında yalan söyləyəcəklər

Əbdül-Əzim Həsəni deyir: «İmam Cavadın (ə) yanına getdim. Ondan qaim haqqında soruşmaq istəyirdim. Həzrət sualımın cavabında buyurdu: «Ey Əbül Qasim! Həqiqətən, qaim bizdən olan həmin Mehdidir ki, qeybdə olduğu vaxt hamı onun intizarını çəkməli, zühur etdikdə ona ardıcıl olmalıdırlar. O, mənim övladlarımdan üçüncü övladdır. And olsun həzrət Məhəmmədi məb'us edənə və bizi imam qərar verənə, əgər dünyanın ömründən bircə gün qalmış olsa da, Allah həmin günü Mehdinin (ə) zühurunadək uzadacaqdır. Bununla yer üzünü zülm tutduqdan sonra ədalət bərpa ediləcək. Musa bir gecənin içində peyğəmbər olduğu kimi, Mehdinin də əmri bir gecədə .gerçəkləşəcək. Biz şiələr üçün ən üstün əməl onun zühurunun intizarıdır

## İMAM HADİ (Ə) VƏ İMAM HƏSƏN ƏSGƏRİNİN (Ə) ŞİƏLƏRİ QEYB DÖVRÜNƏ HAZIRLAMASI

Söhbətimizin əvvəlində bildirdiyimiz kimi, şiələr hələ peyğəmbər dövründən

başlayaraq sonuncu imamın qeyb dövrünə hazırlaşdırılırdılar. Uyğun mövzuda həzrət peyğəmbərin buyurduqları şiə imamları tərəfindən də təkrarlanmışdır. Hər bir şiə .imamı qeyb dövrü haqqında agahlıq vermiş, öz şiələrini xəbərdar etmişlər

Amma imam Hadi (ə) və imam Həsən Əsgərinin (ə) dövrünə nəzər saldıqda görürük ki, bu mərhələdə şiələrin qeyb dövrünə hazırlanması istiqamətində daha geniş işlər .görülür. İmamın qeyb dövrü yaxınlaşdıqca bu prosesin güclənməsi təbiidir

## HƏZRƏT MEHDİNİN (Ə) DÜNYAYA GƏLİŞİNİN YAXINLAŞMASI, QEYB DÖVRÜNÜN BAŞLAMASI VƏ NECƏLİYİ

Qeyd olunduğu kimi, məhdəviyyət və həzrət Mehdinin (ə) qeyb məsələsi ümumi şəkildə həzrət peyğəmbər və imamlar tərəfindən bəyan olunmuşdur. Ona görə də imam Hadi (ə) və imam Həsən Əsgəri (ə) bu dövrün yaxınlaşması barədə mə'lumat verir, şiələrin bu imtahandan üzüağ çıxmasına çalışırdılar. Çoxsaylı rəvayətlərdə imam Hadi (ə) bildirir ki, Mehdi (ə) onun övaladının övladıdır və onun qeyb dövrü .yaxınlaşmışdır

İmam Hadi (ə) buyurur: «Məndən sonra imam, doğrudan da, mənim övladım Həsən (ə), ondan sonra isə onun övladı qaimdir. Qaim yer üzünü zülm bürüdükdən sonra onu .«ədalətlə doldurasıdır

Əbdül-Əzim Həsəni deyir: «Ağam imam Hadinin (ə) yanına getdim. Məni görüb buyurdu: «Əhsən sənə ey, Əbül-Qasim! Sən bizim həqiqi dostlarımızdansan». Ərz etdim: «Mən sizə öz dinim haqqında danışmaq istəyirəm. Əgər bu sizi razı salsa, mən Allahla görüşən günədək dinimdə sabit qalım». Buyurdu: «Söylə». Sonra həzrət Əbdül-Əzim tövhid, peyğəmbərlik, imamətə olan e'tiqadından danışır. O, imamları imam Hadiyədək (ə) sadalayıb dayanır. Bu vaxt imam Hadi (ə) buyurur: «Məndən sonra imam övladım Həsəndir. Bəs onun canişini haqqında xalq nə düşünür?» Ərz etdim ki, nə düşünür, ey mənim mövlam? Həzrət buyurdu: «Çünki o zühur edib yer üzündə ədaləti «... bərqərar edənədək kimsə onu görməyəcək və adının da çəkilməsi caiz olmayacaq

Oxşar sözlərlə imam Hadi (ə) Əbu-Haşimə də müraciət etmişdi. İmamdan qaimin adının necə çəkilməsi barədə soruşulduqda imam buyurur: «Deyin ki, Ali-

.«Məhəmməddən olan höccət

Bə’zi məqamlarda imam Hadi (ə) şiələrə bildirir ki, Mehdi (ə) dünyaya gəlişi başqalarına məxfi olan bir şəxsdir. Həzrətin bu kəlamı şiələrə xəbərdarlıq edir ki, .məbada Mehdinin (ə) dünyaya gəlişinin məxfi olması onlarda şübhə doğura

İshaq ibn Məhəmməd Əyyub deyir: İmam Hadidən (ə) belə buyurduğunu eşitdim: «Bu

(işin sahibi o kəsdir ki, xalq onun haqqında «Hələ doğulmayıb» deyər».(١

İmam Hadi (ə) dünyasını dəyişdikdən və imamət vəzifəsi imam Həsən Əsgərinin (ə) öhdəsinə düşdükdən sonra həzrətin qeybə hazırlıq işi xeyli ağırlaşdı. İmamın əsrində Mehdi (ə) dünyaya gəldi artıq qeyb dövrünün başlamasına çox az vaxt qalmışdı. Ona görə də imam Həsən Əsgəri (ə) Mehdi və onun qeybi məsələsini ümumi şəkildə açıqlamaqdan əlavə, həzrət Mehdinin vücudunu və dünyaya gəlişini də isbat etməli idi. Həzrət xüsusi şiələrindən bə'zilərinə lütf göstərərək onların öz övladı həzrət Musa (ə) ilə görüşünü təşkil etdi. Bununla belə, Mehdinin (ə) dünyaya gəlişindən biganələr xəbər .tutmamalı idi

Həzrət Mehdini (ə) yalnız imamın xüsusi səhabələri görə bildi. Əhməd ibn İshaq Qummi deyir: «Mövlamın yanına gedib ondan öz canişini haqqında soruşdum. Həzrət buyurdu: «Ey Əhməd ibn İshaq! Allah-təala yer üzünü heç vaxt höccətsiz qoymaz. O, bu höccət vasitəsi ilə yer əhlini bəladan qoruyar, yağış nazil edər və bərəkətləndirər». Soruşdum ki, ey peyğəmbər övladı, sizdən sonra imam və xəlifə kimdir? Həzrət yerindən qalxıb otağa daxil oldu və çiynində çöhrəsi bədirlənmiş aya oxşar üç yaşlı oğlan uşağı ilə otaqdan çıxdı. O buyurdu: «Ey Əhməd ibn İshaq! Əgər Allahın yanında kəramətin olmasaydı, övladımı sənə göstərməzdim. Onun adı və künyəsi peyğəmbərin adı və künyəsidir. Yer üzünü zülm bürüdüyü bir vaxt o ədaləti bərqərar edər. Ey Əhməd ibn İshaq, onun məsəli Xızır və Zülqərneynin məsəli kimidir. And olsun Allaha, o qeybə çəkiləcək və həmin qeyb dövründə yalnız o kəslər nicat tapacaqlar ki, Allah imamətin qəbulunda onları möhkəm qərar versin və onları imamın zühurunun .«tezləşməsi üçün duaya müvəffəq etsin

Əhməd ibn İshaq ərz etdi: «Ey mənim mövlam, qəlbimi əmin edəcək bir əlamət varmı? Sual ağzından çıxan kimi körpə dil açdı və səlis ərəb dilində buyurdu: «Mən yer üzündə Bəqiyyətullah və Allah düşmənlərindən intiqam alanam. Ey Əhməd ibn İshaq! Gözlə .«görüb müşahidə etdikdən sonra nişanə gəzmə

Əhməd ibn İshaq deyir: Mən sevincək halda imamı tərk etdim. Səhəri gün imam Həsən Əsgərinin hüzuruna gəlib ərz etdim: «Ey Allah rəsulunun övladı, mənə göstərdiyin lütfə görə şadlığımın həddi-hüdudu yoxdur. Xızır və Zülqərneyn sünnəsinin övladınla nə

bağlılığı var?» Buyurdu: «Qeyb dövrünün uzunluğu, ey Əhməd! Belə ki onun imamətinə inananların çoxu öz əqidəsindən dönər. Yalnız dərin imana malik olanlar və Allahın yardım göstərdikləri öz əqidəsində qalar. Ey Əhməd ibn İshaq! Bu iş Allahın işlərindəndir. Bu sirr Allahın sirlərindəndir, bu qeyb onun qeyblərindəndir. Dediklərimi qəbul et və gizlə. Şükr



---

.Biharul-ənvar», ۵۱-ci cild, səh. ۳۴۱» [۷] -۱

.«edənlərdən ol ki, sabah «İlliyyində» bizimlə olasan

Bə’zi məqamlarda imam Həsən Əsgəri (ə) qeyb vaxtını dəqiq göstərmişdir. Əbu-Ğanim deyir: İmam Həsən Əsgərinin (ə) belə buyurduğunu eşitdim: «Hicri iki yüz altımışıncı ildə mənim şiələrimə ayrılıq üz verər». Bə’zi rəvayətlərdə imam qeyb dövrü .başladıqdan sonra şiələr arasında yaranacaq ixtilaflara toxunur

Musa ibn Cə’fər ibn Vəhəb Bağdadi deyir: İmam Həsən Əsgərinin (ə) belə buyurduğunu eşitdim: «Məndən sonra canişinimlə bağlı ixtilafların olacağını sanki görürəm . . . Bilin ki, övladım üçün insanların şəkkə düşəcəyi qeyb dövrü var. Yalnız .«Allahın hifz etdikləri imanında sabit qalar

Bir rəvayətdə həzrət şiələri qeyb dövründə səbrə və zühur intizarına çağırır. Bu məsələ ilə bağlı məktublarından birində həzrət Əbül-Həsən, Əli İbn Hüseyn ibn Babiyyə Qummiyə yazır: «Səbr et və zühur intizarında ol. Həzrət peyğəmbər buyurmuşdur ki, mənim ümmətimin ən üstün əməli fərəc (zühur) intizarıdır. «.Peyğəmbərin müjdə verdiyi övladım zühur edənədək bizim şiələr qəm-qüssədə olar

## ŞİƏLƏRLƏ BİR BAŞA RABİTƏNİN AZALMASI

İmam Hadi (ə) və imam Həsən Əsgərinin (ə) qeyb dövrünə hazırlıq məqsədi ilə gördüyü işlərdən biri də şiələrdən addım-addım pərdələnmə olmuşdur. Bu məsələ Məs’udinin «İsbatul-vəsiyyət» kitabında yetərincə aydınlaşdırılmışdır. O deyir: «İmam Hadi (ə) bə’ziləri istisna olmaqla, yaxın adamlarından kənarlaşdı. O, imamlıq məqamına çatdığı zaman öz səhabələri ilə pərdə arxasından danışırdı . . .» Məs’udinin dedikləri bir qədər mübaliğəli olsa da, həqiqətə uyğundur. Hər iki imamın qeyb dövrünə yaxın vaxtda yaşaması uyğun müddəanı təsdiqləyir. Çünki son imamın qəfil .qeybə çəkilməsi vəziyyəti xeyli ağırlaşdıra bilərdi

İmam Hadi (ə) və imam Həsən Əsgəri (ə) həm Samirrada Abbasilərin ciddi nəzarəti altında olduğundan, həm də qeyb dövrü yaxınlaşdığından, adətən, şiələrdən pünhan qalar, onlarla vəkillər vasitəsi ilə əlaqə saxlayardılar. İmamlar şiələrlə məktub vasitəsi ilə də əlaqə saxlayırdılar. Əhməd ibn İshaq Qumminin imam Həsən Əsgəridən (ə) onun məktublarını tanımaq üçün xətt nümunəsi istəməsi deyilənlərə sübutdur. İmamın yolu

oturmuş bir şəxs haray çəkib xalqı onun imamlığına çağırmaq istədiyi vaxt həzrət barmağını ağzına aparmaqla onu bu işdən çəkindirir.

## VƏKİLLƏR QURUMUNUN GÜCLƏNDİRİLMƏSİ

İmam Hadi (ə) və imam Həsən Əsgərinin (ə) şiələri qeyb dövrünə hazırlamaq üçün gördüyü növbəti iş vəkalət qurumunun gücləndirilməsi idi. Bu qurumun vəzifəsi vəkillər vasitəsi ilə imamla şiələr arasındakı əlaqəni tə'min etmək idi. Bu işin kökləri imam Sadiq (ə) dövrünə gedir. On illər boyu fəaliyyəti eniş-yoxuşlardan keçən bu qurum imam Hadi (ə) və Əsgərinin (ə) dövründə güclənməyə başladı. İmamları bu işə sövq edən qeyb dövrünün yaxınlaşması idi. Qeyb dövründə imamla şiələr arasında yeganə əlaqə vasitəsi bu qurum ola bilərdi. Həmin bu qurumun gücləndirilməsi üçün imam Hadi (ə) vəkillərə öz işlərini nizama salmaları barədə göstərişlər verirdi. Vəkillər tə'yin olunmuş istiqamətdə hərəkət etməli və başqa işlərə müdaxilə etməməli idilər. İmam Əyyub ibn Nuh və Əbu Əli ibn Raşidə yazdığı məktubda onları bu məsələlərdən xəbərdar edir. Vəkalət qurumunun qorunması üçün imam vəkillərə canişin tə'yin edərdi.

İmam Həsən Əsgəri (ə) də öz növbəsində vəkalət qurumunun işinin gücləndirilməsi üçün tədbirlər görürdü. Həzrət öz atası kimi müxtəlif yerlərdə vəkillərin işinə nəzarət üçün nümayəndələr tə'yin edirdi. O, Osman ibn Səid Əmrini «vəkillər vəkili» adı ilə tanıtdıraraq, bütün vəkillərin ona müraciət etməsini göstəriş vermişdi. Qeyb dövründə Osman ibn Səid Əmri əsrin imamının səfiri olacağından bu iş böyük əhəmiyyət kəsb edirdi.

İmam Həsən Əsgərinin (ə) fəaliyyətlərindən biri də əhalisi şiələrdən ibarət olan yerlərə namələr göndərərək (məsələn, Nişabur) şiələrin vəkillərə itaətini, şər'i ödənclərin onlara verilməsini tapşırırdı. Vəkalət qurumları dini işlərin həll olunmasında mərkəzə çevrilirdi. İmam İshaq ibn İsmail Nişaburi və digər Nişabur şiələrinə yazdığı məktublarda vəkil tə'yin etdiyi İbrahim ibn Əbdəyə itaət edilməməsindən gileylənirdi.

Bu qurumun daha yaxşı tanınması, onun imam Hadi (ə) və imam Həsən Əsgəri (ə) dövründə, qeyb əsrindəki vəziyyəti və rolu ilə tanışlıq bu quruma olan diqqəti daha da artırır. Bu baxımdan vəkalət qurumu haqqında bə'zi məsələləri araşdırmaq lazım gəlir:

«Vəkalət» kələməsinin lüğət və işlənmə mə’naları, vəkalət qurumu ilə ümumi tanışlıq;

Vəkalət qurumunun təşkil səbəbləri, qeyb dövrünün sonunadək onun fəaliyyəti;

Vəkalət qurumunun zaman və coğrafi baxımdan fəaliyyət məhdudiyyəti;

Vəkalət qurumunun vəzifələri və məs’uliyyətləri;

;Vəkalət qurumundakı vəkillərin və işçilərin xüsusiyyətləri

.İmamların əsas vəkilləri ilə tanışlıq

Bu məsələ ayrıca bir kitabın mövzusu olduğundan biz növbəti söhbətlərimizdə onları .yalnız ümumi şəkildə nəzərdən keçirəcəyik

## XÜLASƏ

Həzrət Peyğəmbərdən (s) imam Həsən Əsgəriyədək (ə) mə’sum rəhbərlər tərəfindən məhdəviyyət məsələsinin aydınlaşdırılması, həzrət Mehdi (ə) və qeyb dövrü haqqında izahlar İslam və şiə tarixinin ayrılmaz tərkib hissəsidir. Nəzərdən keçirildiyi kimi, həzrət Peyğəmbər və onun girami əhli-beyti müxtəlif rəvayətlərdə bu məsələləri işıqlandırmışlar. Biz həmin rəvayətlərdən kiçik bir hissəsini nəzərdən keçirdik və çalışdıq ki, xalqa həzrət Mehdi (ə) haqqında yetərincə mə’lumat verək. Bununla da həzrət Mehdi (ə) və qeyb məsələsi ilə bağlı şübhələri aradan qaldırmağa sə’y .göstərdik

İmam Hadi (ə) və imam Həsən Əsgərinin (ə) əsas fəaliyyətləri xalqın qeyb dövrünə hazırlanması olmuşdur. İmam Mehdinin (ə) dünyaya gəlişinin yaxınlaşması, qeyb dövrünün necəliyi haqqında xalqa agahlıq verilməsi, şiələrlə birbaşa əlaqələrin məhdudlaşdırılması imam Hadi və imam Həsən Əsgərinin əsas fəaliyyətlərindən olmuşdur. Vəkalət qurumunun qeyb dövründə roluna diqqət yetirdikdə hər iki imamın bu sahədə gördüyü işlərin əhəmiyyəti aydın olur. Növbəti fəsildə bu quruma ayrıca nəzər salacaq, onun qeyb dövründən əvvəlki və qeyb dövründəki fəaliyyətlərini .nəzərdən keçirəcəyik

## ALTINCI FƏSİL

### VƏKALƏT QURUMUNUN KEÇMİŞİ VƏ KİÇİK QEYB DÖVRÜNDƏKİ ROLU

Əvvəlki fəsildə qeyd etdiyimiz kimi, imam Hadi (ə) və imam Həsən Əsgərinin (ə) mühüm fəaliyyətlərindən biri vəkalət qurumunun gücləndirilməsi olmuşdur. Bu qurum öz fəaliyyətinə çox əvvəllər başlamışdır. Qurum imam Sadiqin (ə) öz dövründə təşkil olunmuş, digər imamların dövründə inkişaf yolu keçmişdir. Əlbəttə ki, onun .fəaliyyətləri dövrün ictimai-siyasi vəziyyətindən asılı olmuşdur

Bu qurumun ən güclü fəaliyyəti kiçik qeyb dövrünə təsadüf edir. Çünki həmin bu dövrdə şiələrlə mə'sum imam arasında yalnız uyğun qurum vasitəsi ilə əlaqə saxlanılmışdır. Ona görə də imam Hadi (ə) və imam Həsən Əsgəri (ə) şiə cəmiyyətində vəkillərin yerinin müəyyənləşdirilməsi istiqamətində ciddi sə'ylər göstərmişlər. Qurumun fəaliyyətləri ilə tanışlıq onun necə zəruri rola malik olduğunu aydınlaşdırır. Kiçik qeyb dövründə quruma həzrət Mehdinin (ə) dörd naibi rəhbərlik etmiş, müxtəlif məntəqələrdəki vəkillər şiələrə dini, ictimai-siyasi və iqtisadi sahələrdə istiqamət vermişlər. Qurumun fəaliyyətlərinin əhəmiyyətini nəzərə alaraq, onun qeyb .dövründəki tarixini müstəqil şəkildə nəzərdən keçirəcəyik

### VƏKALƏT KƏLƏMƏSİNİN MƏ'NASI VƏ VƏKALƏT QURUMU İLƏ TANIŞLIQ

Vəkalət» dedikdə hər hansı bir işin yerinə yetirilməsində acizlik səbəbindən həmin işdə» bir başqasına e'timad göstərilməsi nəzərdə tutulur. Fiqh mənbələrində vəkalət kələməsinə belə tə'rif verilir: «Vəkalət bir işin yerinə yetirilməsinin başqa birinə tapşırılması, həmin şəxsin uyğun işin icrasında naib seçilməsidir». Bir sözlə, vəkalət işin .başqa şəxsə tapşırılmasıdır

Vəkalət kələməsinin yuxarıdakı tə'riflərinə nəzər saldıqda görürük ki, vəkalətin əsasını bir işin görülməsindəki acizlik təşkil edir. Yə'ni müvəkkil (vəkil seçən) bir işi görməyə qadir olmadıqda özünə vəkil seçir. Amma insan vəkil seçməklə ona tapşırdığı işin məs'uliyyətindən azad olmur. Əgər şiə imamları özləri üçün vəkil tə'yin etmişlərsə, o, .onların öz şiələri ilə əlaqə saxlamaq imkanından məhrum olduqlarını göstərir

Vəkalət» sözünün lüğət və işlənmə mə'naları ilə tanış olduqdan sonra vəkalət qurumu»

haqqında danışıb onun xüsusiyyətlərini araşdıra bilərik. Vəkalət qurumu termini şiə imamları abbasi xəlifələri tərəfindən nəzarət altına alındıqdan sonra işlədilməyə başladı. Bu söz kiçik qeyb dövrünün sonunadək işlədilirdi. Vəkillik məsələsi böyük qeyb dövründə

fəqihlərin öhdəsində olsa da, vəkalət qurumu on bir imamın həyatı və on ikinci imamın kiçik qeyb dövrünə aid olan bir məfhumdur. Vəkalət qurumu bir-biri ilə uyuşmayan fərdi baxışlara əsaslanmamışdır. Məhz xüsusiyyətlər məcmusu səbəbindən qurum, təşkilat adının verilməsi zəruri olmuşdur. Hər hansı bir qurumun yaranması üçün onun üzvləri arasında oxşar cəhətlərin olması zəruridir. Konkret proqramın, təşkilata nəzarət edən rəhbərin, vəfalı və xalis üzvlərin mövcudluğu qurumun yaranmasının əsas səbəblərindəndir. Bundan əlavə, imamların dövrünə hakim olan şərait tələb .edirdi ki, bu təşkilat məxfi olsun, təqiyyə yolu ilə işini davam etdirsin

Bu qurum imam Sadiqin (ə) dövründə təşkil olunmuşdur. Həzrət imam şiələr arasındakı əlaqələrin möhkəmləndirilməsi üçün vəkillər tə’yin etmişdir. İmam Kazimin (ə) dövründə uyğun təşkilat daha da genişlənmişdir. İmam Rizanın (ə) dövrünün sonlarında, imam Cavad (ə) dövründə fəaliyyət genişlənmiş, qurum ardıcıl fəaliyyət göstərmişdir. İmam Hadi (ə) və imam Həsən Əsgərinin (ə) dövründə isə qurumun fəaliyyəti bir qədər də irəli gedərək, qeyb dövründə ən üstün həddinə çatmışdır. Çünki .həmin dövrdə şiələrin öz imamları ilə əlaqə vasitəsi yalnız bu qurum olmuşdur

Vəkalət qurumu beləcə öz fəaliyyətinə başladı və bu fəaliyyət kiçik qeyb dövrünün sonunadək davam etdi. İmamların vəkilləri bu qurumun üzvləri idilər. Vəkillik məqamına çatmaq üçün xüsusi şərtlər ödənilməli idi. Vəkalət məqamına seçildikdən sonra imam həmin vəkillərə müəyyən vəzifələri həvalə edirdi. Amma bu vəkillər arasında az da olsa, yolundan sapanlar tapıldı. Bə’ziləri isə yalandan vəkillik iddiasına düşdü. İmamlar çarəsiz qalaraq, beləlvaleri ilə mübarizə aparmalı olurdular. Vəkalət .qurumu ilə yaxından tanış olmaq üçün uyğun məsələləri araşdırmalı olacağıq

### ...VƏKALƏT QURUMUNUN TƏŞKİLİ SƏBƏBLƏRİ VƏ

Bu mövzu ilə bağlı əsas məsələlərdən biri imamların vəkalət qurumunu təşkil etməsinin səbəbini aydınlaşdırmaqdır. Hansı amillər səbəbindən imamların bu .məsələyə ciddi yanaşdığını, uyğun qurumu gücləndirdiyini aydınlaşdırmalıyıq

### RƏHBƏRLİK VƏ ARDICILLAR ARASINDA RABİTƏNİN ZƏRURİLİYİ

Bu qurumun təşkil olunmasının əsas səbəblərindən biri mə’sum imamla onun ardıcılları

arasında rabitənin zəruri olmasıdır. İstənilən bir dini, siyasi, ictimai quruluşda rəhbərlə üzvlər

arasında əlaqə olması zəruridir. Buna görə də belə bir rabitəni tə’min edəcək nümayəndələrin tə’yin olunması zəruri olmuşdur. İslam dünyasının genişliyinə, dünya müsəlmanlarının İraq, Hicaz, İran, Yəmən, Misir və digər məntəqələrə yayılmasına nəzər saldıqda uyğun qurumun necə böyük rola malik olduğu aydınlaşır. Şübhəsiz ki, bütün şiələrin Mədinəyə və ya imamların yaşadığı mərkəzlərə səfər etmək imkanı olmamışdır. Ona görə də imamların e’tibarlı saydığı nümayəndələr dünyanın müxtəlif .məntəqələrində imamla onun ardıcılları arasındakı əlaqəni tə’min etmişlər



## ABBASİLƏRİN TƏZYİQLƏRİ, ŞİƏLƏRİN VƏ ŞİƏ MƏKTƏBİNİN İMAM TƏRƏFİNDƏN QORUNMA ZƏRURƏTİ

Qeyd etməliyik ki, düşmənlərin heç bir maneçiliyi olmadığı halda da imamla şiələr arasında rabitə yaratmaq çətin bir iş idi. Həmin dövrün rabitə və nəqliyyat vasitələri uzaq məntəqələrdə yaşayan insanların əlaqə saxlamasını çətinləşdirdi. Əgər azad bir şəraitdə belə bir rabitənin yaradılması mümkünsüz idisə, şübhəsiz ki, Abbasilərin təzyiqləri bu işi daha da çətinləşdirirdi. İmamları nəzarət altında saxlayan Abbasilər onların bütün hərəkətlərini izləyirdilər. Saysız-hesabsız casuslar ordusu şiələri bir an olsun belə gözdən kənar qoymurdular. Belə bir şəraitdə imamlarla şiələr arasındakı rabitəni qorumaq, ən əsası İslam məktəbini hifz etmək üçün vəkalət qurumunun müstəsna rolu vardı. Yarandığı gündən kiçik qeyb dövrünün sonunadək vəkalət qurumunun gizli fəaliyyət göstərdiyinə şahid oluruq. Çünki bu qurumun vəzifəsi təkcə şər’i ödəncləri, zəkatları toplamaqdan ibarət deyildi. Vəkalət qurumunun təşkil olunmasının əsas səbəbi Abbasilərin təzyiqləri olmasa da, bu təzyiqləri həmin qurumun fəaliyyətlərinin güclənməsi amili kimi qəbul etmək olar. Ona görə də imam Kazim (ə) və imam Hadinin (ə) dövrlərində uyğun fəaliyyətlərin güclənməsinə şahid .oluruq

### ŞİƏLƏRİN KİÇİK QEYB DÖVRÜNƏ HAZIRLANMASI

Şübhəsiz ki, vəkalət qurumunun yaranmasının əsas səbəblərindən biri şiələrin qeyb dövrünə hazırlanması idi. Uyğun dövrdə şiələr yalnız vəkillər və səfirlər vasitəsi ilə öz imamları ilə əlaqə saxlaya bilirdilər. Qeyb dövrü yaxınlaşdıqca şiələrin öz imamları ilə

rabitə saxlaması da problemə çevrilirdi. Bununla yanaşı, vəkalət qurumu da güclənirdi və imam Hadi (ə) və imam Həsən Əsgərinin (ə) dövründə bir çox işlər bu qurumun üzərinə düşürdü. İmam Hadi (ə) və imam Həsən Əsgərinin (ə) dövrlərində bu qurumun .güclənməsinin əsas səbəbi kimi şiələrin qeyb əsrinə hazırlanmasını göstərmək olar

Kiçik qeyb dövründə imam tam şəkildə məxfi olduğundan vəkalət qurumuna daha böyük ehtiyac duyulurdu. Çünki şiələrin öz imamları ilə əlaqə saxlaması yalnız səfirlər və vəkillər vasitəsi ilə mümkün idi. Həmin dövrdə şiələr öz ictimai-siyasi, ideoloji, iqtisadi çətinliklərinin həllində yalnız səfirlərə müraciət edə bilərdilər. Eləcə də imamlar həbsdə və ya ciddi nəzarət altında olduğu vaxt şiələr öz vəzifələrini vəkillərdən öyrənə .bilərdilər



## VƏKALƏT QURUMUNUN FƏALİYYƏTİNİN ZAMAN VƏ COĞRAFİ BAXIMDAN MƏHDUDLUĞUNUN ARAŞDIRILMASI

Deyildiyi kimi, vəkalət qurumu vahid rəhbərlik altında proqramlaşdırılmış, fəaliyyətlər məcmusu deməkdir. Vəkalət qurumu dedikdə cüz'i, fərdi və ya şəxsi vəkillik nəzərdə tutulmur. Vəkillik məsələsinin tarixi həzrət Peyğəmbərdən başlayır. Həzrət peyğəmbərin, imam Əlinin (ə) və digər imamların hələ imam Sadiqə (ə) qədər nümayəndələri vardır. Amma imam Sadiqədək (ə) mövcud olan şərait vəkalət .qurumunun mövcudluğunu zəruri etmirdi

Bu qurumun imam Sadiq (ə) və ya imam Kazimin (ə) dövründən fəaliyyətə başlaması haqqında alimlər arasında müxtəlif rə'ylər var. Bə'zilərinin nəzərincə, qurum geniş proqramlarla imam Kazimin (ə) dövründə fəaliyyətə başlamışdır. Hətta imam Sadiqin (ə) vəkillərinin olmasını inkar edənlər də var. Məsələn, Əbdürrəhman ibn Əlhəccac «Əl-ğeybət» kitabında bə'zilərinin imam Sadiqə (ə) aid etdiyi vəkillərin imam Kazimin (ə) vəkilləri olduğunu bildirir. Hətta imam Sadiqə (ə) vəkil olduğu üçün şəhadətə çatan .Müəlla ibn Hünəysin imamın təkcə sadə məsələlərdə vəkili olduğu bildirilir

Başqa bir qrup alimin fikrincə isə, vəkalət qurumunu ilkin tə'sis edən imam Sadiq (ə) olmuşdur. Onlar bunu da inkar etmirlər ki, bu qurum imam Kazimin (ə) dövründə .xüsusi ilə güclənmişdir

Bizim mənbələrdə imam Sadiqin (ə) vəkillərinin olduğu bildirildiyindən ikinci baxışı daha əsaslı hesab edə bilərik. Əbdürrəhman ibn Əlhəccac, Müəlla ibn Hunəys, Nəsr ibn

Qabus Ləhmi və başqa vəkillərin fəaliyyəti göstərir ki, imam Sadiqin (ə) belə bir qurum yaratmağa şəraiti olmuşdur. Çünki imam Sadiqin (ə) dövrü heç də imam Kazimin (ə) dövründən sıxıntılı olmamışdır. Biz imam Kazimin (ə) dövründə uyğun qurumun daha geniş fəaliyyət göstərdiyini görürük. Amma bu, o demək deyildir ki, imam Sadiqin (ə) dövründə belə bir qurum olmamışdır. Bə’zi rəvayətlərdən mə’lum olur ki, imamla ən ucqar nöqtədə yaşayan şiələr arasında rabitə olmuşdur. Məsələn, abbasi Mənsurun şiə adı ilə Xorasana, imam Sadiqin (ə) yanına

casus göndərməsi və bu yolla onun əlaqələrini öyrənmək istəməsi yuxarıda deyilənlərə sübut ola bilər. Demək, vəkalət qurumunun imam Sadiqin (ə) dövründə fəaliyyətə başladığını qəbul edə bilərik. Bu qurumun fəaliyyəti bə’zən güclənib, bə’zən zəifləsə də, heç zaman dayanmamışdır. Kiçik qeyb dövründə isə bu fəaliyyətlər xüsusi ilə güclənmişdir. Çünki həmin vaxt şiələrin yeganə ümid yeri imamın vəkilləri və naibləri olmuşdur. Bu fəaliyyət dördüncü səfir vəfat edən tarixədək (hicri ۳۲۹-cu il) davam etmişdir. Həmin vaxtdan böyük qeyb dövrü başlamış və həzrətin vəkalət qurumu vasitəsi ilə əlaqələri başa çatmışdır. Böyük qeyb dövrünün başlaması ilə vəkillərin vəzifəsi cameüş-şərait fəqihlərin üzərinə düşmüşdür. Fəqihlər ümumi şəkildə imamın vəkilləri sayılsalar da, imamla birbaşa əlaqə saxlamadıqlarından onları vəkalət qurumuna aid etmək olmaz. Demək, vəkalət qurumu imam Sadiqin (ə) .dövründən başlayaraq kiçik qeyb dövrünədək fəaliyyət göstərmişdir

Bəs bu qurumun fəaliyyətinin coğrafi tə’sir dairəsi haqqında nə demək olar? E’tiraf etməliyik ki, bu qurumun fəaliyyəti dövründə şiələr dünyanın Xorasan, Sistan, Həmədan, Əhvaz, Bəsrə, Kufə, Bağdad, Samirra və başqa bu kimi uzaq məntəqələrinə yayılmışdılar. Görünür ki, uyğun qurumun fəaliyyəti bu məntəqələri əhatə etmişdir. Çünki uzaq nöqtələrdə yaşayan şiələr imamla əlaqə saxlamağa çətinlik çəkirdilər. Demək, vəkalət qurumu şiələrin yaşadığı ən uzaq məntəqələrdə də fəaliyyət göstərmişdir. İlkin tarixi mənbələrimizdə və rical kitablarında hər biri hansısa fəaliyyətlərlə məşğul olan vəkillərdən danışılır. Tarixi faktlara əsaslanaraq bə’zi fəal .vəkillər haqqında danışacağıq

## HİCAZ

Şiə imamlarının öncə sakin olduğu əsas şəhər Mədinə olduğundan və onlar yalnız məcbur olduqda bu şəhəri tərk etdiklərindən vəkalət qurumunun ilkin köklərini də orada axtarmaq lazımdır. Muəlla ibn Kunəys, Nəsr ibn Qabus imam Sadiqin (ə) Mədinə və onun ətrafındakı vəkilləri idilər. Muəlla ibn Kunəys məhz imam Sadiqin (ə) vəkili olduğu üçün abbasi hökumətinin rəislərindən olan Davud ibn Əli tərəfindən həbs edildi və şəhadətə çatdırıldı. İbn Tavusun bildirdiyinə görə, Muəlla imam Sadiqin (ə) ən məşhur vəkillərindən olmuşdur. Əksər şiələr öz şər’i ödənclərini ona təhvil verərmişlər. Şeyx Tusinin bildirdiyinə görə Nəsr ibn Qabus da iyirmi ilə qədər imam Sadiqin (ə) vəkili

.olmuşdur. Hansı ki onun bu vəkilliyi yalnız bir qrup adama mə’lum idi

İmam Kazimin (ə) dövründə Yunis ibn Yə’qub, Müfəzzəl ibn Ömər Cö’fi həzrətin

Mədinədəki vəkillərindən idilər. Müfəzzəl ibn Ömər vəkillər arasında böyük sayılırdı və .həzrətin əmri ilə digər vəkillər ona müraciət edirdilər

İmam Rizanın (ə) dövründə Hişam ibn İbrahim Abbasi Həmədani Raşidi həzrətin Mədinədəki baş vəkili idi. Kiçik qeyb dövründə Əbu-Əl-Məhəmməd ibn Əhməd ibn .Həmmad Mürəvvizi Məhmudi vəkil olaraq Mədinədə fəaliyyət göstərirdi

Məkkə də vəkalət qurumunun fəaliyyət dairəsinə daxil idi. İmam Hadinin (ə) məşhur vəkili Əli ibn Cə’fər Həmani Mütəvəkkilin həbsindən azad olduqdan sonra Məkkəyə üz tutdu və orada yaşamağa başladı. O öz vəkillik fəaliyyətini Məkkədə davam etdirirdi. Kiçik qeyb dövrünün başlanğıcında Misirdəki vəkillərdən də biri Məkkəyə gəldi. O, Məkkədəki vəkillərlə görüşüb Samirradakı vəziyyəti öyrənmək üçün oraya bir şəxs göndərdi. Həcc zamanı Məkkə müxtəlif məntəqələrdən gəlmiş vəkillərin görüş yeri .olurdu

Uyğun dövrün tarixini vərəqlədikdə mə’lum olur ki, Yəməndə də şiələr yaşayırmış və bu şəhər vəkalət qurumunun əhatə dairəsində imiş. Həsən ibn Fəzl Yəmaninin Yəməndə vəkil olduğu ehtimal edilir. Bundan başqa Yəmən əhalisi bə’zən vəkalət qurumunun rəhbərləri ilə görüşə gedər və şər’i ödənclərini onlara təhvil verərdilər. Nümunə olaraq, Yəmən əhalisindən olan bir qrupun imam Həsən Əsgəri (ə) ilə görüşünü xatırlaya bilərik. Bu görüşdə imam Həsən Əsgəri (ə) Osman ibn Səid Əmrini onlara tanıtdırdı və göstəriş verdi ki, həmin vaxtdan başlayaraq Osmanla əlaqə .saxlasınlar

## İRAQ

Kufə mühüm şiə məntəqələrindən idi və bu şəhərdə imamların vəkilləri fəaliyyət göstərirdi. İmamların həyatı dövründə bu şəhərdə Əbdürrəhman ibn Əlhəccac, Əli ibn Yəqtin, Əli ibn Əbu Həmzə Bətaini, Həyyan Sərrac, Ziyad Qəndi, Əyyub ibn Nuh, Asimi .imamın səfiri kimi fəaliyyət göstərirdilər

Əbdürrəhman ibn Əlhəccac imam Cavadın (ə) dövrünədək Bağdad şəhərində fəaliyyət göstərmişdir. İmam Hadinin (ə) dövründə Əli ibn Əl Hüseyn ibn Əbdürrəbbə, ondan .sonra Əbu Əli ibn Raşid imamın Bağdadda və Mədinədə vəkili olmuşlar

İmam Həsən Əsgərinin (ə) dövründə Ürvə ibn Yəhya («Dehqan») imamın vəkili ünvanı ilə Bağdadda fəaliyyət göstərmiş, amma sonradan xəyanətə yol vermişdir.

Bağdad bütün kiçik qeyb dövründə dörd naibin yaşadığı mərkəz olmuş və şiələr bu dörd naibə müraciət etmişlər. İlk səfir imamın əmri ilə öz fəaliyyət yerini Bağdada köçürmüşdür. Orada ona Məhəmməd Qəttan, Haciz ibn Yəzid, Əhməd ibn İshaq idarə

işlərində yardım göstərmişdir. Birinci səfirdən sonra övladı Məhəmməd ibn Osman Bağdadı vəkalət mərkəzi qərar vermiş və bu şəxsin on nəfər köməkçisi olmuşdur. Hüseyn ibn Ruh imamın əmri ilə üçüncü naib seçilmişdir. O da Bağdadda məxfi fəaliyyət göstərmiş, şiələrlə imam arasında rabitəni tə’min etmişdir. Hüseyn ibn .Ruhdan sonra dördüncü səfir də Bağdadda fəaliyyət göstərmişdir

İmam Hadi (ə) və imam Həsən Əsgərinin (ə) dövründə Samirra vəkalət qurumu üçün mərkəz olmuş və hər iki imam tərəfindən nəzarətdə saxlanılmışdır. Sonradan xəyanət yolunu tutmuş Fars ibn Hatəm Qəzvini, eləcə də, Əli ibn Cə’fər Hamani imam Hadinin (ə) Samirrada vəkilləri olmuşlar. Həmədanadək bütün mərkəzi İran əhalisi öz şər’i ödənclərini Fars ibn Hatəmə təqdim etmişlər. Sonradan o imamın digər vəkili Əli ibn Cə’fər Həmani ilə düşmənçilik edərək yolunu azmış və imam tərəfindən rədd .edilmişdir

Samirra kiçik qeyb dövrünün əvvələrinədək imam Hadi (ə) və imam Həsən Əsgərinin (ə) fəaliyyət məkanı kimi tanınmışdır. Amma müəyyən səbəblərdən dörd naibin fəaliyyət yeri Samirradan Bağdada köçürüldü. Kiçik qeyb dövrünün bir hissəsini .Samirrada yaşayan imam (ə) dörd nümayəndəsini oradan idarə edirdi

İmamların vəkillərinin sakin olduğu məntəqələrdən biri də Vasət idi. İmam Kazimin (ə) vəkili Həsən ibn Qiyamə, kiçik qeyb dövrü zamanı vəkil Həsən ibn Məhəmməd ibn .Qəttah Sidlani bu məntəqədə fəaliyyət göstərirdilər

Bəsrə Əhvazdakı vəkilin fəaliyyət dairəsinə daxil olsa da, bu şəhərə xüsusi nümayəndə göndərilməsi barədə mə’lumatlar var. Məsələn, Əbu-Əmr Həzzanın .Bəsrədə vəkil olduğu bildirilir

**İRAN**

İranda şiə məntəqələrinin çoxluğu nəzərə alındığından əksər məntəqələrdə vəkalət .qurumu fəaliyyət göstərirdi

O dövrdə Xorasan məntəqəsinə əhalisi şiə olan Nişabur, Səbzevar, Buxara, Səmərqənd, Hərat və digər şəhərlər daxil idi. Amma tarixi mənbələrdə həmin dövrdə Xorasandakı vəkillər haqqında olduqca az mə’lumat verilmişdir. Mənbələrdə Fəzl ibn

Sənanın həzrət Rizanın (ə) Nişaburda, İbrahim ibn Əbdənin imam Həsən Əsgərinin (ə) Nişaburda və sair şəhərlərdə vəkili olduğu bildirilir. Eləcə də, Əyyub ibn Nab həzrətin .vəkili kimi Nişabura göndərilmişdir

Kiçik qeyb dövründə Məhəmməd ibn Şazan ibn Nüim Şazani Nişaburda, Əli ibn Əl-Hüseyn

ibn Əli Ət-Təbəri Səmərqənddə vəkil olmuşdur. Əbu-Əli Bağdadi adı ilə tanınan .Hüseyn ibn Əli ibn Məhəmməd Qummi Buxarada vəkillik vəzifəsini yerinə yetirmişdir

Qum şiə mərkəzi olduğu üçün vəkalət qurumunun burada fəaliyyəti daha güclü olmuşdur. Bu məntəqədə imamların vəkilləri öz işlərini layiqincə yerinə yetirmişlər. Mənbələrdə bildirildiyinə görə, bu məntəqələrdə Əbdül Əziz ibn əl Mühtədi imam Rizanın (ə) Qumda, Zəkəriyya ibn Adəm imam Cavadın həmin şəhərdə vəkilləri olmuşlar. İbn Şəhr Aşubun bildirdiyinə görə Yəhya ibn İmran Qumda vəkillik vəzifəsini .icra etmişdir

Məhəmməd ibn Əhməd ibn Cəfər Əl-Qummi Əl-Əttar bu məntəqədə imam Həsən Əsgərinin vəkili olmuşdur. İmam Həsən Əsgərinin başqa bir vəkili Əhməd ibn İshaq Qummi kiçik qeyb dövründə Qumda vəkillik vəzifələrini icra etmişdir. Əhməd ibn Həmzə ibn Əl-Yəs' əl-Qummi kiçik qeyb dövründə bu məntəqədə həzrət Mehdinin (ə) .nümayəndəsi kimi tanınmışdır

Rey şəhərində şiələrin çox olmasına baxmayaraq kiçik qeybədək olan dövrdə bu şəhərdəki vəkillər haqqında mə'lumat verilmir. Kiçik qeyb dövründə isə Əbül-Hüseyn, Məhəmməd ibn Cə'fər Əsədi Reydə vəkil olmuşdur. Səduqun rəvayət etdiyinə görə Reydəki vəkillərdən biri də Bəssami olmuşdur. Bu şəxs həzrət Mehdinin (ə) çöhrəsini .görməyə müvəffəq olmuşdur

Əvvəldə qeyd etdik ki, Faris ibn Hatəm Qəzvini imam Hadinin (ə) vəkili idi. O, Samirradan əlavə, ehtimal ki, Qəzvində də fəaliyyət göstərirmiş. Tarixi mənbələrdə Əbu Cə'fər, Əbdüllah Əbu Ğani Qəzvini Qəzvində həzrət Mehdinin (ə) nümayəndəsi .(«Babul-Məhdi») kimi yad edilir

Həmədan İranın əhalisi şiə olan mühüm məntəqələrindən idi. Təbii ki, imamların vəkilləri bu məntəqədə də fəaliyyət göstərmişlər. İbrahim ibn Məhəmməd Həmədaninin ailəsi imam Rizanın (ə) dövründən imam Əsrin (ə) dövrünədək bu məntəqədə tanınmış vəkillər olmuşdur. O özü imam Cavadın (ə) Həmədandakı mühüm vəkillərindən sayılır. Bu şəxs ətraf məntəqələrə də nəzarət edirmiş. Nəcaşinin nəql etdiyinə görə, Qasim ibn Məhəmməd ibn Əli ibn İbrahim ibn Məhəmməd Həmədanda vəkil olmuş, Əbu Əli, Əziz ibn Züheyr də bu məntəqədə vəkillik fəaliyyəti göstərmişlər.

Onların üzərində Həsən ibn Harun rəhbərlik etmişdir. Həsən ibn Harundan qabaq onun .atası Harun ibn İmran bu nahiyədə baş vəkil olmuşdur

İmam Həsən Əsgərinin (ə) dövründə və qeyb dövründə Məhəmməd ibn Saleh və onun .atası bu məntəqədə vəkillik fəaliyyəti göstərmişlər

Həzrət Mehdinin (ə) Azərbaycan məntəqəsində vəkili Qasim ibn Əl-Ə’la olmuşdur. Onun vasitəsi ilə şiələrə bir sıra yardımlar göstərilmişdir. O, İbn Ruhun vaxtınadək bu nahiyədə fəaliyyət göstərmişdir. Qasim dünyasını dəyişdikdən sonra onun işini oğlu .davam etdirmişdir

Mənbələrdə imamların Əhvaz məntəqəsindəki vəkillərinin də adı çəkilir: Əbdüllah ibn Cündəb imam Kazimin (ə) və imam Rizanın (ə) Əhvazdakı vəkili olmuşdur. Əli ibn Məhzyar Əhvazi üç imam tərəfindən bu məntəqədə vəkil tə’yin edilmişdir. Digər bir vəkil İbrahim ibn Məhzyar vəkillər arasında xüsusi hörmət sahibi olmuşdur. O imam Hadinin (ə) dövründən başlayaraq, kiçik qeyb dövrünədək vəkillik fəaliyyəti göstərmişdir. Onun ardınca övladı Məhəmməd ibn İbrahim kiçik qeyb dövründə .atasının işini davam etdirmişdir

Bə’zi mənbələrdə bildirilir ki, Misir də şiələrin sakin olduğu bir məntəqə kimi vəkalət qurumunun nəzarəti altında olmuşdur. Osman ibn İsa Rəvasinin Misirdə imam Kazimin (ə) vəkili olduğu bildirilir. Eləcə də, Şəfi Xadim bu məntəqədə imam Həsən Əsgərinin (ə) .vəkili olmuşdur

Vəkalət qurumunun fəaliyyət dairəsi haqqında ötəri söhbətimizdən aydın olur ki, bu təşkilat məxfi olmasına baxmayaraq, çox geniş əraziləri əhatə etmişdir. Bu qurum öz fəaliyyətləri ilə dünya şiələrinin Mədinə, Samirra və ya Bağdaddakı rəhbərliklə .rabitələrini tə’min etmişdir

## VƏKALƏT QURUMUNUN VƏZİFƏLƏRİ

Tarixi mənbələrdən belə mə’lum olur ki, vəkalət qurumunun fəaliyyət istiqamətləri rəngarəng olmuşdur. Bə’ziləri qurumun fəaliyyətinin yalnız zəkat və sair ödənclərin toplanmasından ibarət olduğunu iddia etsələr də, bu qurumun başqa fəaliyyətlər göstərməsi haqqında da mə’lumatlar vardır. Bəli, dini ödənclərin toplanması bu qurumun əsas işlərindən olmuşdur. Vəkalət qurumunun işinə dərindən nəzər saldıqda .onun başqa fəaliyyətlərlə də məşğul olmasına şübhə qalmır

Tarixi mə’lumatlardan bəlli olur ki, təşkilatın siyasi fəaliyyətləri də olmuşdur. Axı siyasi fəaliyyəti olmayan bir təşkilat hökumət tərəfindən nə üçün bir bu qədər tə’qib edilməli

idi?! İmamların təşkilatı və onun fəaliyyətlərini gizli şəkildə saxlaması bir daha göstərir ki, onun fəaliyyətlərində siyasi yönümlər olmuşdur. Əslində şər'i ödənclərin, xüms və zəkatın toplanması da iman cəbhəsinin güclənməsinə xidmət edirdi. Vəkalət qurumunun dini, mə'nəvi, ictimai-siyasi fəaliyyətlərdən uzaq olmasını iddia etmək .düzgün olmazdı. Hər halda bu təşkilatın fəaliyyətləri ilə tanış olmaq yaxşı olar

Bu qurum tə'sis olunduğu gündən onun vəkilləri xüms, zəkat və bu kimi başqa şər'i ödəncləri toplamağa başladılar. Müəlla ibn Kunəysin imam Sadiq (ə) tərəfindən Mədinədə vəkil tə'yin olunması bildirilir. Onun şiələrdən xüms-zəkat toplaması Abbasiləri qəzəbləndirdi və onu şəhadətə yetirdilər. Xəlifə Mənsur Müəllanı ittiham .edirdi ki, o uyğun büdcəni hakimiyyətə qarşı qiyam məqsədi ilə toplayır

İmam Kazimin (ə) dövründə vəkillərin fəaliyyəti daha da genişlənmişdi və imam Sadiqin (ə) dövründəkindən daha artıq büdcə toplanırdı. Toplanmış ödənclərin böyük məbləğ təşkil etməsi imamın şəhadətindən sonra bə'zi vəkillərin xəyanətinə səbəb oldu. Onlar imam Rizanın (ə) imamətini inkar etmək dərəcəsində yollarını azdılar və ixtiyarlarında olan büdcəni öz məqsədlərinə sərf etdilər. Sonrakı dövrlərdə vəkalət qurumunun işi nizama salındı, şər'i ödənclər dəqiq şəkildə toplanmağa başladı. Vəkillərin şiələrdən topladığı ödənclər, adətən, zəkatdan, hədiyyələrdən, sədəqələrdən, nəzirlərdən, xümsdən ibarət olurdu. Şər'i haqları ödəməkdə süstlük göstərən şiələrə xəbərdarlıq edilirdi. Məsələn, imam Həsən Əsgərinin (ə) dövründə Nişabur şiələrindən bə'ziləri xüms ödəməkdən boyun qaçırdıqda həzrət onlara bir məktubla müraciət etdi. O, şiələrə müraciətinin səbəbini belə izah edirdi: «Əgər onların .«axirət səadətləri bundan asılı olmasaydı, heç vaxt israr etməzdim

Kiçik qeyb dövründə şər'i haqların şiələr tərəfindən daha kütləvi şəkildə ödəndiyinə şahid oluruq. «Vəsailüş-şiə» kitabında bunun səbəbi belə açıqlanır: «Həmin əsrdə xümsün daha çox ödənməsinin səbəbi şər'i haqların yığılmasına cavabdeh olan vəkillərin varlığı idi. Belə ki, çoxsaylı ehtiyaclılar vardı və onların ehtiyaclarının «.ödənməsi imama vacib idi

Yə'ni, Müqəddəs nahiyə tərəfindən, İslam dünyasının ən ucqar nöqtələrindən dörd naibdən əlavə çoxsaylı vəkillər olmuşdur. Şiələrin xüms-zəkat ödəmək üçün heç bir üzrü olmamışdır. Həzrətin vəkilləri fəaliyyət göstərdiyindən imama əl çatmadığı barədə bəhanələr qəbul edilməmişdir. Qeyb dövründə vəkillər tərəfindən şər'i haqların qəbul edilməsində bə'zən kəramətlər də görünmüşdür. Bu kəramətlərin, mö'cüzəli halların səbəbi vəkil və naiblərə inamın yaradılması olmuşdur. Məsələn,

toplanmış həftəlik məbləğ Məhəmməd ibn İbrahim ibn Məhzyar tərəfindən imamın göndərdiyi şəxsə verilərkən göndərilmiş adam həmin mal və məbləğin gizli xüsusiyyətlərini sadalamışdır. Bu sayaq xüsusiyyətlər Əhməd ibn Məhəmməd .Dinvəridə də müşahidə edilir

Hüseyn ibn Ruh Növbəxti haqqında rəvayət olunmuşdur ki, bu vəkil iranlı qadından xüms-zəkat alarkən onunla səlis avəci ləhcəsində (qadının yerli ləhcəsində) .danışmışdır

Kiçik qeyb dövrünün müəyyən mərhələlərində dini ödənclər qəbul olunarkən qəbz verilməmişdir. Bunun səbəbi Abbasilərin nəzarətindən yayınmaq məqsədi ola bilər. Məhəmməd ibn Osman Əmri də öz səfirliyinin son dövrlərində siyasi vəziyyət ağır olduğundan qəbul etdiyi dini vergilər müqabilində heç bir qəbz verməmişdir. Hətta bə'zi insanlar xüms-zəkatı əvvəlcədən razılaşdırılmış bir yerdə qoymuş və sonradan nümayəndə gəlib onu götürmüşdür. İkinci səfirin dövründə onun köməkçilərindən olan Hüseyn ibn Ruh şər'i ödənci qəbul etdikdən sonra qəbz vermədiyi üçün məsələ səfirin hüzurunda müzakirə olunmuş və səfir ibn-Ruhun bu işini müdafiə edərək, şər'i ödənc .verən şəxsə anlatmışdır ki, siyasi vəziyyət ağır olduğundan belə rəftar edilir

Müsəlman xalqın imamlara təqdim etdiyi dini haqlar müxtəlif istiqamətlərdə xərclənilirdi. Dini büdcənin bir hissəsi rəhbərlik işinin idarəsinə, başqa bir hissəsi müsəlmanların ehtiyaclarına sərf olunurdu. Uyğun büdcə vasitəsi ilə şiələrin bir çox .problemləri aradan qaldırılırdı

Birinci və ikinci səfirin dövründə təhlükəsizlik məqsədi ilə dini haqlar çox məxfi şəkildə ünvanına çatdırılırdı. Osman ibn Səid əmri imam Həsən Əsgərinin (ə) dövründə yağ satmaqla məşğul olduğundan həmin pulları yağ qablarında yerləşdirərdi. İmama ünvanlanmış məktublar və dini ödənclər yağ qablarında gizlədilmiş şəkildə imama göndərilərdi. İkinci səfirin köməkçilərindən olan Məhəmməd ibn Əhməd ibn Cə'fər Qəttan parça satmaqla məşğul olduğundan imama çatası əmanətləri parça toplarının .arasında gizlədərdi

## VƏQFLƏR

İran, İraq və sair məntəqələrdə yerləşən vəqf edilmiş mülk və torpaqlara vəkillər nəzarət edirdi. Qumdakı vəqf torpaqlara Məhəmməd ibn İshaq Qummi, Vasətdəki .torpaqlara Həsən ibn Məhəmməd ibn Qəttah Sidlani nəzarət edirdi

## MÜXALİFLƏRLƏ MÜBAHİSƏLƏR

Vəkalət qurumunun əsas fəaliyyətlərindən biri şiələrin öz dini vəzifələri ilə tanış edilməsi idi. Şübhəsiz ki, imamlar tərəfindən müəyyən məntəqələr tə’yin olunmuş nümayəndələr mə’rifət və agahlıq baxımından başqalarından üstün olurdular. Şiələr, adətən, öz sualları ilə bu vəkillərə müraciət edirdilər. Bəlkə də, vaqifiyyə məzhəbinin yaranmasının da səbəbi elə bu olmuşdur. İmamın nümayəndəsi olduğu üçün xalq arasında

hörmət qazanmış bə'zi vəkillər, o cümlədən, imam Kazimin (ə) bə'zi vəkilləri uyğun .məzhəbin başçıları olmuşlar

İmam Riza (ə) şəhadətə çatdıqdan sonra imamiyyə məzhəbinin səksənə yaxın başçısı Bağdadda İraqın baş vəkili Əbdür-Rəhman ibn Əlhəccacın evində toplaşdılar. Həzrət Cavad (ə) çox gənc olduğundan məclisdəkilər arasında onun imaməti haqqında tərəddüd edənlər vardı. Bir müddət sonra imam Cavad (ə) dünyasını dəyişdikdə şiə başçıları imamın nümayəndəsi Məhəmməd ibn əl-Fərəcin evində toplanıb imam .Hadinin (ə) imaməti haqqında mübahisəyə başladılar

Kiçik qeyb dövründə şiələr yeni bir şəraitlə üzləşdiklərindən və mə'sum imamla bir başa əlaqə saxlaya bilmədiklərindən daha çox heyrət və tərəddüd keçirirdilər. Belə bir məqamda da vəkalət qurumu müstəsna rol oynayır, insanları doğru yola yönəldirdi. Məsələn, həzrət höccətin (ə) birinci naibinin vəfatından sonra çaşqınlıq içində qalmış xalqı ikinci naib Əbu-Cə'fər Əmri doğru yola yönəltmişdi. Əbül-Abbasla bağlı əhvalat .deyilənləri bir daha təsdiq edir

Çoxsaylı dəlillərə əsasən, imamlar onlardan uzaq düşmüş şiələri vəkillər vasitəsi ilə doğru yola hidayət edirdilər. Məsələn, imam Hadi (ə) Əhməd ibn İshaq Qummiyə .tapşırır ki, əlaqə saxlamaq mümkün olmadıqda Osman ibn Səid Əmriyə müraciət etsin

Xüsusi ilə qeyb dövründə vəkillər və naiblər əqidə məsələlərini açıqlamağa vəzifəli idilər. Məsələn, şiələr həzrət Höccətin (ə) naibi Əmridən Müfəvvizə əqidəsi haqqında soruşduqda Əmri bildirir ki, ruzi məsələsi Müfəvvizə məzhəbindən olanların iddia etdiyi kimi imamlara yox, Allah-təalanın müqəddəs zatına aid olan işdir. Həmçinin, bir şiə Hüseyn ibn Ruh Növbəxtidən düşmənin həzrət Hüseyn (ə) üzərində qələbəsi haqqında soruşduqda Hüseyn ibn Ruh ətraflı və qənaətbəxş bir cavab verir. Rəvayətçi bu barədə deyir: «Mən onun bu cavabı özündən verməsi haqqında tərəddüddə idim. Amma bu barədə fikrimi açıqlamamış, o üzünü mənə tutub dedi ki, dediklərimi həzrət .«Höccətdən eşitmişəm

Əlbəttə ki, müxaliflərlə mübahisə, haqqın üzə çıxarılması təkcə vəkillərin işi deyildi. Amma bu iş bə'zən vəkillərə tapşırılırdı. Məsələn, imam Sadiqin (ə) və sonrakı üç imamın vəkili olmuş Əbdür-Rəhman ibn əl-Həccac imam Sadiq (ə) tərəfindən Mədinə

.əhli ilə danışıqlara göndərilir

İmamların vəkilləri bə’zən şübhə və tərəddüdləri aradan qaldırmaq üçün mö’təbər şiə mühəddislərinin köməyindən faydalanırdılar. Məsələn, Hüseyn ibn Ruh Növbəxti e’tibarlı olması şübhə doğuran bir kitabı Qum mühəddislərinə göndərir və bu kitab haqqında onların

nəzərlərini bilmək istəyir. Onu da qeyd edək ki, imamların vəkillərinin vəzifəsi təkcə e'tiqadi problemləri aradan qaldırmaq deyildi. Şiələr onlara şəxsi məsələləri ilə də bağlı .müraciət edirdilər

## VƏKALƏT QURUMUNUN SİYASİ ROLU

Bu qurum zahirən xüms-zəkat və digər dini ödənclərin toplanması məqsədi ilə təşkil olunsa da, onun siyasi fəaliyyəti tarixi gerçəklikdir. Hətta bu siyasi fəaliyyətlər olmasaydı da, dini ödənclərin toplanması Abbasilərin nəzərincə siyasi fəaliyyət sayılırdı. Unutmamalıyıq ki, xəlifə Mənsur və Harun imam Sadiq və imam Kazimi məhz dini ödənclərin toplanmasına görə ittiham edirdilər. Onlar bu işin Abbasilər hökumətinin ziddinə yönəldiyini düşünürdülər. Mütəvəkkil də imam Hadini (ə) uyğun məsələyə görə ittiham etmişdir. O, imam Hadinin (ə) vəkillərinin fəaliyyətindən xəbərdar olduqdan sonra qurumu dağıtmaq və onun üzvlərini həbs etmək qərarına gəlmişdi. Hətta vəkillərin yaxın adamları həbs olunurdu. Vəkillərə uyğun işdə yardımçı olan Əbu Əli ibn Raşid, İsa ibn Asim, İbn Bənd şəhadətə yetirilmişdilər. Vəkalət qurumu üzvlərinin Abbasilər tərəfindən tə'qib olunması uyğun qurumun siyasi fəaliyyət göstərməsinin sübutudur. Əgər bu qurumun siyasi rolu yox idisə, nə üçün abbasi xəlifələri bir bu qədər narahat olurdular?! Uyğun siyasi fəaliyyətin digər bir dəlili qurumun təqiyyəyə əməl edərək, öz fəaliyyətini gizli şəkildə aparması idi. Əgər qurum .hakimiyyət tərəfindən sıxıntılara mə'ruz qalmasaydı, daha böyük işlər görülərdi

## VƏKALƏT QURUMUNUN ƏLAQƏLƏNDİRMƏ FUNKSİYASI

Vəkalət qurumunun təşkilinin səbəbləri bəhsində deyildi ki, bu qurumun yaranmasının əsas amillərindən biri onun şiələrlə imam arasında əlaqə yaratması idi. Ucqar nöqtələrdə yaşayan və öz imamları ilə bircə dəfə də olmuş olsa görüşə bilməyən şiələr vəkillərə müraciət edərək öz dini ehtiyaclarını aradan qaldırırdılar. Onlar dini ödəncləri vəkillərə təqdim edir, şər'i sualları ilə onlara müraciət edirdilər. İmama ünvanlanmış məktublar məhz vəkillər vasitəsi ilə sahibinə çatdırılırdı. Əgər vəkalət qurumu .olmasaydı, şübhəsiz ki, bir çox fəaliyyətlər həyata keçməmiş qalardı

Kiçik qeyb dövrü ərəfəsində və həmin dövr ərzində vəkillərin mühüm vəzifələrindən biri şiələrin suallarının qısa şəkildə cavablandırılması və imamların hər

hansı bir məsələ ilə bağlı hökmünün onlara çatdırılması idi. Bə’zən imam ona sual ünvanlanmamışdan qabaq hər hansı bir məsələ ilə bağlı öz göstərişlərini verirdi. Məsələn həzrət Mehdi birinci səfirin vəfatından sonra ikinci səfirin kimliyi haqqında göstəriş vermişdi. Başqa bir göstərişlə dördüncü səfirin fəaliyyətinin başa çatması və .böyük qeyb dövrünün başlanması bəyan olunmuşdu

Qayda belə idi ki, sual ünvanlandıqdan sonra ona iki-üç gün ərzində cavab verilməli idi. .Amma bə’zən suallar daha qısa müddət ərzində cavablandırılırdı

Vəkillərin bu istiqamətdəki fəaliyyətini şər’i sualların cavablandırılması, vəkillərə müxtəlif göstərişlərin ünvanlanması, şər’i ödənclərin qeydə alınması, vəkillərin tə’yinatının e’lan edilməsi, vəkalət qurumuna qarşı təhlükə ehtimalının açıqlanması, yalan iddiaların, bid’ətlərin e’lan edilməsi, vəkillərə qarşı ittihamlara cavab verilməsi, şəxsi məsələlərin həlli, ixtilafların aradan qaldırılması, şübhələrə aydınlıq gətirilməsi .kimi işlər təşkil edirdi

## EHTİYACLILARA KÖMƏK

Vəkalət qurumunun vəzifələrindən biri də şiə ehtiyaclılara yardım göstərilməsi idi. Bu yolla bə’zən hakimiyyət dairəsinə də nüfuz etmək olurdu. Məsələn, imam Kazimin (ə) vəkili olan Əli ibn Yəqtin abbasi xilafəti qurumuna nüfuz etməklə şiələrə qarşı zülmü aradan qaldırmaq istiqamətində fəaliyyət göstərirdi. O bu işdə müvəffəq olmuşdu. İmam (ə) bu şəxsin abbasi xilafəti ilə həmkarlıqdan uzaqlaşmaq istədiyini eşitdikdə ona buyurdu: «Allah-təala hər azğının yanında öz övliyalarından vəzir qərar vermişdir .«ki, onun vasitəsi ilə öz dostlarını bəladan qurtarsın. Sən onlardansan, ey Əli

Bə’zən isə vəkillər şiələr arasındakı ixtilafların aradan qaldırmaqla məşğul olmuşlar. Onlar bu yolda ixtiyarlarındakı büdcədən də sərf edirdilər. Məsələn, imam Sadiq (ə) öz vəkili Müfəzzəl ibn Əmr Zö’fiyə buyurmuşdu ki, büdcədən dörd yüz dirhəm xərcləməklə Əbu-Hənifə Saiq əl-Hac və onun yaxınları arasındakı ixtilafı aradan qaldırsın. Deməк, imamlar şiələr arasındakı vəhdətə xüsusi diqqət yetirirdilər. Qeyb dövründə şiələrin yeganə sığınacağı vəkalət qurumu idi. Ona görə də səfirlərə müraciət etmək imkanı, hətta bə’zən əsrin imamı ilə görüşün təşkili şiələrə səfirlər .tərəfindən göstərilən böyük yardım sayılır

Vəkilin xüsusiyyətlərindən biri onun e’tibarlı olmasıdır. Bə’zilərinin fikrincə, vəkilin e’tibarlılığı dedikdə onun şiələrdən toplanmış büdcəyə münasibətdə sədaqətli olması nəzərdə tutulur. Amma belə düşünənlər də var ki, vəkil yalnız ədalətli olduqda e’tibarlı .sayılır

Belə görünür ki, vəkilin e’tibarlılığı dedikdə daha geniş mə’na başa düşülməlidir. Əgər imam bir şəxsi nümayəndə kimi hər hansı məntəqəyə göndərirsə, bu insan təkcə maddi məsələlərdə yox, ümumiyyətlə, e’tibarlı olmalıdır. Xalq arasında ədalətli tanınmayan bir şəxsin imam tərəfindən nümayəndə seçilməsi mümkünsüz bir işdir. .Demək, vəzifəsi yalnız dini ödəncləri toplamaq olan şəxs də ədalətsiz ola bilməz

Bə’zi hallarda imamlar vəkalət qurumunun rəhbəri olaraq öz vəkillərinin e’tibarlılığını e’lan etmişlər. İmamların belə bir tə’minatı şiələrdə arxayınçılıq yaratmışdır. Bir mənbədə bildirilir ki, imam Həsən Əsgəri (ə), Əhməd ibn İshaq, Əli ibn Cə’fər Həmani, Əyyub ibn Nuh və İbrahim ibn Məhəmməd Həmdanini e’tibarlı şəxs kimi tanıtdırmışdır. .Başqa bir məclisdə Osman ibn Səidin e’tibarlı olması e’lan edilmişdir

İmamlar bir məntəqəyə öz vəkillərini göndərdikdə, adətən, həmin məntəqənin şiələrinə bu şəxsin e’tibarlı olması haqqında məktub yazardılar. İmam Həsən Əsgərinin (ə) Nişabur şiələrinə yazdığı məktubu misal göstərmək olar. İmam bu .məktubda İbrahim ibn Əbdənin e’tibarlı şəxs olduğunu bildirmişdir

Kiçik qeyb dövründə də hər bir səfir imamın göstərişi ilə özündən sonrakı səfirin e’tibarlı olduğunu bəyan etmişdir. Məhəmməd ibn Osman Əmri tərəfindən Hüseyn ibn .Ruhun şiə başçılarına təqdim olunması deyilənlərə sübutdur

**SİRSAXLAMA**

Vəkalət qurumunun zalım rejim dövründə fəaliyyət göstərdiyini nəzərə alsaq, qəbul etməliyik ki, imamın nümayəndələri sirr saxlamağı bacaran insanlardan seçilə bilərdi. Gizli saxlanılası hər hansı sözü biganələrə bildirən kəs imamlar tərəfindən məzəmmət olunurdu. Müəlla ibn Künəys məhz sirr saxlamadığı üçün şəhadətə yetdi və uyğun .nöqsanına görə imam Sadiq (ə) tərəfindən tənqid edildi

Kiçik qeyb dövründə vəziyyət xüsusilə təhlükəli olduğundan vəkalət qurumunda

sirlərin qorunmasına xüsusi diqqət ayırılırdı. Səfirlər və vəkillər öz işlərində bu məsələyə ciddi riayət edirdilər. Birinci və ikinci səfir cəmiyyətdə yağsatan kimi tanınırdılar. Hüseyn ibn Ruh Növbəxti də öz sirsaxlamağı ilə məşhur idi. O məhz bu məqsədlə xüms-zəkat qəbul etdikdə qəbz verməzdi. Hətta bir dəfə öz qapçısını Müaviyənin haqqında pis danışdığı üçün

.işdən xaric etdi

Yuxarıda sadalanan xüsusiyyətlərdən əlavə, imamların vəkillərində zirəklik, iş bacarığı, nizam-intizam, əmanətdarlıq, dünyadan uzaqlıq, vəfadarlıq, həsəd və şöhrətbazlıqdan uzaqlıq, peyğəmbər ailəsinə məhəbbət, zəruri hallarda hicrət, Allahın kitabında və əhli-beyt maarifindən xəbərdarlıq, zəruri məqamlarda kəramət kimi xüsusiyyətlər var .idi

## VƏKALƏT QURUMUNUN QURULUŞU VƏ İŞ ÜSULLARI

Rəhbərlik-Rəhbər mə’sum imam idi. O vəkillərin işinə ciddi nəzarət edirdi. İmam.۱ vəkilləri tə’yin edir, onların işini yoxlayır, vəkilləri şiələrə tanıtdırır, onların şəxsiyyətləri və fəzilətləri haqqında mə’lumat verir, ləyaqətsiz vəkilləri işdən uzaqlaşdırır, qurumla bağlı fırıldaqları ifşa edir, vəkilləri vəzifələri ilə tanış edir, abbasi hökuməti ilə rəftar qaydalarını müəyyənləşdirir, vəkilləri maddi cəhətdən tə’min edir, vəkillərə qarşı .yersiz ittihamlara cavab verirdi

Baş vəkil-Vəkalət qurumunda müxtəlif məntəqələrə vəkillər tə’yin edilir və hər bir.۲ geniş məntəqə üçün baş vəkil seçilirdi. Bu vəkil məntəqəyə daxil olan yerlərdəki vəkillərin işinə nəzarət edirdi. Doktor Casim Hüseynin bildirdiyinə görə, vəkillər şiələri ərazilərə görə dörd qrupa bölmüşdülər: Bağdad şiələri, Mədain şiələri, Qum (Həmədan və ətraf məntəqə) şiələri, Kufə şiələri. İkinci əraziyə Bəsrə və Əhavaz, dördüncü əraziyə Hicaz, Yəmən və Misir daxil idi. Hər nahiyədə bir müstəqil vəkil fəaliyyət göstərirdi. Onun ərazi üzrə nümayəndələri vardı. Məsələn, Əbu-Məhəmməd Həsən ibn Harun və onun atası Harun ibn İmran kiçik qeyb dövründə Həmədan nahiyəsində baş vəkil idilər. İmam Sadiq (ə) və imam Kazimin (ə) dövründə İraqda Əbdür-Rəhman ibn əl-Həccac baş vəkil kimi fəaliyyət göstərirdi. İmam Hadinin (ə) dövründə isə həmin ərazidə Əli ibn əl-Hüseyn ibn Əbdür-Rəbbə baş vəkil tə’yin olunmuşdu. Kiçik qeyb dövründə İranın şərq vilayətlərində vəkillərin işinə Əbül-Hüseyn Əsədi Razi başçılıq edirdi. Birinci və ikinci səfirin nəzarəti altında Bağdadda fəaliyyət göstərən Hacər ibn .Yəzid Vəşşa öz növbəsində İrandakı bə’zi vəkillərə başçılıq edirdi

Səyyar nümayəndələr-Məntəqəyə e’zam olunmuş vəkillər, adətən, həmin.۳ məntəqədə qalsalar da, tarixi mə’lumatlara görə, onlar bə’zən başqa məntəqələrə də

baş çəkməyə vəzifəli olmuşlar. Ərazi vəkillərinin işinə nəzarət etmiş, həm də onlarla imam arasında rabitəni tə'min etmişlər. Onların başqa bir vəzifəsi yerli vəkillərdən dini ödəncləri təhvil götürüb imama çatdırmaq olmuşdur. Əhməd ibn Məhəmməd ibn İsa Qummi ilə bağlı bir əhvalatı xatırlamaq yerinə düşər. Bu şəxs Mədinədə imam Cavadın

ə) yanında olarkən Zəkəriyya ibn Adəm haqqında soruşmaq istəyir. Həzrət özü sözə) başlayıb buyurur: «Onun atama və mənə etdiyi xidmətləri inkar etmək olmaz. Amma onun ixtiyarına verilmiş ödənclər yerinə çatmalıdır». Əhməd ərz edir: «Zəkəriyya ibn Adəm həmin əmanəti sizə çatdıracaqdır və xahiş etdi sizə deyəm ki, yubanmasının səbəbi Məymun və Müsafir (Qumdakı iki vəkil) arasındakı ixtilafdır». Həzrət buyurdu: «Mənim məktubumu ona çatdır və de ki, ixtiyarına veriləni mənə çatdırsın . . .» Bu əhvalatdan mə'lum olur ki, vəkalət qurumu ilə ərazilərdəki vəkillər arasında əlaqə .olmuşdur

Təqiyyə-Vəkalət qurumunun mühüm xüsusiyyətlərindən biri onun təqiyyəyə əməl.۴ etməsi və gizli fəaliyyət göstərməsi olmuşdur. Şübhəsiz ki, Abbasilər hökumətinin gizli nəzarəti belə bir üsulu zəruri etmişdir. İmamların və şiələrin addım-addım izlənilməsi onları gizli fəaliyyət göstərməyə vadar edirdi. Belə bir üsul sayəsində vəkalət qurumu uzun bir ömür yaşaya bilmişdir. Ciddi təhlükələr yarandığı zaman qurum rəhbərinin oyaqlığı və üzvlərin fədakarlığı nəticəsində təşkilat qorunmuşdur. Qurum üzvlərindən bə'ziləri şəhadətə yetişsələr də, özək qorunmuş və əsas fəaliyyət xətti qırılmamışdır. Vəkillik səbəbindən həbs olunmuş Müəlla ibn Xünəys Abbasilər tərəfindən böyük işgəncələrə mə'ruz qalmışdır. Ondan imamın səhabələrinin adı soruşulduqda Xünəys demişdir: «Məni ölümlə qorxudursunuz. And olsun Allaha, əgər ayağımın altda olsalar, ayağımı qaldırmaram. İmam Sadiqin (ə) digər bir vəkili Nəsr ibn Qabus Ləxmi məxfi fəaliyyət göstərmişdir. Eləcə də, imam Kazimin (ə) Bağdaddakı vəkili Məhəmməd ibn Əbu-Əmir dözülməz işgəncələrə mə'ruz qalmasına baxmayaraq, həzrətin .ardıcıllarının adını faş etməmişdir

İmam Həsən Əsgəri (ə) öz baş vəkili Osman ibn Səid Əmriyə Davud ibn Əl-Əsvəd vasitəsi ilə göndərdiyi məktubu dairəvi bir çubuqda gizləmişdir. Hətta Davud da .çubuqda məktub olduğunu bilməmişdir

Kiçik qeyb dövründə abbasi vəziri Übeydüllah ibn Süleyman vəkillərin məxfi fəaliyyətlərindən xəbər tutduğu vaxt xəlifə ilə məsləhətləşmiş və vəkilləri müəyyənləşdirmək qərarına gəlmişdir. Xüms-zəkat vermək bəhanəsi ilə vəkilliyi ehtimal olunan adamların yanına casuslar göndərmişdir. Amma mərkəzin bir əmri ilə bütün vəkillər şər'i ödənc yığmağı dayandırmışlar. İmamın vəkillərindən olan

Məhəmməd ibn Əhməd Qəttan hökumətin göndərdiyi casusa demişdir: «Səhv gəlmisən, mən belə işlərlə məşğul deyiləm». Mərkəzdən növbəti əmr gələnədək .vəkillər belə bir mövqe tutmuşdular

Həzrət Mehdinin (ə) üçüncü səfiri Hüseyn ibn Ruhun ciddi təqiyyəsi, imamın birinci və ikinci

səfirləri olmuş Osman ibn Səid və onun oğlu Məhəmmədin yağsatan kimi tanınması vəkalət qurumunun gizli fəaliyyət göstərməsinə dəlil ola bilər. Kiçik qeyb dövründə səfirlər o qədər məxfi fəaliyyət göstərirdilər ki, vəkillər və digər nümayəndələrlə görüşmək üçün Bağdad xarabalıqlarında yer tə'yin olunurdu. Səduqun nəql etdiyinə görə, bir dəfə Məhəmməd ibn Osman ibn Səid Əmri köməkçilərindən biri ilə görüşüb, həzrət Mehdinin (ə) məktubunu ona vermək üçün Abbasiyeye–Bəğdad xarabalığını görüş yeri seçmişdi. Məktub oxunduqdan sonra məhv edilmiş, eləcə də, heç bir şər'i ödəncə görə qəbz yazılmamışdı. İkinci səfir şiələrdən toplanmış haqların yerinə .çatdırılması üçün adi tacirlərdən istifadə edərdi

Münasib rabitə vasitələri–Qurumun digər xüsusiyyətlərindən biri onun münasib.۵ rabitə vasitələrinə malik olması idi. Müxtəlif məqamlarda səfirlər, naiblər, vəkillər və şiələr imamlarla birbaşa görüşə bilirdilər. Bu görüşlər çox gizli şəraitdə baş tuturdu. Bə'zən isə bu əlaqələr məktublar vasitəsi ilə həyata keçirilirdi. Xüsusi ilə imamın qeyb dövründə və o biri imamlar həbsdə olduqları vaxt əlaqələr məktublarla tə'min edilirdi. Bu səbəbdən də imam Hadi (ə) və imam Həsən Əsgərinin (ə) yazdığı məktubların sayı .bütün əvvəlki imamların yazdıqları məktubların sayından çoxdur

Vəkalət qurumunun digər bir rabitə vasitəsi səyyar nümayəndələrdən istifadə olunması idi. Onların çoxu gördükləri işin mahiyyətindən xəbərsiz olardılar. Məsələn, Azərbaycandakı vəkil Qasim ibn Əl–Ə'lanın ölüm tarixini e'lan etmək üçün göndərilən şəxs və ya Quma göndərilmiş iki rabitəçi işin əsil mahiyyətindən xəbərsiz olmuşdular. Vəkalət qurumunun mühüm rabitə vasitələrindən biri də Həcc mərasimi idi. Vəkalət .qurumunun müxtəlif səfirləri bu mərasimdə bir–birləri ilə görüşərdilər

## KİÇİK QEYB DÖVRÜNƏDƏK FƏALİYYƏT GÖSTƏRMİŞ ƏSAS VƏKİLLƏR

İlkin rical, rəvayət və tarixi mənbələri araşdırarkən bir çox vəkillərin adı ilə qarşılaşırıq. Bütün bu şəxslər vəkalət qurumunun üzvləri olmuşlar. Onlar haqqında əvvəlki söhbətlərimizdə danışdıq. Amma iddia etmək olmaz ki, bütün vəkillərin adı mənbələrdə qeyd olunmuşdur. Bir qədər dərin araşdırma apardıqda qurumda daha mühüm fəaliyyət göstərmiş vəkillərin adlarını müəyyənləşdirmək olur. Əlbəttə ki, bütün vəkillərin şəxsiyyətini geniş şəkildə nəzərdən keçirmək imkanımız yoxdur. Ona

.görə də yığcam şəkildə əsas vəkillərlə tanış olacağıq

**ƏBDÜR–RƏHMAN İBN ƏL–HƏCCAC**

Şeyx Tusi Əbdür–Rəhman ibn Əl–Həccacı imam Sadiqin (ə) bəyənilmiş vəkillərindən

saymışdır. Bu şəxs imam Kazimin (ə) vəkili olmuş və İraqda baş vəkil vəzifəsini daşımışdır. İmam Sadiq (ə) ona buyurmuşdur: «Ey Əbdür-Rəhman! Mədinə əhli ilə həmsöhbət ol. Mən şiələr arasında sənin kimisinin görünməsini istəyirəm». Bu sözlər Əbdür-Rəhmanın elmi məqamının və imamla yaxınlığının göstəricisidir. O, imam Kazimin (ə) də yanında böyük məqama malik olmuşdur. Həzrət onun vəsfində buyurur: .««Onun mənim qəlbimdə məqamı və əzəməti var

### MƏHƏMMƏB İBN SƏNAN

Bə'zi mənbələrdə bu şəxs imam Sadiqin (ə) «qapısı» («Bab») kimi yad edilmişdir. Şeyx Tusi bu şəxsi bəyənilmiş vəkillərdən sayır və onun əhli-beyt tə'limlərini və Allahın dinini dəyişməmiş, xəyanət etməmiş, doğru yolda olmuş bir şəxs olduğunu bildirir. Bu şəxs .dörd və ya beş imamı görmüş və hörmətli bir insan olmuşdur

### MÜƏLLA İBN XÜNƏYS

Şeyx Tusinin bildirdiyinə görə bu şəxs də imam Sadiqin (ə) bəyənilmiş vəkillərindən olmuşdur. O həm vəkalət vəzifəsini yerinə yetirmiş, həm də imamın şəxsi işlərini icra etmişdir. Müəlla həzrətin Mədinədə vəkili olmuş və çox ehtimal ki, şiələr arasında əlaqə yaratmaq üçün başqa məntəqələrə də səfər etmişdir. O, abbasi hakimiyyəti tərəfindən həbs edilmiş və şəhadətə çatmışdır. Müəllanın həbs olunmasının səbəbi onun sirr saxlaya bilməməsi olmuşdur. Bu fikiri rəvayətlər təsdiq edir. Müəllanı qətlə yetirmiş Davud ibn Əli imam Sadiqin (ə) nifrini nəticəsində həmin yerdəcə həlak .olmuşdur

### NƏSR İBN QABUS LƏXMİ

Şeyx Tusi bildirir ki, bu şəxs iyirmi il müddətində imam Sadiqin (ə) vəkili olmuşdur. Amma onun vəkilliyini kimsə bilməmişdir. O, xeyirxah və fəzilətli insan olmuşdur. Deyilənlərdən mə'lum olur ki, Nəsr ibn Qabus təqiyyəyə ciddi əməl etmişdir. Şeyx Müfid onu imam Kazimin (ə) xüsusi səhabələrindən saymışdır. Ehtimal olunur ki, bu .şəxs imam Kazim (ə) və imam Rizanın (ə) da vəkili olmuşdur

### MÜFƏZZƏL İBN ÖMƏR CÖ'Fİ

Bu şəxs imam Sadiqin (ə) nümayəndəsi olaraq fəaliyyət göstərirdi. Şiələrdən şər’i ödəncləri toplayan bu şəxs imam Kazim (ə) tərəfindən də Mədinədə baş vəkil tə’yin olunmuşdur. İmam Kazim (ə) özü xüms-zəkat qəbul etmədiyi vaxtlarda şiələri Müfəzzəlin

yanına göndərirdi. Bə'zi qədim mənbələrdə Müfəzzəl imam Sadiqin (ə) və imam .Kazimin «qapısı» kimi sayılırdı. Belə bir ad onun şəxsiyyətinin ucalığını göstərirdi

## ƏLİ İBN YƏQTİN

Bu şəxs imam Kazimin (ə) Bağdadda vəkili və həzrətin abbasi hakimiyyətindəki nüfuzlu adamı idi. Tarixi mənbələrdə onun haqqında geniş mə'lumat verilmişdir. Bu şəxs məktubların və şər'i ödənclərin İraqdan Mədinəyə göndərilməsi üçün Əbdür-Rəhman .ibn Əl-Həccac kimi vəkillərdən və digər rabitəçilərdən istifadə edirdi

## ƏBDÜLLAH İBN CÜNDƏB

Əbdüllah imam Kazim (ə) və imam Rizanın (ə) Əhvaz məntəqəsindəki baş vəkili idi. Şeyx Tusi onun yüksək məqam sahibi olduğunu qeyd etmişdir. İmam Kazim (ə) isə Əbdüllahın şəxsiyyəti haqqında xoş sözlər söyləmişdir. O, dünyasını dəyişdikdən sonra .Əli ibn Məhzyar Əhvazi onun canişini oldu

## VAQİFİYYƏ MƏZHƏBİNİN BAŞÇILARI

Əli ibn Əbu-Həmzə Bətaini, Ziyad ibn Mərvan Qəndi, Əhməd ibn Əbu-Bəşər Sərrac, Osman ibn İsa Rəvasi imam Kazimin (ə) vəkilləri olmuş və imamın şəhadətindən sonra onun dünyasını dəyişməsini inkar edərək qeybə çəkildiyini bildirmişlər. Bu dörd şəxs imam Kazimin (ə) vəkili olaraq əldə etdikləri şər'i haqları xərcləmiş və imamın canişini imam Rizaya (ə) təhvil verməmişlər. Ona görə də imam və şiə cəmiyyəti tərəfindən .rədd edilmişlər. Hər dörd şəxs vaqifiyyə məzhəbinin başçıları olmuşlar

## TARİXİ MƏNBƏLƏRDƏ ADLARI QEYD OLUNMUŞ DİGƏR VƏKİLLƏR

Tarixi mənbələrdə vəkillik fəaliyyətində seçildiyi üçün adı çəkilən şəxslər: İbrahim ibn Səlam Nişaburi, Səfvan ibn Yəhya, Əbdül Əziz ibn Əl-Möhtədi, Əli ibn Məhzyar Əhvazi, Fəzl ibn Sənan, Hişam ibn İbrahim Abbasi, Əbu Əmr Əl-Həzza, Zəkəriyya ibn Adəm Qummi, İbrahim ibn Məhəmməd Həmədani, Məhəmməd ibn Əl-Fərəc, Əyyub ibn Nuh, Əli ibn Cə'fər Həmani, Faris ibn Hatəm Qəzvini, Əli ibn Əl-Hüseyn ibn Əbdür-Rəbbə, Əbu Əli ibn Raşid, İbrahim ibn Məhzyar, Osman ibn Səid Əmri, Əhməd ibn İshaq Qummi, Məhəmməd ibn Əhməd ibn Cə'fər Əl-Qummi Əl-Əttar Əl-Qəttan, İbrahim ibn

XÜLASƏ

Vəkalət qurumu imam Sadiqin dövründən başlayaraq konkret fəaliyyət dairəsi olan bir qurum idi. Bu vəkillər birliyi tarixi mənbələrdə qurum və təşkilat adlandırılmasa da, rəhbərlik, həmkarlıq, konkret hey'ət, müəyyən proqram kimi xüsusiyyətləri ilə təşkilati fəaliyyət göstərmişdir. Deyildiyi kimi mövcud rəhbərlik bu qurumun bariz xüsusiyyətlərindəndir. Bu quruma mə'sum imamlar rəhbərlik edirdilər. Ona görə də qurumun bir çox fəaliyyətləri uyğun məqam səviyyəsində idi. Vəkillərin tə'yini və işdən uzaqlaşdırılması, onların müsbət və mənfi cəhətlərinin üzə çıxarılması, vəkillərin işinə nəzarət, uydurma cərəyanların ifşa edilməsi haqqında danışılan həmin fəaliyyətlərdən .idi

Bə'ziləri müavinlik rolunu ifa edirdilər. Bə'zilərinin baş vəkil olması barədə yetərincə mə'lumatlar var. Baş vəkillər bir və ya bir neçə məntəqədəki vəkillərin fəaliyyətinə .nəzarət edirdilər

Söhbətlərimizdə mə'sum imamların vəkillər qurumundan istifadə etmə səbəbləri müəyyən həddə aydınlaşdırıldı. Mövcud siyasi durum, Abbasilərin tə'qibləri belə bir rabitə vasitəsini zəruri edirdi. Hətta siyasi vəziyyət gərgin olmasaydı da, İslam dünyası geniş olduğundan və şiələr ucqar nöqtələrə səpələndiyindən imamla şiələr arasındakı rabitəni tə'min etmək üçün belə bir quruma ehtiyac olardı. Bundan əlavə, şiələri qeyb dövrünə hazırlamaq üçün hansısa qurum fəaliyyət göstərməli idi. Şiələri kiçik qeyb .dövründə qeyri-müəyyən vəziyyətdən çıxarmaq üçün qurum müsətəsna rola malik idi

Vəkalət qurumu imam Sadiqin (ə) dövründən fəaliyyətə başlayıb kiçik qeyb dövrünün sonunadək işini davam etdirdi. Qurum coğrafi məhdudluq baxımından şiələr yaşayan məntəqələrdə fəaliyyət göstərirdi. Hər hansı bir məntəqədə qrup şəklində şiələr yaşayırdısa, həmin məntəqədə vəkalət qurumunun nümayəndəsi olurdu. Belə ki, Hicaz, İraq, İran, Yəmən, Misir kimi məntəqələr vəkalət qurumunun fəaliyyət .dairəsinə daxil idi

Bə'zi təhqiqatçılar belə hesab edirlər ki, vəkalət qurumunun işi yalnız xüms-zəkat kimi dini ödənclərin toplanması olmuşdur. Hansı ki, qurumun təbliği, elmi, mədəni, siyasi fəaliyyətlərini təsdiq edən faktlar mövcuddur. Qurum öz fəaliyyət dövründə şiələrin

problemlərini aradan qaldırmış, onların şəxsi ehtiyaclarına da cavab vermişdir. Bununla belə, qurumun əsas işinin dini ödənclərin toplanmasından ibarət olduğunu inkar etmək olmaz.

Bə’zi rəvayətləri nəzərdən keçirməklə imamların vəkillərinin xüsusiyyətləri ilə tanış olmaq mümkündür. Vəkil e’tibarlı, əmanətdar, doğruçu olmalı idi. Bundan əlavə, vəkalət qurumunun üzvləri sirr saxlamağı bacarmalı, fəal olmalı, nizam-intizama riayət etməli idilər.

Kiçik qeyb dövrü hicri-qəməri ٢۶٠-cı il rəbiul-əvvəl ayının səkkizində imam Həsən Əsgərinin (ə) dünyasını dəyişməsi ilə başlamış və hicri ٣٢٩-cu il, şə’ban ayının ١۵-də imamın son xüsusi səfiri və naibi Əbül-Həsən Əli ibn Məhəmməd Səmərinin vəfatı ilə başa çatmışdır. Kitabın bu fəslində şiə tarixinin həssas bir dövründə baş vermiş .hadisələri aşağıda sadalanmış doqquz söhbətlə araşdıracağıq

;Kiçik qeyb dövründə ictimai-siyasi vəziyyət və düşüncə durumu

;Qeyb tarixi və onun necə başlaması

;Qeybin fəlsəfəsi

;Kiçik qeyb dövrünün xüsusiyyətləri

;İmam Həsən Əsgərinin (ə) vəfatından sonra firqələrarası ixtilaflar

;Dörd naibin tə’yini

;Kiçik qeyb dövründə əhalisi şiə olan məntəqələrdə vəkillərin tə’yini

;Xain vəkillər və vəkillik iddiası etmiş fırıldaqçılar

.Kiçik qeyb dövründə şiələrin ictimai-siyasi vəzifələri və düşüncə durumu

## KİÇİK QEYB DÖVRÜNDƏ İCTİMAİ-SİYASİ VƏZİYYƏT VƏ DÜŞÜNCƏ DURUMU

:Tarixin yetmiş illik bu dövründə hakimiyyətdə altı abbasi xəlifəsi olmuşdur

(Mö’təmid (on beşinci xəlifə; hicri ٢۵۶-٢٧٩

(Mö’təzəd (on altıncı xəlifə; hicri ٢٧٩-٢٨٩

(Müktəfi (on yeddinci xəlifə; hicri ٢٨٩-٢٩۵

(Müqtədir (on səkkizinci xəlifə; hicri ٢٩۵-٣٢٠

(Qahir (on doqquzuncu xəlifə; hicri ٣٢٠-٣٢٢

(Razi (iyirminci xəlifə; hicri ٣٢٢-٣٢٩

Haqqında danışacağımız dövrdəki siyasət özündən əvvəlki dövrün xüsusiyyətlərinə malikdir. Mövcud vəziyyət imam Mehdinin (ə) qeybindən əvvəlki vəziyyətdən bir o qədər də fərqlənmirdi. Bu dövrdə vəzirlik, valilik, qoşun başçılığı kimi vəzifələr tutan qeyri-ərəblər İslam dünyasının siyasi vəziyyətində aparıcı rol əldə etmişdilər. Hökumət qurumunda bu elementlər artdıqca mərkəzi hakimiyyət daha da zəifləyirdi. Xəlifə zəif olduqda dövlət işlərinə istər-istəməz ətrafdakılar nəzarət etməyə başlayır. Bu dövrdə mərkəzi hökumət dövlətin idarəçiliyində, xüsusi ilə də sərhədlərə nəzarətdə öz

səh:۸۸

.funksiyalarını yerinə yetirə bilmirdi

Müqtədirin dövründə dəniz sərhədləri o qədər zəifləmişdi ki, heç vəchlə düşmənin qarşısını ala bilməyən sərhəd qüvvələri Bağdada, mərkəzi hökumətə yardım üçün müraciət edir və bildirirdilər ki, əgər onlara yardım edilməsi rumlulara təslim olacaqlar. Amma onların bu sözlərinə fikir verən yox idi. Ona görə də qüvvələri məğlub olub geri .döndülər

Xilafət qurumu zəif olduğundan, eləcə də, qeyri-ərəblər xilafət aparatında kök atdığından xəlifə hakimiyyəti əlində toplaya bilmirdi. O, başqalarının əlinə keçmiş .hakimiyyət vasitələrinin təzyiqindən çəkinirdi

Bə’zən xəlifəni məcbur edirdilər ki, tə’yin olunmuş vəliəhdi, canişini bir başqası ilə əvəz etsin. Məsələn, hicri ٢٧٩-cu ildə Mö’təmədi məcbur etdilər ki, öz oğlunu canişinlikdən .uzaqlaşdırıb, qardaşı oğlu Mö’təzidi canişin seçsin

Bə’zən isə türk zabitləri xəlifəni həbs edir, ona işgəncə verir, hətta xilafətdən uzaqlaşdırırdılar. Məsələn, hicri ٣٢٢-ci ildə bir qrup türk zabiti abbasi xəlifəsi Qahirə qarşı çıxıb, qəsri mühasirəyə aldılar. Sərxoş olub yatmış xəlifə səs-küyə oyandı. .Qiyamçılar onu həbs edib, işgəncə verdilər, sonra isə gözlərini çıxardılar

Bə’zən Abbasi xilafətinin sütunları o qədər zəifləyirdi ki, xəlifə kimi vəzir seçəcəyini də tə’yin edə bilmirdi. Vəzirliyi bir neçə gün çəkmiş adamlar olmuşdur. Bu barədə Məs’udi yazır: «On səkkizinci abbasi xəlifəsi Müqtədir öz vəzirlərini on altı dəfə dəyişmişdi. On .doqquzuncu abbasi xəlifəsi Qahir isə bir il ərzində dörd vəzir dəyişmişdi

Bu tələsik yerdəyişmələr bir daha göstərir ki, Abbasilər hökuməti zəifləməkdə imiş. Xəlifələr dövlət idarəçiliyində bir o qədər də rol oynamır, dövlət vəzifələrinə tə’yinatlar zamanı qadınların tə’siri altına düşürdülər. Tarixçilərin bildirdiyinə görə Müqtədirin anası Seyyidə dövlətin bütün işlərinə müdaxilə edirdi. Hicri ٣٠٤-cü ildə vəzir Əli ibn Əysanı da vəzifəsindən uzaqlaşdıran bu qadın olmuşdur. Süyutinin yazdığına görə, təqvalı, iffətli bir şəxs olan vəzir ədalətə riayət edir, İslam hökmlərinə diqqət .göstərirdi

İbn-Əsir yazır: «Müqtədirin anası Səyyidənin xadiməsi Ümmü-Musa vəzirin evinə gedib xidmətçilərin xərcləri haqqında söhbət etmək istədi. Vəzir yatdığından keşikçi dedi: «Bir qədər gözlə, vəzir yuxudan oyansın». Amma Ümmü-Musa qəzəbləndi və Müqtədirin anası

Səyyidənin yanına qayıdıb şikayət etdi. Vəzir yuxudan oyandıqdan sonra Ümmu-Musanın gəldiyini eşidib, təşvişə düşdü, keşikçi ilə oğlunu üzr istəmək üçün Ümmü-Musanın yanına göndərdi. Amma xəlifənin anası bu üzrü qəbul etmədi və Müqtədirə şikayətləndi. Nəticədə, abbasi xəlifəsi öz vəzirini işdən kənarlaşdırıb, bir qədər sonra isə həbs etdi».

Əbül-Abbas Xətibin vəzirlikdən uzaqlaşdırılması da Səyyidənin göstərişi ilə baş verdi. Xəlifənin işlərinə onun anasının bu səviyyədə müdaxilə etməsi xəlifənin zəifliyinin aşkar sübutudur.

Amma xəlifələr nə qədər zəif olsalar da, müsəlman xalqa qarşı öz zülmlərini günbəgün artırırdılar. Onlar öz hakimiyyətlərini qorumaq üçün heç bir cinayətdən çəkinmirdilər. Haqqında danışdığımız dövrdə xalq rejimin ciddi sıxıntısı altında yaşayırdı. Xüsusi ilə Mö’təzidin dövründə Şeyx Tusinin tə’birincə, qılınclardan qan damırdı».

Deyilən vəziyyət kiçik qeyb dövründən əvvəl də mövcud idi. İndi isə kiçik qeyb dövründə baş vermiş hadisələr haqqında danışacağıq.

## XİLAFƏT MƏRKƏZİNİN SAMİRRADAN BAĞDADA KÖÇÜRÜLMƏSİ

Kitabın üçüncü fəslində qeyd etdik ki, hicri ٢٢٠-ci ildə abbasi Mö’təsim xilafət mərkəzini Bağdaddan Samirraya köçürdü. O belə bir tədbir görməklə düçar olduğu çətinlikləri və xilafətin zəifliyini aradan qaldırmaq istəyirdi. Amma paytaxtın köçürülməsi xilafətin uğradığı tənəzzülün qarşısını ala bilmədi. Əksinə, bu tədbir yeni problemlər yaratdı. Belə ki, hicri ٢٧٩-cu ildə, Bağdadda abbasi Mö’təsim ilə bey’ət edildi və xilafət mərkəzi yenidən Bağdada köçürüldü. Xəlifə Müktəfi növbəti dəfə Samirranı paytaxt etmək istədiyi vaxt vəziri bu işin ağır xərclər tələb etdiyini bəhanə edərək uyğun işin qarşısını aldı. Bundan sonra Samirra diqqətdən kənarda qaldı və xarabaya çevrildi.

## QƏRAMİTƏNİN ZÜHURU

Kiçik qeyb dövründə İslam dünyasında baş vermiş əsas fitnələrdən biri batiniyyə əqidəsinin ifratçı qolu olan Qəramitənin qiyamı oldu. Qəramitə hicri ٢٧٧-ci ildə tüğyan qopardı və İslam dünyasında otuz ildən çox xalqa zülm etdi. Bu firqədən olanlar o qədər amansız idilər ki, heç bir qoşun onlarla üz-üzə gəlməyə cür’ət etmirdi.

Qəramitənin hücum xəbəri bir məntəqəyə çatdıqda həmin məntəqə əhlini qorxu .bürüyərdi

Xüsusi bir məzhəb təşkil etmiş bu insanlar başqa müsəlmanların canını, malını və namusunu halal sayırdılar. Onlar öz hücumlarına Kufədən başladılar. İraqda, Suriyada, .Bəhreyndə xalqa divan tutdular

Qəramitə hicri ۲۹۴-cü ildə Zəkrəviyyənin başçılığı ilə Xorasan həcc karvanına hücum

edərək karvandakıları qətlə yetirdi. Hicri ٣١١-ci ildə bu firqə Əbu-Tahirin başçılığı altında Bəsrə xalqına hücum etdi və on yeddi gün ərzində xalqı qılıncdan keçirdi, .onların var-yoxunu qarət etdi, namusunu ayaq altında qoydu

Hicri ٣١٢-ci ildə Əbu-Tahirin qoşunu həcc karvanını qarət edərək karvan əhlini susuz səhralarda əliboş qoydu. Səhrada qalmış insanlar aclıq və susuzluqdan həlak oldular. Növbəti il Qəramitə həcc karvanının qarşısını kəsib bac aldı və bu bacın müqabilində onlara Məkkəyə getmək icazəsi verildi. Hicri ٣١٧-ci ildə isə bu qoşun vəhşicəsinə Məscidul-hərama hücum etdi, hacılar qətlə yetirildi, onların cənazələri zəm-zəm quyusuna atıldı. Əbu-Tahir Kə’bənin örtüyünü çəkib qopardı və tikə-tikə edib döyüşçülərinə payladı. O, Həcərul-əsvədi (Kə’bədəki qara daşı) yerindən qoparıb .Həcərə (Bəhreynə) apardı. Bu firqə Həcərul-əsvədi otuz il Bəhreyndə saxladı

Hicri ٣١٥-ci ildə bu şəxs Kufəyə hücum edib, şəhər əhlini qarət etdi, çoxlarını qılıncdan .keçirdi. Bu fitnəkarlıq hicri ٣١٨-ci ildə Süleymanın qətlə yetirilməsi ilə aradan qalxdı

### ƏLƏVİ QİYAMLARININ AZALMASI VƏ ŞİƏLƏRƏ QARŞI SIXINTILARIN GÜCLƏNMƏSİ

Həm Qəramitə, həm də Sahibe-zənc firqələrinin cinayətləri bilərəkdən şiələrin ayağına yazılırdı. Abbasi xəlifələri bu bəhanələrlə şiələri sıxıntıya salırdılar. Uyğun iki qiyam nəticəsində şiələrə qarşı təzyiqlər gücləndi və şiələr silahlı qiyam etmək imkanından məhrum edildilər. Məsələn, həzrət Höccətin (ə) üçüncü səfiri Hüseyn ibn Ruh Qəramitə firqəsi Bəsrə əhalisinə hücum etdikdən və Bağdad hacıları qarət edildikdən sonra hicri ٣١١-ci ildə həbs edildi. Abbasilər bəhanə edirdilər ki, Qəramitə firqəsi şiədir və şiələr bu qiyama görə müqəssirdirlər. Xilafətin zəhərli təbliğatları nəticəsində Bağdad əhalisi şiələrə qarşı çıxdı. Hətta İbn-Fərat və oğlu yalnız şiə olduqları üçün Qəramitə ilə həmkarlıqda təqsirləndirildi və vəzirlikdən uzaqlaşdırılaraq .qətlə yetirildi

Bununla belə, ələvilərin qiyamları davam edirdi. Həmin dövrdə bir neçə dəfə ələvilər .ayağa qalxdılar və onlardan bə’ziləri hansısa müvəffəqiyyətlər qazana bildilər

:Həmin dövrdə baş vermiş ələvi qiyamlarını nəzərdən keçirək

Həsən ibn Yəhyanın qiyamı: Bu şəxs hicri ٢٧٨-ci ildə Yəməndə Abbasilərə qarşı qiyam

;qaldırdı

İbn Ər-Rizanın qiyamı: Möhsün ibn Cə’fər Dəməşq vilayətində hicri ٣٠٠-ci ildə qiyam qaldırdı. Məs’udi bu barədə yazır: «Hicri ٣٠٠-ci ildə İbn Ər-Riza ilə Əbül-Əbbas Əhməd arasında savaş oldu. Onu qətlə yetirdilər və oğlunu Bağdada apardılar. O, qərb ;səmtində yeni körpünün başında dara çəkildi

Həsən ibn Əli hicri ٣٠١-ci ildə Təbəristan və Deyləm məntəqələrində qiyam qaldırdı. O, Təbəristan və Deyləm məntəqələrini nəzarətə aldıqdan sonra Reyə üz tutdu. Yerli hakim qaçmağa məcbur oldu. Nəhayət, Həsən ibn Əli döyüşlərdən birində abbasi ;xəlifələri tərəfindən öldürüldü

Həsən ibn Qasimin qiyamı; Bu şəxs hicri ٣١٧-ci ildə böyük bir qoşunla Gil və Deyləmdən Reyə üz tutdu. Reyin böyük bir məntəqəsini-Qəzvini, Zəncanı, Qumu, Əbhəri və digər ;şəhərləri özünə tabe etdi

Əhməd ibn Məhəmməd Talibinin qiyamı: Bu şəxs Misirdə Əhməd ibn Tulunun qoşunu .ilə döyüşdü və öldürüldü

## AFRİKANIN ŞİMALINDA BİR ŞƏXSİN MEHDİLİK İDDİASI

Hicri ٢٩٦-cı ildə Übeydullah Məhdi adlı bir şəxs Afrikanın şimalında əsrin imamı olduğunu iddia etdi. Əbu-Əbdüllah Hüseyn ibn Əhməd ibn Məhəmməd ibn Zəkəriyya adlı bir şiənin vasitəsi ilə bu şəxs güc topladı və böyük bir məntəqəyə hakim oldu. Həmin məntəqədəki Ale-əğləb dövlətini məğlub etdi və həmin dövlətin son hakimi Ziyadətüllah ibn Məhəmmədi məntəqədən çıxardı. Bu şəxs Afrikanın şimal hissəsini, .Əl-Cəzair, Tunis və bir sıra digər məntəqələri hakimiyyəti altına aldı

Übeydullah Mehdi Afrikanın şimalında Məğrib adlı məntəqədə «Mədinətul-Məhdi» adı ilə özünə paytaxt seçdi. O, hicri ٣٠٣-cü ildə bu şəhərdə zil-qə'dənin beşində öz hakimiyyətinə başladı. ٣٢٢-ci ildə Übeydullah dünyasını dəyişdi, oğlu Məhəmməd .«Qaim» ləqəbi ilə onun canişini oldu

## MÜSTƏQİL DÖVLƏTLƏRİN YARANMASI

Abbasilər xilafəti günbəgün zəiflədiyindən müxtəlif məntəqələrin vali və hakimləri fürsətdən istifadə edərək öz müstəqilliklərini e'lan edirdilər. Müxtəlif qiyamlar nəticəsində abbasi hakimləri tutduğu mövqedən uzaqlaşdırılır və ya qətlə yetirilirdilər. .Qiyamlar nəticəsində xilafəti tanımayan müstəqil dövlətlər yaranırdı

Kiçik qeyb dövründən əvvəl baş qaldırmış müstəqillik hərəkatları bu dövrdə daha da :gücləndi. Hələ kiçik qeyb dövründən əvvəl təşkil olunmuş dövlətləri nəzərdən keçirək

Hicri ۲۲۴-cü ildə Misir və Şamda Əhməd ibn Tulun vasitəsi ilə Tuluniyyə dövləti .yaradıldı. Bu dövlət hicri ۲۷۰-ci ilədək yaşadı

Hicri ۱۸۴-cü ildə İbrahim ibn Əğləb ibn Salimin vasitəsi ilə Ali-Əğləb inqilabı baş verdi və .müstəqil bir dövlət yaradıldı. Bu dövlət ۲۹۶-cı ilədək hakimiyyətdə qaldı

Hicri ٢٢١-ci ildə Mərakeşdə İdris Həsəni tərəfindən inqilab baş verdi və ٣١٢-ci ilədək .yaşamış bir müstəqil dövlət təşkil edildi

Hicri ١٣٨-ci ildə Qurtubə məntəqəsində dövlət təşkil edildi və bu dövlət hicri ۴٢٢-ci .ilədək hakimiyyətdə qaldı. Bu dövlət Əməvilər adlanırdı

Əvvəlki dövrlərdə təşkil olunmuş müstəqil dövlətlərdən əlavə, bu dövrdə də muxtar .dövlətlər yaranırdı və bu dövlətlər abbasi xilafətini tənəzzülə uğradırdı

:Əvvəlki müstəqil hökumətlərə sonradan qoşulmuş dövlətləri nəzərdən keçirək

Yə’qub ibn Ləys Səffari tərəfindən Xorasanda Səffariyan adlı müsətqil dövlət təşkil edildi. Yə’qub hicri ٢۵۴-cü ildə Bağdad hakimləri tərəfindən Xorasana vali tə’yin edilmişdi. İlk əvvəl öz məqsədlərini gizləyən bu şəxs bir müddət Abbasilərlə dostluq əlaqələrini saxladıqdan sonra ölüm astanasında öz iç münasibətini açıqladı. Ondan sonra qardaşı Əmr ibn Ləys Səffariyan hökumətinə rəhbərlik etdi. Bu istiqlal hərəkatı .hicri ٢٩٠-cı ilədək davam etdi

Mavəraunnəhr, Xorasan və mərkəzi İranın bir hissəsində Saman Xudat və oğlanları tərəfindən Samanilər dövləti təşkil olundu. Bu dövlətin hakimiyyəti hicri ٢۶١-ci ildən .hicri ٣٨٩-cu ilədək davam etdi

Hicri ٢٩۶-cı ildə Misir və Məğrib məntəqəsində Übeydullah Mehdi Fatimi dövlətini .yaratdı. Bu hakimiyyət hicri ۵۶٧-ci ilədək davam etdi

Hicri ٣١٩-cu ildə Nasiruddövlə Həmdaninin vasitəsi ilə Mosul və Hələbdə Həmdanilər .dövləti yaradıldı. Bu dövlət hicri ٣٩۴-cü ilədək yaşadı

Buyə övladları Əli, Həsən və Əhməd vasitəsi ilə hicri ٣٢٠-ci ildə Təbəristan, Rey, Həmədan, İshfahan və İranın cənub əyalətlərində Ale-Buyə dövləti yaradıldı. Bu .dövlət hicri ٣٣٨-ci ilədək davam etdi

Hicri ٣٢٣-cü ildə Misir və Şam məntəqələrində Məhəmməd ibn Təcul-İxşid tərəfindən .İxşidiyyə dövləti yaradıldı və bu dövlət hicri ٣٣۴-cü ilədək davam etdi

## EYNİ DÖVRDƏ ÜÇ XƏLİFƏ

Maraqlıdır ki, kiçik qeyb dövründə İslam dünyasında eyni bir vaxtda Xilafət adı altında üç dövlət mövcud idi. Eyni bir zamanda üç şəxs xəlifəlik iddiası edir və İslam dünyasına rəhbərlik uğrunda mübarizə aparırdılar. Abbasilər Bağdadda, Əməvilər Əndəlosda və .Qurtubihdə, Fatimilər Misirdə xilafət qurmuşdular

Hicri ۲۹۶-cı ildə Misirdə xalq Übeydullah Mehdi ilə Xəlifə kimi bey'ət etdilər. Əndəlosda isə bəni-Üməyyə hakimləri xilafət təşkil etmiş və öz rəhbərlərini sultan

adlandırmışdılar. Hicri ٣١٧-ci ildə əldən çıxmış xilafəti geri qaytarmaq istəyən Əməvilər .Əbdür-Rəhmanı əmirəl-mö’minin adlandırdılar

Beləcə, hicri ٣١٧-ci ildə İslam tarixində ilk dəfə olaraq üç şəxs eyni vaxtda xəlifəlik .iddiası edirdi

### İCTİMAİ VƏZİYYƏT

Yetmiş illik bu dövrdə ictimai vəziyyət ötən dövrdəki ictimai vəziyyətdən fərqlənirdi. Əvvəlki dövrdə göstərilmiş fəaliyyətlər sonrakı dövrdə də eynən təkrarlanırdı. Əgər kiçik qeyb dövründən əvvəl xalq ağır iqtisadi üzüntülər içində yaşayırdısa, sonrakı dövrdə də eyni vəziyyət davam edirdi. İndi isə həmin dövrün ağır ictimai vəziyyətindən .danışan bə’zi hadisələri xatırlayacağıq

### MƏZHƏBLƏR VƏ FİRQƏLƏR ARASINDA İXTİLAFLAR

Kiçik qeyb dövründə İslam cəmiyyətində əvvəlki dövrdə olduğu kimi firqələr və məzhəblər arasında çəkişmələr mövcud idi. Bu ixtilaflar təkcə şiə və sünni arasındakı .ixtilaflarla məhdudlaşmırdı. Sünnilərin öz arasında da ciddi təfriqələr vardı

Hicri ٣١٠-cu ildə tanınmış sünni təfsirçisi və yazıçısı Məhəmməd ibn Cərir Təbəri dünyasını dəyişdi. Onu Bağdadda dəfn etmək istəsələr də, Təbəri ilə qarşıdurmada olan Hənbəlilər buna icazə vermədilər. Hicri ٣١٨-ci ildə Hənbəlilər Bağdadda çaxnaşma saldılar və bu çaxnaşmanın məzhəbi əsasları vardı. Çaxnaşmanın əsas səbəbi hənbəlilərin bir cür başa düşdüyü Qur’an ayəsinin digər sünni əhli tərəfindən başqa cür qəbul edilməsi idi. Belə bir təfsir ixtilafına görə çaxnaşma düşdü və xeyli insan .qırıldı

### QOHUMLUQ VƏ QƏBİLƏ İXTİLAFLARI

Bu dövrdə Abbasilər hökumətinin fəaliyyətində Abbasilər və türklərdən savay əhəmiyyətli rol oynayan yox idi. Hakimlər qalan qövmlərə yuxarıdan aşağı baxdıqlarından Abbasilər hökumətinin ikinci dövründə ələvi qiyamları zirvə nöqtəsinə çatdı. Kiçik qeyb dövründən əvvəl alovlanan ələvi qiyamları müəyyən səbəblərdən güclənə bilmirdi. Amma ümumi şəkildə istiqlal tələbi güclənmişdi. Yuxarıda qeyd

olunduğu kimi, uyğun dövrdə İslam torpaqlarında ona yaxın müstəqil dövlət fəaliyyət göstərirdi. Bu müxalifətlərin müxtəlif səbəbləri vardı. Əsas səbəblərdən biri isə .qəbilələr arası ixtilaf idi

## TƏBƏQƏ İXTİLAFLARI

İslam fəthlərinin mahiyyəti dəyişdiyindən artıq bu döyüşlərdə məqsəd xalqları

zülmdən qurtarmaq yox, şəxsi mənafelərin qorunması idi. Abbasi xilafətinin qoşunları İslami məqsədlərlə vuruşmurdu. Xalqlar zülmdən azad edilmək əvəzində əsarətə alınır, onların insanlıq hüquqlarına riayət edilmirdi. Xilafətin belə bir mövqeyi nəticəsində bir çox islami dəyərlər yaddan çıxarılmışdı. Doktor Həsən İbrahim öz yazılarında bildirir ki, həmin əsrdə ixtilafların əsas səbəbi təbəqələr arasındakı çəkişmələr idi. Qullar, qulamlar və kənizlərdən ibarət olan əzilənlər təbəqəsi uyğun çaxnaşmaların mərkəzində dayanırdı. İslami dəyərlər ayaq altına atıldığından nəğməkar və rəqqasə kənizlər böyük qiymətlərə satılırdı. Hicri ۳۲۵-ci ildə İbn-Raiq xoş .səsli bir kənizi dörd min dinara almışdı

## ƏYYAŞLIQ

Xəlifələr, vəzirlər, əmirlər və varlılar arasındakı eyş-işrət ağlasığmaz bir həddə çatmışdı. Belə bir təzahür əvvəlki dövrün də əsas xüsusiyyətlərindən idi. Süyutinin bildirdiyinə görə, yalnız abbasi xəlifəsi Qahir eyş-işrət məclislərini qadağan etmişdi. Onun göstərişi ilə xanəndə kənizlər həbs olunur, musiqi alətləri sındırılırdı. Yalnız .Qahirin iki illik hakimiyyəti dövründə harınlıqların qarşısı alındı

Eyş-işrət məclisləri təkcə Bağdad və Samirrada yayılmamışdı. Xilafətin hakimiyyəti altında olan bütün ərazilərdə eyni vəziyyət hakim idi. Misirdə Tuluniyyə əmirləri kef məclislərinə qərq olmuşdular. Tuluni hakimi Xumar-vəyh qızıldan otaq tikdirmişdi və .bu otaqda yalnız kefə məşğul olardı

## İSRAFÇILIQ VƏ BƏDXƏRCLİK

Abbasi hakimlərinin israfçılığı və bədxərcliyi elə bir həddə olmuşdur ki, bunu təsəvvür etmək çətindir. Məs’udi yazır: «Mö’təzid dörd yüz min dinar xərc çəkərək özünə bir qəsr tikdirmiş və onun adını «Sürəyya» qoymuşdur. Mənbələrdə qeyd olunur ki, bu qəsrin uzunluğu dörd fərsəxə çatırmış. Bu rəqəm inandırıcı görünməsə də, abbasi hakimlərinin xərcləri təəccüb doğurası bir həddə olmuşdur. Təkcə onu qeyd etmək kifayətdir ki, Mö’təzid Bağdadda çay kənarında əyləşib o qədər yemişdi ki, ürək ağrısı tutmuş və dünyasını dəyişmişdi. Misir hakimi Əhməd ibn Tulun da hicri ۲۷۰-ci ildə çox .yeməkdən ürək ağrısına tutulub dünyaya vida demişdi

Əhməd ibn Tulundan sonra Misir və Şamda taxta çıxmış Əbul-Ceyş Xumarvəyh yalnız eyş-işrət üçün qəsr tikdirmişdi. O, qızı üçün elə bir toy məclisi keçirmişdi ki, hətta ətrafındakılar da ona nifrət etmişdilər. Məs'udinin yazdığına görə, bu toydan sonra ona nifrət edənlər hakimi

.öldürmüş, bə'zi qulamları isə onun ətini şişə çəkmişdilər

Tulunun Mö'təzidin arvadı olmuş qızı haqqında deyirlər: «Tulun Misir beytül-malını qızının toyuna xərclədi, ona misli görünməmiş cehiz verdi. İbn Xəlkan yazır: «Bu qızın mehriyyəsi bir milyon dirhəm idi. Hansı ki, bu məbləğ qıza verilmiş cehizin müqabilində cüz'i bir şey idi». Tulunun qızına cehiz almaqla məşğul olan İbn Cəsas bazarlıq etdikdən .sonra yerdə dörd yüz min dinar qalmışdı. Tulun bu məbləği ona bağışlamışdı

Bu toy münasibəti ilə Bağdadda və Misirdə böyük xərclər hesabına xeyli bayram tədbirləri keçirilmişdi. Çox qiymətli libaslar geymiş abbasi qadınları bu eyş-işrət məclislərində iştirak edirdilər. Sanki dünyanın bütün qızıl gümüşü bu məclislərə toplanmışdı. Bu insanların azğın nəfs istəklərini doyurmaqdan başqa hədəfləri yoxdu. .Xumarvəyh ayda öz aşpazxanasına iyirmi üç min dinar pul xərcləyirdi

Yuxarıda deyilənlər abbasi xəlifələrinin, vəzirlərin, hakimlərin, valilərin və varlıların həmin dövrdəki isrfaçılıqlarının mindən bir nümunəsi idi. Ötən söhbətlərdə qeyd edildiyi kimi, Abbasilərin belə bir həyat tərzi nəticəsində Sahibe-zəncin çaxnaşmaları .kimi çaxnaşmalar cəmiyyəti bürüyürdü

## ;İDEOLOGİ VƏZİYYƏT

Əş'əri məktəbinin yaranması

Uyğun dövrün əqidə durumu ilə bağlı iki məsələni qeyd etmək lazım gəlir. Bu məsələlərdən biri Əş'əri məktəbinin yaranmasıdır. Hicri ikinci əsrin birinci yarısında yaranmış bu məktəblərdən birinin baxışına görə ağıl dəyərsiz bir şeydir, İslami maarifin və məsələlərin dərk olunmasında ayə və rəvayətlərin zahiri bilgisi kifayət edir. Onlar əqlə zidd olan bir hökmü də ayə və hədislərin zahirinə əsaslanaraq qəbul edirdilər. Məsələn, Qur'anın «Allahın əli onların əli üstündədir» ayəsinə əsaslanaraq deyirdilər ki, Allahın da əli var. Hansı ki, ayədə Allahın qüdrətinə işarə olunur. Mə'lum məsələdir ki, Allah cisim deyil və onun əli və ya başqa üzvləri ola bilməz. Bu qrupun adı .əhli-hədis idi

Bu baxışa qarşı çıxan ikinci qrup əqlə ifrat şəkildə əsaslanır və bütün həqiqətlərin əldə olunmasında ağılı əsas götürürdülər. Bu firqə xəlifə Mə'munun dövründə çox gücləndi .və əhli-hədisə qalib gəldi. İkinci qrup Mö'təzilə və e'tizal adlanırdı

Kiçik qeyb dövründən əvvəlki dövrdə əhli-hədis və e'tizal məzhəbləri arasında böyük qarşıdurmalar baş vermişdi. Bə'zən abbasi hakimlərinin himayəsi sayəsində e'tizal məzhəbi qalib gəlirdi, bə'zən isə xəlifənin rə'yinə əsasən o biri məzhəb güclənirdi. Bu qarşıdurmalar hicri IV əsrin əvvəllərində Əbül-Həsən Əş'əri meydana çıxanadək davam etdi. Qırx yaşınadək e'tizal məktəbinin davamçısı olmuş bu şəxs həmin məzhəbə arxa çevirdi və əhli-hədis əqidəsinin əsasları üzərində yeni bir məktəb yaratdı. Bu məktəb onun banisinin adı şərəfinə əş'əri adlandırılırdı. Bu məktəb Müqtədirin himayəsi sayəsinə formalaşmışdı. Onun iyirmi beş illik hakimiyyəti dövründə əş'əri məktəbi e'tizal məktəbi ilə qarşıdurmada oldu. Həmin dövrdən .başlayaraq e'tizal məktəbi tənəzzülə uğradı və əş'ərilik hakim məzhəbə çevrildi

## RƏVAYƏT KİTABLARININ TƏRTİBİ

Hicri I əsrdə ikinci xəlifə Ömərin göstərişi ilə İslam tarixi və İslami hədislər barədə kitabların tərtibi qadağan olunmuşdu. ١-ci əsrdə bu siyasət ardıcıl olaraq davam etdi. ٢-ci əsrin əvvəllində əməvi xəlifəsi Ömər ibn Əbdül-Əziz bu qanunu ləğv etdi və

Mədinə hakimi Əbu-Bəkrə məktub yazıb göstəriş verdi ki, alimlər islami hədisləri toplasınlar. Hicri ٢-ci əsrin əvvəllərində bu iş davam etdirilirdi. Abbasilər dövründə, .xüsusi ilə xəlifə Mə’munun zamanında bu istiqamətdə xeyli kitab yazıldı

Kiçik qeyb dövründə də bu iş davam etdirilirdi. Sünnə əhlinin altı mühüm kitabından dördü məhz

bu dövrdə yazılmışdı. Həmin dörd kitab Məhəmməd ibn Yəzid ibn Macə Qəzvininin «Sünəne-ibn Macə», Əbu Davud Süleyman ibn Əş’əs Səcəstaninin «Sünəne-Əbu Davud», Termizinin «Əlcameul-Səhih» və Əhməd ibn Şüeyb Nəsainin «Sünəne-Nəsayi» .kitablarından ibarətdir

Bu kitablardan əlavə yüzlərlə başqa kitablar da tərtib olunmuşdur. Bu kitablara misal olaraq «Futuhul-buldan», «Əxbarul-Təval», «Tarixe-Yə’qubi», «Tarixe-Təbəri», «Əl-futuh», .«Kafi» və sair kitabları göstərmək olar

## QEYB TARİXİ VƏ ONUN XÜSUSİYYƏTLƏRİ

Əvvəlcə imam Mehdinin (ə) qeyb dövrünün necə başlaması ilə tanış olaq. İslam :alimləri arasında bu başlanğıc haqqında bir neçə baxış mövcuddur

Bə’ziləri kiçik qeyb dövrünün sərdabədən başlandığını bildirirlər. Onların fikrincə, Mö’təmədin mə’murları həzrətin Samirradakı evinə basqın etdiyi vaxtdan həzrətin kiçik qeyb dövrü başlamışdır. Biz qarşıdakı söhbətlərimizdə sərdabə əhvalatı haqqında danışacağıq. Biz bu baxışı düzgün hesab etmirik. İmam Mehdi (ə) Abbasilərin hücumu zamanı qeybə çəkilməmişdir. Bu qeyb həmin basqın hadisəsindən qabaq baş .vermişdir

Bə’zi alimlər, eləcə də, şeyx Müfid kiçik qeyb dövrünün həzrətin dünyaya gəlişi zamanından başladığını bildirirlər. Amma əksər imamiyyə alimləri bu baxışı qəbul .etmirlər

Üçüncü baxışa əsasən, kiçik qeyb dövrü imam Həsən Əsgərinin (ə) şəhadətindən və birinci səfir Osman ibn Səid Əmri tə’yin olunduqdan sonra başlamışdır. Bu hadisələr hicri ۲۶۰-cı il rəbiül-əvvəl ayının səkkizinə təsadüf edir. Kiçik qeyb dövrü son səfir Əli ibn Məhəmməd Səməri hicri ۳۲۹-cu il, şə’banın on beşində dünyasının dəyişdiyi vaxt .başa çatmışdır. Beləcə, kiçik qeyb dövrü ۶۹- il davam etmişdir

Bu baxışı əksər imamiyyə alimləri qəbul edirlər. Kiçik qeyb dövrü həzrətin imamət .dövrüdür və bu dövrdə həzrətin dörd səfiri fəaliyyət göstərmişdir

Həzrətin öz atasının həyatı dövründə məxfi yaşadığı müddət həzrətin imamət

dövrüdür. Başqa sözlə, kiçik qeyb dövrünün iki xüsusiyyəti vardır. Onlardan biri həzrət Mehdinin (ə) imamlığı, digəri isə dörd naibin səfirliyidir. Bu iki xüsusiyyətə əsasən, imam yalnız kiçik qeyb dövründə qeybə çəkilmişdir. Hansı ki, imamın xəlvətə çəkildiyi .dövrdə bu iki xüsusiyyət olmamışdır

## İMAM HƏSƏN ƏSGƏRİNİN (Ə) ŞƏHADƏTİ

Abbasi xəlifəsi Mö'təməd imam Həsən Əsgərinin (ə) nüfuz və məqamından çox narahat idi. Xəlifə məhdudiyyət tədbirlərinin səmərə vermədiyini, əksinə, bu tədbirlər

nəticəsində imamın daha çox sevildiyini gördükdə onu qətlə yetirmək qərarına gəldi. Mö’təməd imam Həsən Əsgəriyə (ə) gizli bir şəraitdə zəhər verərək, şiələri imamın .hidayət nurundan məhrum etdi

Bu sayaq şəhadətlər əvvəllər də baş vermişdi. Əməvi və abbasi xəlifələri daim bu siyasətdən yararlanmışlar. İmamlar isə bu planları açıqlamağa çalışaraq, xəlifələrin iç .üzünü xalqa göstərmək istəmişlər

İmam Həsən Əsgəri (ə) öz qeyri-adi biliyi ilə əvvəlcədən hiss etmişdi ki, qarşıda onu ölüm gözləyir. O öz şəhadəti haqqında anasına xəbər verərək demişdi: «Hicri ۲۶۰-cı ildə bir hadisə baş verəcək; bu, həqiqətən də, imamın abbasi hökuməti tərəfindən şəhadətə yetirilməsi olacaq». Bu xəbər imamın anasını qəm dəryasına qərq etmişdi. İmam ağlayan anasına təsəlli verərək demişdi: «Ana! Allahın hökmü qətidir, dözümsüzlük göstərmə». İmamın xəbər verdiyi kimi, hicri ۲۶۰-cı ildə bu şəhadət .həqiqətə çevrildi

İmamın şəhadətindən bir neçə gün əvvəl onu dövrün zalım hakimi Mö’təmədin yanına gətirdilər. Bütün xalqın imama tə’zim etdiyini bilən Mö’təməd çox narahat idi. Xalq, doğrudan da, onu bütün ələvi və Abbasilərdən üstün tuturdu. Ona görə də Mö’təməd .həzrəti qətlə yetirmək qərarına gələrək, ona öldürücü zəhər içirdi

İmam ona verilən zəhəri içən kimi bütün bədəni od tutub yanmağa başladı. İmam yatağa düşdü və bu, ölüm yatağı idi. Mö’təmədin göstərişi ilə onun beş mə’muru imamın evinə nəzarət edirdi. Bu evdə baş verən bütün hadisələr izlənilirdi. Eləcə də həkimlərə göstəriş verilmişdi ki, imamın vəziyyətindən gecə-gündüz xəbərdar olsunlar. Hadisədən iki gün keçmiş Mö’təmədə imamın vəziyyətinin ağır olduğunu bildirdilər. Xəlifənin göstərişi ilə həkimlər imamın evini tərk etmirdilər. Mö’təməd qazilər qazisini on nəfərlə birlikdə imamın evinə göndərdi və onlara göstəriş verdi ki, gecə-gündüz orada qalsınlar. Bu insanlar imamın təbii şəkildə dünyasını dəyişdiyinə şahid durmalı idilər. Buna baxmayaraq, daha on beş mə’mur həzrətin evində keşik .çəkirdi

İmam Həsən Əsgəri (ə) rehlət gecəsi bir otaqda, hökumət mə’murlarından gizli şəkildə məktublar yazıb şiələr yaşayan müxtəlif məntəqələrə göndərdi. İmamın vəziyyəti

getdikcə ağırlaşırdı və hər an onu ölümə yaxınlaşdırırdı. Həzrət ömrünün son anlarında Allahın zikrinə məşğul idi. O, Allaha həmd oxuyur, Qur’an ayələri tilavət edirdi. Nəhayət, imam üzünü qibləyə tutdu və mübarək ruhu Allah dərgahına pərvaz etdi. Bu canyandırıcı hadisə hicri ۲۶۰-cı il, rəbiul-əvvəl ayının səkkizi, cümə günü sübh .namazından sonra baş verdi

,İmamın dünyasını dəyişməsi müsəlmanlar üçün böyük bir itki idi. Onlar öz rəhbərlərini

sevimli xeyirxahlarını əldən vermişdilər. Daim zəiflərin, yetimlərin, yoxsulların həmdərdi olan bir şəxs dünyasını dəyişmişdi. İmamın evindən nalələr ucaldı. Əli (ə) ailəsinin fəryadları bütün Samirrada eşidilməkdə idi. İmamın dünyasını dəyişməsi xəbəri ildırım sür'əti ilə şəhərə yayıldı və müsəlmanlar öz imamlarının mənzilinə üz tutdular. İmamın evi ətrafında ah-nalə səsləri dövrə vururdu. Bütün dövlət idarələri işini saxlamışdı. İmama hörmət əlaməti olaraq bazarlar bağlanmışdı. Bütün şəhər .əzadarlıq içində idi. Samirra şəhəri sanki qiyamət səhnəsinə dönmüşdü

Samirra belə bir izdiham görməmişdi. Bütün təbəqələrdən, əqidədən olan insanlar bir yerə toplanıb imamın fəzilətlərindən, ilahi xüsusiyyətlərindən danışırdılar. Hamı .imamın gedişini müsəlmanlar üçün böyük bir itki sayırdı

İmamın qüsl, kəfən və dəfn işləri ilə Osman ibn Səid Əmri məşğul oldu. Şiə e'tiqadına görə hər bir imamı ondan sonrakı imam dəfn etməli, onun üçün namaz qılmalıdır. Amma imam Həsən Əsgərinin (ə) vəfatından sonra xüsusi bir şərait yaranmışdı və təqiyyə gözlənilirdi. İkinci bir tərəfdən Osman ibn Səid Əmri həzrət Mehdinin (ə) naibi olaraq bu işləri görürdü. Əlbəttə ki, imamın vəfat etdiyi dövr və şərait əvvəlkilərdən fərqlənirdi. Übeydullah ibn Xaqan deyir: «İmamın cənazəsi dəfnə hazır olduqda xəlifə imamın cənazəsinə namaz qılmaq üçün qardaşı Əbu-İsa ibn Mütəvəkkili göndərdi. Cənazə namaz üçün yerə qoyulduqda Əbu-İsa cənazəyə yaxınlaşdı və həzrətin üzünü açıb onu ələvilərə, Abbasilərə, qazilərə, alimlərə və digər şahidlərə göstərdi və dedi: «Bu Əbu-Məhəmməd Əsgəridir ki, təbii şəkildə dünyasını dəyişmişdir. Onun təbii şəkildə öldüyünə qazilər, həkimlər, mə'murlar şəhadət verirlər». Sonra cənazənin .üzünü örtdü, ona namaz qıldı və göstəriş verdi ki, cənazəni dəfn üçün aparsınlar

Bu üsul abbasi hakimlərinin şiə imamlarına münasibətdə təcrübədən keçirdiyi bir üsul .idi. Xalq, xüsusi ilə də şiələr bu üsulla az-çox tanış idilər

Şeyx Səduqun nəql etdiyinə görə, bu namazdan qabaq evin daxilində həzrət üçün başqa bir namaz da qılındı. Xadim yataqdan bayıra çıxdı və imamın qardaşı Cə'fərə müraciətlə dedi: «Ey mənim ağam, qardaşınız kəfən edildi. Ona namaz qılın». Bu vaxt .«imam Mehdi (ə) göründü və dedi: «Mən atamın namazını qılmağa daha layiqəm

Məşhur bir rəvayətə görə, imam Həsən Əsgəri (ə) Mö'təməd tərəfindən

zəhərləndikdən sonra xəstələndi və rəbiul-əvvəlin səkkizində dünyasını dəyişdi. Buna əsasən də, imam Mehdinin (ə) imaməti həmin tarixdən götürülməlidir. Həzrət elə həmin vaxtdan da pərdə arxasındadır. Şübhəsiz ki, həzrət bir gün zühur edər və yer .üzünü ədalətlə doldurar

Kitabın beşinci fəslində qeyd etdiyimiz kimi, on iki imamın xəbərləri həzrət Peyğəmbərdən və onun ailəsindən nəql olunmuşdur. Abbasi xəlifələri bu inamla mübarizə aparır, şiələri belə bir inamdan çəkindirməyə çalışırdılar. Onlar həzrət Musanın dünyaya gəlişindən qorxaraq bu doğumun qarşısını almaq istəyən Fir'on kimi həzrət Mehdinin (ə) dünyaya gəlişindən narahat idilər. Mö'təbər rəvayətlərin və'd etdiyi kimi, nə vaxtsa zühur edən həzrət imam zalım hökumətlərin əyyaşlığına son .qoymalı idi

Bu səbəbdən də imam Həsən Əsgərini (ə) nəzarət altına aldılar, onun dünyaya gələsi övladını qətlə yetirmək fikrinə düşdülər. Onlar haqqında Peyğəmbərin xəbər verdiyi .Mehdini (ə) aradan götürməklə öz harın həyatlarını qorumağa çalışırdılar

Daha üstün biliyə malik olan Əhli-beyt imamları həzrət Mehdinin (ə) qeybi haqqında öncədən xəbər vermişdilər. Bu isə Abbasilərin planlarını pozurdu. Qarşıya çıxacaq maneələri öncədən bilən imamlar həzrət Mehdinin (ə) viladətini məxfi saxlamaq kimi tədbirlər görürdülər. Yalnız xüsusi şiələr bu məsələdən xəbərdar idi. İmam Həsən Əsgəri (ə) şəhadətə çatdıqdan sonra bu xəbər yayılmağa başladı. Mə'lum oldu ki, imamın övladı olmuşdur və bu övlad on ikinci imam, və'd edilmiş Mehdidir. Bu xəbər Abbasiləri qorxuya saldı. İmam Həsən Əsgəridən (ə) sonra onun övladının qalması xəbəri Mö'təmədin on ikinci imamı qətlə yetirmək fikrinə saldı. Həzrətin evində axtarış aparıldı, sonra isə mənzil möhürləndi. Mö'təməd azğın bir hərisliklə imamın övladını axtarmağa başladı. Hətta imam Həsən Əsgərinin (ə) arvadları və kənizlərinin hamilə olub-olmadığı yoxlanıldı. Kənizlərdən birinin hamil olduğu ehtimal edildiyi üçün onu uzun bir müddət nəzarət altında saxladılar. Nəhayət, mə'lum oldu ki, kəniz hamilə .deyilmiş

Tarixi mənbələrdə qeyd olunur ki, imamın anası Nərcis Xatun nəzarət altına alındı. Onlar Nərcis xatunun vasitəsi ilə imamı tapmaq istəyirdilər. Amma həmin dövrdə .ardıcıl olaraq baş verən hadisələr abbasi hakimlərinin başını qatdı

Farslara qalib gəlmiş Yə'qub ibn Ləys Səffari Bağdada hərəkət etdi. Mö'təməd və Mütəvəkkil Samirradan çıxıb Yə'qub Ləyslə qarşılaşmaq üçün Bağdada səfər etdilər.

Mö'təmədin vəziri Übeydullah ibn Yəhya ibn Xaqan və Nərcis Xatuna nəzarəti öhdəsinə götürmüş qazilər qazisi dünyasını dəyişdi. Bu hadisələrin ardınca Sahibe-Zənc qiyam qaldırdı və Abbasilərin müşkülləri daha da artdı.

### CƏ'FƏRİN HƏRƏKƏTLƏRİ

İmam Həsən Əsgərinin (ə) qardaşı Cə'fər öz atası və qardaşının əqidəsinə zidd

hərəkət etdi. İmam Hadidən (ə) oğlu Cə’fər haqqında rəvayət olunmuşdur ki, həzrət bə’zi səhabələrinə buyurmuşdur: «Oğlum Cə’fərdən uzaq olun. Çünki o mənim üçün Nuhun oğlu kimidir». Cə’fər qardaşı imam Həsən Əsgərinin (ə) vəfatından sonra şə’ninə layiq olmayan işlər gördü. O, qardaşının cənazəsinə onun oğlu imam Mehdi (ə) namaz qılmalı olduğu halda bu namazı özü qılmaq istədi. Cə’fər abbasi vəziri Übeydullah ibn Yəhya ibn Xaqana dedi: «Qardaşımın məqamını mənə verin. Mən ildə buna görə sizə iyirmi min dinar verərəm». Vəzir Cə’fərə dedi: «Ey axmaq! Sultan sənin atanı və qardaşını imam hesab edənlər üçün qılıncını hazırlamışdı. Bununla belə onları öz əqidəsindən döndərə bilmədi. Əgər şiələrin yanında atanın və qardaşının məqamına malik olsan, sultanın təsdiqinə ehtiyac yoxdur. Yox əgər belə bir məqamın .yoxdursa, sultan o məqamı sənə verə bilməz

Sonra vəzir Cə’fəri təhqir etdi və bir daha onu yanına buraxmadı. Vəzirdən ümidini üzmüş Cə’fər sultanın yanına getdi. Amma xəlifədən də eyni cavabı eşitdi. Bu səbəbdən də imam Kazimin oğlu Cə’fər tarixdə «Cə’fəre-kəzzab», yə’ni yalançı Cə’fər .kimi tanınmışdı

Cə’fərin digər ləyaqətsiz işi imam Həsən Əsgərinin mülkünə sahib olmaq istəməsi idi. O deyirdi ki, qardaşımın övladı yoxdur və onun yeganə varisi mənəm. Abbasilər .Cə’fərə qardaşının mülkünə sahib olmaq icazəsi verdilər

## İMAM MEHDİNİN (Ə) HƏBSİ ÜÇÜN GÖRÜLƏN TƏDBİRLƏR

Qardaşı imam Həsən Əsgərinin (ə) övladı olduğunu bilən Cə’fər canişinlikdən ümidini üzdükdən sonra imam Mehdini (ə) Abbasilərə təhvil vermək istədi. Bu hadisə Qumdan gəlmiş hey’ətlə görüşdən sonra baş verdi. Bu hey’ətin suallarını cavablandıra bilməyən Cə’fər xəlifənin yanına gedib onlardan xəbərçilik etdi. Xəlifə Qumdan gəlmiş hey’ətə dedi: «İmam Həsən Əsgəri (ə) üçün gətirdiyiniz pulu Cə’fərə verin. Onlar dedilər: «Biz müəyyən şərtlər daxilində pulu verə bilərik. Çünki bu pulun sahibləri qarşımıza şərtlər qoyublar». Cə’fər bu insanların həbsi üçün çalışsa da, xəlifə onun istəyinə mənfi cavab verib hey’əti azad etdi. Qum hey’əti şəhərdən çıxdıqdan sonra imam Mehdi (ə) öz xidmətçisini onların görüşünə göndərdi. Xidmətçi imamın sözlərini onlara çatdırdıqdan .sonra hey’ət gətirdiyi məbləği xidmətçiyə təhvil verdi

Cə’fər yenidən Mö’təmədin yanına gedib dedi: «Qumdan gəlmiş hey’ət gətirdiyi məbləği Mehdiyə (ə) təhvil verdi». Beləcə, imamın evinə basqın edildi. Ev qarət olundu. Onların başının qatıldığını görən imam (ə) mənzildən xaric oldu. Amma Nərcis Xatunu .həbs edib, sorğu-suala çəkdilər

## CƏ’FƏRİN TÖVBƏSİ

Qeyd etməliyik ki, imam Mehdi (ə) şiələrin Cə'fər haqqında verdiyi suala cavab olaraq Məhəmməd ibn Osman ibn Səid Əmriyə yazdı ki, əmisi Cə'fər və onun övladları həzrət .Yusifin qardaşları tək nəhayətdə tövbə etmişlər

## SƏRDABƏ ƏHVALATI

Bəs həzrət Mehdi (ə) harada və necə qeybə çəkildi? Doğrudanmı imam atasının ?mənzilindəki sərdabədə qeybə çəkilmiş və hələ də oradadır

Bu mövzu ilə bağlı şiələrə qarşı bir çox ittihamlar irəli sürülmüşdür. Müxaliflər deyirlər: «Şiələrin e'tiqadına görə, abbasi xəlifəsinin mə'murları Samirrada həzrətin mənzilinə hücum etmişlər ki, onu həbs etsinlər. Həmin vaxt sərdabədə olan həzrət insanların nəzərindən qeybə çəkilmişdi. Hələ də o sərdabədədir və yemək-içməksiz yaşayır. Bir gün oradan zühur edəcək». Əlbəttə ki, deyilənlər böhtandır. Bu uydurma əhvalat o .qədər yayıldı ki, hətta həzrətə «Sərdabə sahibi» ləqəbi verildi

Hansı ki, şiə mənbələrində sərdabə sözü iki dəfədən artıq işlədilməmişdir. Uyğun kələməni öz qeydlərində xatırladan sünnə əhli eyni əhvalat vasitəsi ilə şiələrə hücum edirlər. Onlar güman edirlər ki, şiələr öz imamlarını sərdabədə axtarıb və sərdabədən zühur edəcəyini gözləyirlər. Belə bir əhvalatı danışanlar şiə mənbələrinə müraciət .etmək istəmirlər

Hansı ki, şiə tarixinə və rəvayətlərinə görə imam Mehdi (ə) doğulduğu gündən məxfi olmuşdur. İmamın həyatının bu dövrü «ixtifa» dövrü adlandırılır. O, yalnız atasının vəfatından sonra qeybə çəkilmişdir. Kiçik qeyb dövrü imam Həsən Əsgərinin (ə) vəfatından sonra başlayır. Atasının dəfnindən sonra mənzilə qayıdan imamı bir daha .cəmiyyət arasında görən olmamışdır

Şiə rəvayətlərinə əsasən həzrət insanlar arasında yaşayır, həcc mərasimində iştirak edir. Sadəcə, insanlar onu tanımırlar. Haqqında danışılan evin iki hissəsi olmuşdur. Evin bir hissəsi kişilərə, digər bir hissəsi isə qadınlara aid imiş. Otaqların altında isə sərdabə yerləşirmiş. İsti günlərdə ev əhli sərdabədə yaşayırmış. Şiələr bu evi və həmin sərdabəni möhtərəm sayırlar. Çünki onların imamları bu evdə yaşamışdır. Bu evdə imam Hadi (ə), imam Həsən Əsgəri (ə), eləcə də, imam Mehdi (ə) Allaha ibadət

etmişlər. Təbii ki, rəhbərə olan sevgi ona aid olan başqa şeylərə də diqqəti artırır. Bütün dinlərdə və məzhəblərdə belədir. Şiələr məhz ilahi eşq əsasında müqəddəs məkanları qoruyurlar. Amma belə bir ehtiram müxaliflərin töhmətlərinə əsas ola .bilməz

Həqiqət budur ki, həzrət Mehdinin (ə) Samirrada sərdabədə qeybə çəkilməsi yalan və

.böhtandır. Heç bir şiə alimi belə bir əqidədə deyil

## SƏRDABƏ HAQQINDA İKİ TARİXİ MƏ'LUMAT

Abbasi Mö'təzidin xilafətinin başlanğıcında, hicri iki yüz yetmiş doqquzuncu ildə imam Həsən Əsgərinin (ə) evində iki dəfə axtarış aparıldı. Bir dəfə Mö'təzid üç nəfəri məxfi olaraq həzrətin evinə göndərdi və göstəriş verdi ki, evdə kimi görsələr, öldürsünlər və başını xəlifəyə gətirsinlər. Bu üç nəfər evə daxil oldular və evdə gözəl pərdəli bir məxfi otaq tapdılar. Pərdəni qaldırdıqları vaxt sanki coşub-daşan bir dərya gördülər. Bu dəryanın qurtaracağında bir şəxs ayaqlarının altında həsir, suyun üzərində dayanıb namaz qılırdı. Otağa daxil olmuş mə'murlardan ikisi suya girib irəli getmək istədilər. Amma qərq olmaq təhlükəsi ilə üzləşib geri qayıtdılar. Nəhayət, bu üç nəfər arasındakı başçı namaz qılan şəxsdən üzr istədi. Amma namaz qılan şəxs onlara əhəmiyyət vermədən namazına davam etdi. Xəlifənin göndərdiyi adamlar geri qayıdıb .«gördüklərini ona danışdılar. Xəlifə dedi: «Gördüklərinizi kimsəyə danışmayın

Başqa bir dəfə də Mö'təzid bu evə basqın etdi. İmam Həsən Əsgərinin (ə) evinə soxulmuş dəstə sərdabədə Qur'an qiraəti səsi eşitdilər. Sərdabədən kiminsə çıxacağını gözləməyə başladılar. Sərdabədə olan şəxs isə onların diqqətsizliyindən istifadə edib sərdabədən çıxdı. Dəstənin rəisi ətrafdakılara göstəriş verdi ki, sərdabəyə daxil olub, Qur'an oxuyan şəxsi tutsunlar. Onlar dedilər: «Məgər onun çıxıb getdiyini görmədinmi?» Dedi: «Bəs nə üçün onu tutmadınız?» Dedilər: «Biz düşündük ki, .«sən onu görürsən. Ona görə də hərəkət etmədik

Şiə rəvayətlərində həzrət Mehdi (ə) ilə bağlı yalnız bu iki rəvayətdə sərdabə sözü işlədilmişdir. Bu iki rəvayət isə kiçik qeybdən on doqquz il sonraya aiddir. Həm də rəvayətlərdə həzrətin sərdabədən çıxdığı bildirilir. Bu əhvalatlarda deyilənlərlə müxaliflərin uydurduğu əhvalatlardakı iddialar heç vəchlə uyuşmur. Şiələrin hər sübh və axşam sərdabənin qarşısında dayanıb, imamlarının zühurunu gözləmələri tamamilə .əsassız bir böhtandır

## QEYBİN FƏLSƏFƏSİ

Qeyb fəlsəfəsi, intizarın rolu, imam Mehdinin (ə) xüsusiyyətləri, onun ömrünün

uzunluğunun səbəbi, zühur zamanı və zühurdan sonrakı hadisələr kimi tarixi çaları olmayan mövzulardan söhbət getdikdə bu mövzuları geniş izah etmək lazım gəlir. Amma mövzular kitabımızda tarixi baxımdan araşdırıldığından uyğun mövzular haqqında xülasə şəkildə danışmağa məcburuq. Həzrət Peyğəmbər (s) və onun girami Əhli-beytinin (ə) imam Mehdinin (ə) qeybinə münasibəti ilə

.tanış olmaq üçün bə’zi rəvayətlərə ötəri nəzər salacağıq

Müsəlmanların həzrət Mehdinin (ə) bəşəriyyətin xilaskarı olmasına, gələcəkdə zühur edib qiyam qaldıracağına, yer üzünü ədalətlə dolduracağına olan inamı həzrət Peyğəmbər dövründən vardı. Bu inam islami e’tiqadlar sırasında idi. Həzrət Peyğəmbərin əhli-beytindən və Fatimə (s) övladlarından olan Mehdinin (ə) qiyamına e’tiqad həm şiə, həm də sünni məzhəbində qəbul olunmuş bir e’tiqaddır. Sadəcə, sünni əhlinin fikrincə, həzrət Mehdi (ə) hələ ki doğulmayıb və dünyanın sonunda zühur edəsidir. İmamiyyə şiələri isə həzrət Mehdinin (ə) hal-hazırda qeybdə olduğuna e’tiqadlıdırlar. İmamın qeybdə olması xalqın hazırlığı və intizarı ilə əlaqəlidir. Buna görə də şiələr uyğun zühura hazırlığı və imamın intizarında olmağı ən fəzilətli əməllərdən .sayırlar

İmamiyyə məzhəbinin haqq olmasının dəlillərindən biri də mə’sum imamların uzun illər boyu həzrət Mehdinin (ə) qeybi haqqında xəbər verməsidir. Tarix şahiddir ki, on ikinci imam həzrət Peyğəmbər və əvvəlki imamların buyurduğu şəkildə qeybə çəkildi. Artıq kimsə iddia edə bilməz ki, on iki imamçı şiələr həzrət Mehdinin (ə) qeybi haqqında hədislər düzəltmişlər. Həzrətin qeybinin gerçəkliyi Allahın şiələrə əta etdiyi bir .ne’mətdir

Bəs həzrət Mehdinin (ə) qeybinin hikməti və fəlsəfəsi nədir? Nə üçün həzrət Mehdi (ə) əvvəlki imamlar tək xalq arasında aşkar yaşamamışdır? Bu sualların cavabında deyə bilərik ki, bu hadisəyə təbii bir hadisə kimi baxsaq, qeybin səbəbi kimi Abbasilərin taliblərə yönəlmiş təzyiqlərini nəzərdən qaçırmamalıyıq. Bu baxımdan, imamın xəlvətə çəkilməsi və qeybi həmin dövrün imamlara qarşı günbəgün sərtləşən siyasətinin nəticəsidir. Daha aydın desək, imamlar Abbasilərin uyğun siyasətinə qarşı ixtifa və qeyb üsulundan faydalanmışlar. Bu işdə əsas məqsəd son imamı dövrün təhlükəli hadisələrindən qorumaq olmuşdur. İmam Cavadın (ə) dövründən başlayaraq mə’sum imamlara qarşı yönəldilmiş siyasi təzyiqlər günbəgün artmışdı. Bu təzyiqlər nəticəsində on ikinci imamın fəaliyyətləri son dərəcə məhdudlaşdırılmışdı. Artıq on ikinci imamın fəaliyyəti üçün heç bir şərait qalmamışdı. Belə bir məqamda Allahın iradəsi ilə həzrət Mehdi (ə) qeybə çəkildi. Doktor Casim Hüseyn bu barədə yazır: «Abbasi hökumət başçıları imamların fəaliyyətlərini məhdudlaşdırmaq fikrində idilər.

Ona görə də imamları öz saraylarına aparır, nəzarət altında saxlayırdılar. Onlar bu yolla imamların öz ardıcılları ilə əlaqə saxlaması imkanını aradan qaldırırdılar. İmam Rizanın (ə) dövründə imamlara qarşı başlamış məhdudlaşdırma fəaliyyətləri on birinci imamın dövründən davam etdi. Nəticədə imamlar da öz son canişinlərini mövcud şəraitdən qorumaq üçün siyasət seçdilər. İmamlar belə bir nəticəyə gəldilər ki, on birinci imamın övladı Abbasilərin nəzərlərindən gizli qalsın. O yalnız bu yolla, gizli şəkildə

fəaliyyətini davam etdirə bilərdi. Hədislərdə elə bir imamın vücudu haqqında öncədən xəbər verilir ki, o, nəzərlərdən gizli qalsın, öz siyasətlərini ardıcılları arasında məxfi şəkildə yerinə yetirsin. Bu imam on ikinci imamdır. Belə tədbirlər əvvəlcədən görülmüşdür ki, imamiyyə şiələri səfirləri vasitə olaraq qəbul etməyə hazır olsunlar».

Casim Hüseynin dilindən bəyan olunmuş qeyb fəlsəfəsi İslam rəvayətlərində başqa bir formada nəql olunmuşdur. Mə'sum imamlar müxtəlif məqamlarda bu məsələyə toxunmuşlar. İndi uyğun mövzuları işıqlandıran İslami rəvayətlərə nəzər salaq. İmam Mehdinin (ə) fəlsəfəsi haqqında peyğəmbər əhli-beytinin buyuruqları ilə tanış olaq.

## İLAHİ SİRLƏRDƏN BİRİ

İmam Mehdinin (ə) qeybə çəkilməsi Allahın sirlərindən biridir. Bu hadisənin əsil hikməti bəndələr üçün məxfidir. Bu məsələ yalnız həzrətin zühurundan sonra aydınlaşasıdır. Həzrət Peyğəmbər buyurur: «Ey Cabir! Bu Allahın öz bəndələrinə məxfi saxladığı işlərindən və sirlərindəndir». İmam Sadiq (ə) buyurur: «Həqiqətən də, Sahibul-əmr üçün (imam Mehdi (ə)) qarşısıalınmaz bir qeyb vardır. Hər batil axtaran onda şəkkə düşər. Bunun səbəbini bəyan etməyə icazəmiz yoxdur. Bu qeybin hikməti əvvəlki qeyblərin hikmətidir və zühurdan sonra aydınlaşacaq. Necə ki, Xızrın körpə oğlanı öldürməsi, uçmuş divarı bərpa etməsi Musa üçün qaranlıq qalmışdı və yalnız ayrıldıqda aydın oldu. Qeyb Allahın işlərindən və sirlərindəndir».

## SALEH İNSANLARIN SINAĞI VƏ SEÇİLMƏSİ

Bə'zi rəvayətlərdə bildirilir ki, əsrin imamının qeybinin hikməti saleh insanların xəlbirdən keçirilməsi və sınağa çəkilməsidir. Əmirəl-mö'minin Əli ibn Əbi-Talib (ə) buyurur: «And olsun Allaha, mən də, bu iki övladım da şəhid olacağıq. Allah-təala axır zamanda mənim övladlarımdan birini bizim qanımızı almaq üçün ayağa qaldırar. O bir müddət qeybə çəkilər ki, xalq seçilsin, azğınlar mə'lum olsun. İş bir yerə çatar ki, nadanlar deyər: «Allahın artıq ali-Məhəmmədlik bir işi qalmayıb».

İmam Hüseyn (ə) buyurur: «İmam Mehdi (ə) üçün qeyb dövrü vardır. Bu qeyb dövründə bə'ziləri dindən çıxar, bə'ziləri möhkəm dayanar. Kim bu qeyb dövründə düşmənlərin yaratdıqları çətinliklərə səbr etsə, Allah ona elə bir savab verər ki, sanki

.«peyğəmbərlə yanaşı qılınc çəkib düşmənlərlə döyüşmüşdür

İmam Baqir (ə) Fərəclə (zühurla) bağlı verilən sualı belə cavablandırır: «Şiələr ciddi bir ilahi imtahandan keçməyincə həzrət zühur etməyəcək». İmam Sadiq (ə) buyurur: «İmam Mehdinin (ə) qeybi şiələrin imtahana çəkilməsidir». İmam Musa ibn Cə’fər (ə) buyurur: «Bu

.qeyb Allah-təalanın öz bəndələrini imtahana çəkməsi üçündür

### İNSANLARIN ZALIMLIĞI

Bə’zi rəvayətlərdə qeybin fəlsəfəsi kimi insanların zalımlığı göstərilir. Əmirəl-mö’minin Əli (ə) Kufə məscidində buyurdu: «Yer üzü ilahi höccətsiz olmur. Amma Allah-təala .«insanların zalımlığı səbəbindən onları öz höccətinin vücudundan məhrum edər

### DÜNYANIN HAZIRLIĞI

Həzrət Mehdinin (ə) sonuncu canişin və bəşəriyyətin xilaskarı ünvanı ilə zühur edib yer üzündə İslamı başqa dinlərə qalib etməsi üçün, şübhəsiz ki, dünyanın hazırlığı və şərait lazımdır. Belə bir məqsədin gerçəkləşməsi üçün yer üzündə münasib şərait yaranmalıdır. Buna əsasən də yer üzündə hazırlığın olmamasını imam Mehdinin (ə) .qeybinin fəlsəfəsi kimi qəbul edə bilərik

### DÖVRÜN ZALIMLARINA BEY’ƏT VƏ ƏSARƏT BOYUNDURUĞUNDAN AZAD OLMAQ

Bə’zi islami rəvayətlərdə bildirilir ki, imam Mehdinin (ə) qeybinin səbəbi onun bu yolla zalımların bey’ətindən azad olmasıdır. Həzrət heç bir zalım hakimə bey’ət etməmiş, onun hakimiyyətini tanımamışdır. Ona görə də o qiyam edəcəyi vaxt azad olasıdır. Digər imamlar təqiyyə səbəbindən öz dövrlərinin hakimiyyətini tanımışlar. İmam Mehdi (ə) isə heç bir hökumət qarşısında öhdəçilik götürməmişdir. Əgər imam qeybə .çəkilməzdisə, şübhəsiz ki, dövrün zalım hökumətlərinə bey’ətə vadar edilərdi

İmam Həsən Müctəba (ə) bu barədə buyurur: «Bizim hər birimiz öz dövrümüzdə təqiyyə səbəbindən dövrün hakiminə bey’ət etmişik. Yalnız İsa ibn Məryəmin iqtida edəcəyi imam Mehdi (ə) belə olmayacaq. Allah onun dünyaya gəlişini məxfi saxlayacaq və onu qeybə çəkəcək. O qiyam etdiyi vaxt öhdəsində heç bir hakimə bey’ət .«olmayacaq

.Digər mə’sum imamlardan da bu mövzuda rəvayətlər nəql edilmişdir

Müqəddəs nahiyədən Məhəmməd ibn Osman Əşri vasitəsi ilə İshaq ibn Yəquba belə bir namə gəldi. Həzrət namədə buyururdu: «Allah-təala qeybin nə üçünlüyü barədə buyurur: «Ey mö’minlər! Cavabı sizə xoş gəlməyəcək şeylər barədə soruşmayın. Mənim

atalarımın hamısı təqiyyəni gözlədilər və öz dövrlərinin hakiminə bey’ət etdilər. Amma mən qeyb pərdəsi arxasında olduğumdan kimsəyə bey’ət etmədim. Vaxtı çatanda azad şəkildə qiyam edəcəyəm».

## İMAM MEHDİNİN (Ə) QORUNMASI

Allah-təala on ikinci imamı düşmənlərin fitnələrindən qeyb vasitəsi ilə qorumuşdur. Əgər imam Mehdi (ə) qeybə çəkilməsəydi, onun qanına susamış, ata-babalarını qətlə yetirmiş abbasi xəlifələri, şübhəsiz ki, onu da şəhid edəcəkdilər. Belə olduqda yer üzü höccətsiz qalardı. İmam son imam olduğundan yer üzü höccətsiz qala bilməzdi. Bu barədə əhli-beyt imamlarından xeyli rəvayət nəql olunmuşdur. İmam Baqir (ə) buyurur: «Bizim qaimimiz üçün qiyam etməzdən qabaq qeyb vardır. Bu qeybin səbəbi .«onun qətlə yetirilməsinin qarşısının alınmasıdır

Şeyx Tusi qeybin fəlsəfəsi haqqında bir neçə rəvayət nəql etdikdən sonra yazır: «Qeybin hikməti və fəlsəfəsi haqqında xəbərlərdə deyilənlər əslində qeybin öz fəlsəfəsi haqqında yox, onun nəticələrinin fəlsəfəsi haqqındadır. Qeybin səbəbi isə imamın .«həyatının düşmənlərdən qorunması olmuşdur

## KİÇİK QEYB DÖVRÜNÜN XÜSUSİYYƏTLƏRİ

Qeyd etdiyimiz kimi, imam Mehdinin (ə) ixtifa dövründən və imam Həsən Əsgərinin (ə) rehlətindən sonra iki növ qeybi olmuşdur. Kiçik qeyb adlanan birinci dövr ixtifa dövrü başa çatdıqdan sonra başlamış və altmış doqquz il davam etmişdir. Kiçik qeyb dövrü başa çatdıqdan sonra böyük qeyb dövrü başlamış və bu dövr hazırda da davam .etməkdədir

İmam Həsən Əsgərinin (ə) şəhadəti və həzrət Mehdinin (ə) imaməti ilə başlayan kiçik qeyb dövrü həzrətin dördüncü səfiri Əbül-Həsən Əli ibn Məhəmməd Səmərinin vəfatı :ilə başa çatmışdır. Bu dövrün səciyyəvi xüsusiyyətlərini nəzərdən keçirək

Kiçik qeyb dövrü məhdud olmuşdur və yetmiş ilə qədər davam etmişdir. Bu dövr .١ məhdud olduğu üçün kiçik qeyb dövrü adlanmışdır. Böyük qeyb dövrü hazırda da davam etdiyindən və onun müddəti yalnız Allaha mə’lum olduğundan bu dövrü böyük .qeyb dövrü adlandırmışlar

Kiçik qeyb dövründə imam Mehdi (ə) əksər insanlardan məxfi şəkildə yaşasa da, öz .٢ vəkilləri, səfirləri ilə təmasda olmuşdur. Hətta bu səfirlər bə’zi insanları imam Mehdi (ə) .ilə görüşdürmüşlər

Xalq öz suallarını dörd səfir vasitəsi ilə imama çatdırmış və onlardan cavab almışdır. Uyğun dövrdə müqəddəs nahiyədən dörd səfir vasitəsi ilə şiələrə göstərişlər .verilmişdir

Amma dördüncü səfir Səmərinin vəfatından sonra böyük qeyb dövründə bütün rabitələr kəsilmişdir. Səmərinin ölümündən bir neçə gün qabaq imam Mehdi (ə) ona həyatının başa çatması haqqında xəbər vermişdir. Yetmiş il əvvəl davam etmiş bu sayaq rabitələrə böyük qeyb dövründə təsadüf edilmir. İmamın bu izahatı haqqında növbəti söhbətlərimizdə

danışacağıq.

۳. Kiçik qeyb dövründə imamın dörd vəkil və ya nümayəndəsi olmuşdur. Bu dörd şəxs üçün biri o birinin ardınca vəkillik hökmü çıxarılmışdır. İmamın digər nümayəndələri bu dörd səfirdən göstəriş almışlar. Amma kiçik qeyb dövrü başa çatdıqdan sonra xüsusi bir nümayəndə olmamışdır. Mə'sum imamların göstərdiyi şərtlərə malik olanlar həzrətin ümumi nümayəndələri sayılmaqdadırlar. Ona görə də kiçik qeyb dövründən sonrakı dövrü fəqihlərin rəhbərlik və ya vəkillik dövrü kimi təqdim etmək olar.

۴. Kiçik qeyb dövründə bə'zi insanlar həzrəti görüb tanıya bilərdilər. Böyük qeyb dövründə isə kimsə onu görmür, görənlər isə tanımırlar.

Hətta bə'zi xüsusi insanlar həzrəti görüb tanısalar, bu barədə başqalarına danışmaq haqqına malik deyillər. Yalnız həzrətin öz icazəsi ilə e'tibarlı şəxslərə bu barədə mə'lumat vermək olar.

## İMAM HƏSƏN ƏSGƏRİNİN VƏFATINDAN SONRA FİRQƏLƏRARASI İXTİLAFLAR

Abbasi hakimləri mahiyyət e'tibarı ilə zülm-sitəm yolu seçmişdilər və günbəgün xalq arasındakı nüfuzlarını itirirdilər. Əksinə, mə'sum imamlar öz keçmişləri və bugünki rəftarları ilə İslam ümməti arasında daha çox sevilməkdə idilər.

Abbasi hakimləri vaxt ötdükcə ictimai dayaqlarını itirirdilərsə, şiə imamları daha çox ictimai dəstək qazanırdı.

Belə bir gediş zalım abbasi hakimlərinə ağır gəldiyindən onlar günbəgün öz zülmlərini artırırdılar. Onların imamlara münasibətdə düşmənçiliyi elə bir həddə çatmışdı ki, hətta imam Həsən Əsgərinin (ə) mənzili nəzarət altına alınmışdı. Şiələr öz imamları ilə görüşməkdə çətinlik çəkirdilər. Abbasilər imam Həsən Əsgəridən dünyaya gələcək körpəni öldürmək qəsdində idilər.

Təbii ki, Abbasilərin belə siyasəti imam Həsən Əsgərini (ə) ehtiyatlı olmağa, təqiyyəni gözləməyə sövq edirdi. Bəli, imam Həsən Əsgərinin (ə) dövründə təqiyyə ən yüksək həddinə çatdı. İmam Həsən Əsgəri (ə) əvvəlki imamlardan daha çox təqiyyə edir, xüsusi ilə də, imam Mehdinin (ə) dünyaya gəlişini gizli saxlayırdı.

## İMAM HƏSƏN ƏSGƏRİDƏN (Ə) SONRA YENİ ŞİƏ FİRQƏLƏRİ

Həzrət Mehdinin (ə) dünyaya gəlişinin məxfiliyi imam Həsən Əsgərinin (ə) vəfatından sonra imamət məsələsinə münasibətdə şiələr arasında tərəddüdə səbəb oldu. Şiə əqidəsinə görə imamət məqamına seçilmək üçün on birinci imamın oğlu olmalı idi. İmam Həsən Əsgərinin (ə) övladından xəbərsiz olanlar bu barədə şəkk-şübhəyə .düşdülər

səh:١٠٩

Mənbələrdə bildirildiyinə görə imam Həsən Əsgəridən (ə) sonra onun ardıcılları on dörd və ya on beş firqəyə böləndülər. Bu firqələrin sayının iyirmiyə çatdığını bildirənlər .də var

İmam Mehdinin (ə) dünyaya gizli gəlişi və gizli həyat sürməsi bir tərəfdən, imam Həsən Əsgərinin (ə) qardaşı Cə'fərin imamlıq iddiası digər bir tərəfdən şiələri çaşqın vəziyyətdə qoydu. Bu tərəddüdlü vəziyyətdən istifadə edən digər məzhəblər imamiyyə məzhəbinə yetərincə zərbələr vurdular. Mö'təzilə, əshabe-hədis, zeydiyyə .ardıcılları, eləcə də, Abbasilər şiəliyə qarşı əllərindən gələni etdilər

İmam Həsən Əsgərinin (ə) vəfatından sonra şiəliyə münasibətdə tarixdə misli görünməmiş tərəddüdlər, təfriqələr ortaya çıxdı. Yuxarıda sadalanan səbəbləri əsas .götürərək uyğun dövrü şiələrin pərişanlıq və heyrət dövrü də adlandırmaq olar

Amma müxtəlif yollarla, eləcə də, e'tibarlı adamlar vasitəsi ilə imam Mehdinin (ə) dünyaya gəlişinə əmin olanlar onun imaməti üzərində möhkəm dayandılar. Bu zaman kəsiyində yaranmış bütün məzhəblər az bir müddətdən sonra məhv olub getdi. Bu gün həmin firqələrin heç bir davamçısı yoxdur. Uyğun uydurma məzhəblər haqqında yalnız tarix kitablarında yazılmışdır. Hətta Şeyx Müfid dövründə bu firqələrin davamçılarından qalmamışdı. Şeyx Müfid bu barədə yazır: «Hazırda, hicri ۳۷۳-cü ildə .«bizim dövrümüzdə həmin qruplardan kimsə qalmamışdır

Söhbətimizin davamında imam Həsən Əsgərinin (ə) şəhadətindən sonra meydana .çıxmış firqələrlə tanış olacağıq

## İMAM HADİNİN (Ə) OĞLU CƏ'FƏRİN İMAMLIĞINA E'TİQAD

İmam Həsən Əsgəridən sonra onun qardaşı Cə'fərin imamlığına inanlar dörd qrupa :böləndülər

Bir qrup dedi ki, imam Həsən Əsgərinin (ə) qardaşı imamdır. Onlar bu əqidələrinə əsas olaraq imam Həsən Əsgərinin (ə) vəsiyyətini yox, imamdan sonra övladının qalmamasını əsas götürürdülər. Onlar çarəsizlikdən Cə'fərin imamətə çatdığını qəbul .edirdilər

Bə’ziləri isə iddia edirdilər ki, imam Həsən Əsgəri (ə) Cə’fərin imaməti barədə vəsiyyət etmiş və onu öz canişini tə’yin etmişdir. Bu firqə də bə’zi başqa firqələr kimi Cə’fəri on .ikinci imam sayırdı

Bə’ziləri isə Cə’fərin atasından irsi olaraq, imamət qazandığını iddia edirdilər. Onlar hətta imam Həsən Əsgərinin (ə) övladı olmadığını güman edərək onun özünün də imamətini yanlış sayırdılar. Bildirirdilər ki, imam yalnız övladı olan şəxs ola bilər. Belə bir qənaətə gəlirdilər ki, imam Hadidən (ə) sonra onun canişini Cə’fər olmalı imiş. .Beləcə Cə’fər on birinci imam kimi qəbul edilirdi

Bə'ziləri isə iddia edirdilər ki, imamlıq Cə'fərə atasının dövründə həyatını dəyişmiş qardaşı Məhəmməddən irs qalmışdır. Guya imam Hadi (ə) vəsiyyət edibmiş ki, ondan sonra oğlu Məhəmməd imamət məqamına çatasıdır. Amma Məhəmməd vəfat etdiyindən çarəsiz qalan imam vəsiyyətini öz az yaşlı qulamı Nəfisə etmişdir. Guya imam Hadi (ə) müsəlmanların ehtiyaclı olduğu kitabları, bilikləri, döyüş ləvazimatlarını ona vəsiyyət etmişdir və tapşırmışdır ki, əgər imam Hadi (ə) dünyasını dəyişsə, bütün .bunları qardaşı Cə'fərə versin

Bu insanlar imam Həsən Əsgərinin (ə) imamlığını qəbul etməmişlər. Onların nəzərincə, imam Hadi (ə) imam Həsən Əsgərini (ə) yox, digər oğlu Məhəmmədi on birinci imam .tə'yin etmiş və Cə'fərin canişinliyini təsdiqləmişdir

## İMAM HƏSƏN ƏSGƏRİNİN (Ə) DİGƏR BİR OĞLUNUN İMAMLIĞINA E'TİQAD

:Bu qrup da dörd hissəyə bölünür

Bə'ziləri bu əqidədə olmuşlar ki, imam Həsən Əsgərinin (ə) Əli adlı bir oğlu olmuşdur. İmam (ə) Əlinin canişinliyini vəsiyyət etdiyindən on ikinci imam, eləcə də, Mehdi-Qaim .Əli sayılmalıdır

Bə'zilərinin əqidəsinə, imam Həsən Əsgərinin (ə) vəfatından səkkiz ay sonra gəlmiş .oğlu on ikinci imamdır

Başqa bir qrup inanırdı ki, imam Həsən Əsgəridən (ə), Allahın məsləhəti ilə o vaxt dünyaya gəlməmiş bir oğlu qalmışdır. Anasının bətnində olan bu uşaq Allahın əmri ilə .yüz illər anasının bətnində qalıb, sonra dünyaya gələ bilər

Bə'zilərinin əqidəsinə görə, imam Həsən Əsgəridən (ə) sonra onun Məhəmməd adlı oğlu imam olmuşdur. Guya bu şəxs dünyasını dəyişmiş və zamanında yenidən dirilib .qiyam edəsidir

## İMAM HƏSƏN ƏSGƏRİNİN (Ə) İMAMƏTİNİN DAVAMINA İNANANLAR

:Belə bir əqidədə olanlar da iki qrupa bölünmüşlər

Bir qrup iddia edirdi ki, imam Həsən Əsgəri (ə) sağdır və Mehdi də o özüdür. Guya .١

.imamın heç bir övladı olmadığından o özü qeybə çəkilmişdir

Bu insanların fikrincə, əgər imam dünyasını dəyişərkən onun övladı qalmamışdırsa, demək, o özü Mehdidir. Guya müsəlmanlar onun sağ olduğuna inanmalı və intizarını .çəkməlidirlər

İkinci bir qrup inanırdı ki, imam Həsən Əsgəri (ə) dünyasını dəyişmişdir və sonra .٢ yenidən dirilmişdir. Guya rəvayətdə bildirilir ki, öldükdən sonra yenidən dirilən bir imam

qaimdir. Onların nəzərincə, əgər imam Həsən Əsgərinin (ə) canişini qalmamışdırsa, deməmək, o özü sonuncu imam idi. Guya imam dünyasını dəyişdikdən sonra yeni bir həyata başlamış və gözlərdən gizli qalmışdır. O bir vaxt zühur edib dünyanı ədalətlə .doldurasıdır

Bu firqənin digər firqələrdən fərqi odur ki, onlar imamın dünyasını dəyişdikdən sonra diriləcəyinə e'tiqad etmişlər. Hansı ki, əvvəlki qruplar imamın dünyasını dəyişmədən .qeybə çəkildiyini iddia edirdilər

## İMAM HƏSƏN ƏSGƏRİNİN (Ə) QARDAŞI MƏHƏMMƏDİN İMAMLIĞINA E'TİQAD

Bu insanlar inanırdılar ki, imam Hadidən (ə) sonra onun oğlu Məhəmməd canişin olmuşdur. Onlar imam Həsənlə (ə) imam Hüseyni (ə) istisna edərək, iki qardaşın imam .olmasını mümkünsüz sayırdılar

Onlar Cə'fəri imamət məqamına layiq saymırdılar, onun ədalətsiz olduğunu .bildirirdilər

İmam Həsən Əsgərinin (ə) isə övladı olmadığı üçün imamət məqamına layiq bilmirdilər. Ona görə də bu qrupdan olanlar Cə'fərin və imam Həsən Əsgərinin (ə) yox, onların digər bir qardaşı Məhəmməd ibn Əlinin canişinliyini iddia edirdilər. Bu şəxsin həm övladı olmuşdu, həm də özü ləyaqətli bir insan idi. Bu əsasla da onu imam Mehdi (ə) .sayırdılar. Onun diri olduğunu və bir zaman zühur edəcəyini iddia edirdilər

## ON BİRİNCİ İMAMA E'TİQAD

Bir qrup şiə bildirirdi ki, imam Həsən Əsgərinin (ə) vəfatından sonra imamət məsələsi şübhəli qaldığından, Cə'fərin və ya başqa bir şəxsin imam olduğu bilinmədiyindən, şübhələrdən yaxa qurtarmaq üçün imam Həsən Əsgərinin (ə) imamətində dayanmaq .lazımdır

## DURĞUNLUQ (FƏTRƏT) DÖVRÜNƏ E'TİQAD

Bir dəstə şiə belə düşünürdü ki, imam Həsən Əsgərinin (ə) imamətindən sonra ilahi höccətlər düzümü arasında fasilə yaranmışdır. Onlar yer üzündə ilahi höccətin olmamasını mümkün sayırdılar. Bildirirdilər ki, həzrət İsa və İslam Peyğəmbəri

.arasında da ilahi höccət olmamışdır

Bu insanlar imam Həsən Əsgərinin (ə) dünyasını dəyişməsinə inanırdılar. Sadəcə, ondan sonra kimsənin canişin olduğunu qəbul etmirdilər. Dəlil göstərirdilər ki, həzrət .Peyğəmbərdən də sonra bir peyğəmbər gəlməmişdir

Əvvəldə qeyd etdiyimiz kimi, imam Həsən Əsgəridən (ə) sonra meydana çıxmış bütün bu

firqələr zaman keçdikcə on birinci imamın övladı olduğundan xəbər tutdular. Hazırda .bu firqələr haqqında yalnız kitablarda yazılmışdır

**(«DÖRD NAİB («NƏVVABE–ƏRBƏƏ**

İmam Mehdi (ə) kiçik qeyb dövründə dörd şəxsi özünə xüsusi naib seçib, şiələrə təqdim etmişdir. Bu dörd şəxs əvvəlki imamların səhabələrindən və təqvalı şiə alimlərindən olmuşlar. Dörd naiblə tanış olaq: Osman ibn Səid Əmri, Məhəmməd ibn .Osman ibn Səid Əmri, Hüseyn ibn Ruh Növbəxti, Əli ibn Məhəmməd Səməri

Şiələr bu dörd səfir haqqındakı mə'lumatların əksərini Şeyx Tusinin «Əl–ğeybət» kitabından götürmüşlər. Şeyx Tusi öz növbəsində iki mənbəyə istinad etmişdi. Bu kitablardan biri Məhəmməd ibn Osman ibn Səid Əmrinin qızı Ümmü-Gülsümün oğlu İbn-Bərinənin kitabıdır. İkinci kitab Əhməd ibn Nuhun «Əxbarul-vukəlail-ərbəə» əsəridir. Uyğun iki kitab hansı səbəblərdənsə məhv olub getmişdir. Təəssüf ki, Şeyx Tusi və digər alimlər dörd səfirin həyatı haqqında olduqca az mə'lumat vermişlər. Bu səbəbdən də imam Mehdinin (ə) dörd xüsusi səfirinin həyatı haqqında ətraflı mə'lumat əldə etmək mümkün deyil. Mənbələrdəki mə'lumatların imkan verdiyi qədər bu səfirlər :haqqında dörd başlıq altında söhbət aparacağıq

;Dörd naib

;Dörd naibin seçilmə me'yarı

;Naiblərin şiələrlə rabitə yolu

.Dörd naibin vəzifələri və məs'uliyyətləri

Dörd naibdən biri: Əbu Əmr, Osman ibn Səid Əmri

Osman ibn Səid Əmri imam Mehdinin (ə) ilk xüsusi nümayəndəsi və səfiri olmuşdur. Bu şəxs şiələr arasında xüsusi məqama malik idi. Onu «Əsədi» kimi tanıyırdılar. Çünki o .bəni-Əsəd qəbiləsindən idi

Anasının babası Əmri adlandırıldığından bu səfirə Əmri də demişlər. Bundan əlavə, imam Həsən Əsgəri (ə) buyurmuşdur: «Əbu-Əmr əvəzində Əmri deyin». Bu səbəbdən

.də səfir Əmri adı ilə məşhurdur

.Əsgər və ya Samirrada yaşadığına görə ona Əsgəri də demişlər

Onun yağsatan kimi tanınmasının səbəbi öz siyasi fəaliyyətlərini pərdələmək məqsədi ilə yağ satmaqla məşğul olmasıdır. Əmri şiələrdən qəbul etdiyi dini ödəncləri yağ

.qablarında gizlədər və bu yolla imam Həsən Əsgəriyə (ə) çatdırardı

Şeyx Tusi öz «Rical» kitabında Osman ibn Səidi həm imam Hadinin (ə), həm də imam Həsən Əsgərinin (ə) səhabələrindən saymışdır. Kəşşi Osmanın keçmişi haqqında yazır: .««O, on bir yaşından imam Hadiyə (ə) xidmət etmişdir

Bir şey aydındır ki, Osman ibn Səid Əmri yeniyetmə dövründən əhli-beytə xidmət iftixarı qazanmışdır. O bir neçə imama xidmət etmiş, imam Hadinin (ə) vəkili olmuş, imam Hadinin (ə) ömrünün son on ilində vəkalət qurumuna rəhbərlik etmişdir. İmam Həsən Əsgərinin (ə) vəkillərinin rəisi də Əmri olmuşdur. Şiələrin vəkillər vasitəsi ilə imam Həsən Əsgəriyə (ə) göndərdiyi dini ödənclər Osmana təhvil verilmiş, o da öz növbəsində bu əmanətləri imama çatdırmışdır. Növbəti mərhələdə Osman imam .Mehdinin (ə) xüsusi naibi məqamına çatmışdır

Şeyx Tusi bu barədə yazır: Əhməd ibn İshaq ibn Sə’d Qummi deyir: «Bir gün imam Hadinin (ə) xidmətinə gedib ərz etdim ki, mən tez-tez uzaqda olduğumdan öz şər’i suallarıma cavab ala bilmirəm. Soruşdum ki, kimin sözünü qəbul edim və kimə itaət göstərim? İmam (ə) buyurdu: «Əbu-Əmr (Osman ibn Səid) e’tibarlı şəxsdir. Mən ona .«e’timad edirəm. O, sizə nə deyirsə, mənim tərəfimdən deyir

İmam Hadi (ə) dünyasını dəyişdikdən sonra imam Həsən Əsgərinin (ə) xidmətinə gedib eyni sualla ona müraciət etdim. İmam Həsən Əsgəri (ə) atası imam Hadinin (ə) dediklərini təkrarladı və buyurdu. «Əbu-Əmr həm əvvəlki imamların, həm də mənim e’tibar etdiyim bir şəxsdir. Məndən sonra da belə olasıdır. Sizə nə desə, mənim tərəfimdən deyir və sizə nə çatdırsa, mənim tərəfimdən çatdırır». Həzrətin Osman ibn Səid Əmri haqqındakı bu sözləri şiələr arasında məşhur idi. Əbdüllah ibn Cə’fər deyir: İmam Həsən Əsgərinin (ə) vəfatından bir neçə il sonra Allah evinin ziyarəti üçün Məkkəyə yola düşdük. Əhməd ibn İshaqla görüşdük və Osman ibn Səid Əmrinin onunla olduğunu gördük. Osman ibn Səid Əmriyə müraciətlə dedik: «Əhməd ibn İshaq bizim aramızda e’timad sahibidir. O, sizin məqamınız haqqında imam Hadinin (ə) və imam Həsən Əsgərinin (ə) dediyi sözləri bizə çatdırmışdır». Sonra həmin iki rəvayəti onun üçün zikr etdik. Osman ibn Səid Əmri imam Hadinin (ə) və imam Həsən Əsgərinin (ə) onun haqqında dediyi sözləri eşidib Allahın lütfünə şükür olaraq torpağa düşüb bu

ne’mətə görə səcdə etdi. Bu səhnəni müşahidə edən Əhməd ibn İshaq və ətrafdakılar .ağladılar

Əbdüllah ibn Cə’fər deyir: Sonra onu Allaha və həmin iki imama and verib imam Mehdini (ə) görüb-görmədiyi barədə soruşdum. Onun gözləri doldu, ağladı və dedi: «Bəli, mən həzrəti görmüşəm. Onun xüsusiyyətlərini sənə deyirəm. Amma nə qədər ki, sağam, bu barədə

.kimsəyə heç nə danışma

Şeyx Tusi yazır: «Osman ibn Səid Əmri imam Həsən Əsgərinin (ə) göstərişi ilə Yəmən şiələrindən toplanmış malı onlardan təhvil aldı. İmam Həsən Əsgəri (ə) Osmanın e’tibarına işarə edərək oradakılara dedi: «Bəli, şahid olun ki, Osman ibn Səid Əmri .«mənim vəkilimdir və onun oğlu Məhəmməd oğlum Mehdinin (ə) vəkili olacaq

Başqa bir rəvayətə əsasən, imam Həsən Əsgəri öz canişinini e’tibarlı şiələrdən qırx nəfərinə tanıtdırdı. Bu adamlar arasında Hüseyn ibn Əyyub, Əli ibn Bilal, Əhməd ibn Hilal, Osman ibn Səid də vardı. Həzrət həmin qırx nəfərə müraciətlə buyurdu: «Artıq onu görə bilməyəcəksiniz». Sonra oradakılara tapşırdı ki, imam Mehdinin (ə) qeyb .dövründə onun nümayəndəsi Osmana itaət etsinlər

İmam Həsən Əsgərinin (ə) vəfatından sonra Osman ibn Səid Əmri ona qüsl verdi, kəfənlədi və dəfn etdi. Bütün bunlar onun uca məqamının sübutudur. İmam Mehdinin .(ə) göstərişləri də Osman vasitəsi ilə şiələrə çatdırılırdı

İmam Həsən Əsgərinin vəfatından sonra Qumdan və İranın digər nöqtələrindən bir qrup şiə Samirraya dini ödənc gətirdilər. Onlar Samirraya çatdıqda imam Həsən Əsgərinin (ə) dünyasını dəyişdiyini bildilər. Bir qrup şəxs onlara imamın qardaşı Cə’fəri canişin kimi tanıtdırdı və Cə’fər gətirilən malın ona verilməsini istədi. Cə’fər sualları cavablandıra bilmədiyindən hey’ət gətirdiyi əmanəti ona verməkdən imtina etdi. Şiələr Samirradan çıxdıqları vaxt imam Mehdinin (ə) nümayəndəsi onlarla görüşdü. Gətirilən malların nişanələri imam tərəfindən sadalandıqdan sonra onlar həmin əmanətləri həzrət Mehdiyə (ə) təhvil verdilər. İmam onlara bildirdi ki, bundan sonra Samirraya .gəlməsinlər və onun Bağdaddakı nümayəndəsinə (Osman ibn Səid) müraciət etsinlər

Osman ibn Səid imam Həsən Əsgərinin (ə) vəfatından sonra Samirradan Bağdada getdi və Kərx məntəqəsində sakin oldu. Osman ömrünün sonunadək sakin olduğu yerdə naiblik işinə məşğul oldu. O, imam Həsən Əsgərinin (ə) imaməti dövründə .olduğu kimi müqəddəs nahiyəyə ünvanlanmış namələri, ödəncləri qəbul edirdi

Şeyx Tusi bu barədə yazır: Sahibul-Əmrin (imam Mehdinin) göstərişləri Osman və onun oğlu Məhəmməd tərəfindən şiələrə çatdırılırdı. Bu göstərişlər imama

ünvanlanmış sualların cavabı və zəruri məsələlər haqqında olurdu. İmamın məktublarındakı dəstxətt imam Həsən Əsgərinin (ə) məktublarındakı dəstxətt idi. Şiələr hər iki şəxsin ədalətli olduğunu qəbul edirdilər. Osman ibn Səid dünyasını dəyişdikdən sonra oğlu Məhəmməd ona qüsl verdi və onu dəfn etdi. Biz hicri ۳۰۸-۳۳۰-cu illərdə Bağdadda onu ziyarət edirdik. Sonradan həmin yeri Əbu-Mənsur ibn Fərəc .tə’mir etdi və qəbrin üzərində günbəz tikildi

Ətrafdakılar onun ziyarətinə gələr və onda təbərrük axtarardılar. Deyirlər ki, bu saleh «.şəxs imam Hüseynin (ə) süd qardaşı olmuşdur

## OSMAN İBN SƏİD ƏMRİNİN SƏFİRLİYİNİN DƏLİLLƏRİ

Deyilənlərdən mə’lum olur ki, Osman ibn Səid Əmri həzrət Mehdinin (ə) ilk səfiri və naibi olmuşdur. Çünki əvvəla, bu şəxs imam Həsən Əsgərinin (ə) evində xüsusi mövqeyə malik olmuş və həzrət onu e’tibarlı saymışdır. İkincisi, imam Həsən Əsgərinin (ə) qüsl və dəfn işləri bu şəxsin ixtiyarına verilmişdir. Hansı ki, şiələrin e’tiqadına görə imamı imam dəfn etməlidir. İmam Mehdi (ə) ixtifada olduğundan naibi onun nümayəndəsi olaraq bu işləri öhdəsinə almışdır. Üçüncüsü, həm imam Mehdi (ə), həm də imam Həsən Əsgəri (ə) Osmanın nümayəndəliyini bir qrup şəxsə bəyan etmişlər. Dördüncüsü, həzrətin namələri və göstərişləri Osman ibn Səid vasitəsi ilə çatdırılardı. .Nəhayət, həzrətin nümayəndəsi olduğu vaxt onda kəramətlər görünmüşdü

## OSMAN İBN SƏİD ƏMRİNİN VƏFAT TARİXİ

Osman ibn Səid Əmrinin şiə tarixində mühüm rolu olsa da, onun ölüm tarixi mə’lum deyildir. Hər halda tarixçilər bu tarixi müəyyənləşdirmək üçün sə’y göstərmişlər. Haşim Mə’ruf Həsəni yazır: «Osman ibn Səidin səfirliyi hicri ۲۶۵-ci ilədək davam etdi». Amma bu mə’lumat verilərkən heç bir mənbə göstərilmir. Cavad Əli yazır: «On ikinci .«(imamın qeybindən iyirmi il sonra onun ilk səfiri dünyasını dəyişdi. (hicri ۲۷۰-ci il

Bə’ziləri bildirirlər ki, Osman ibn Səid Əmri imam Həsən Əsgəridən (ə) sonra və hicri ۲۶۷-ci ildən qabaq vəfat etmişdir. Çünki yalandan naiblik iddiasına düşmüş Əhməd ibn Hilal həqiqi naib Məhəmməd ibn Osmanla müxalifətçilik etmiş, onun səfirliyini qəbul etməmişdir. Bu şəxs hicri ۲۶۷-ci ildə ölmüşdür. Deməli, Osman ibn Səid Əmrinin vəfatı .bu tarixdən əvvələ təsadüf edir

## MƏHƏMMƏD İBN OSMAN İBN SƏİD ƏMRİ

İmam Mehdinin (ə) xüsusi naibi, ikinci səfir birinci səfirin oğlu Məhəmməd ibn Osman ibn Səid Əmri olmuşdur. O, atası dünyasını dəyişdikdən sonra səfirlik məqamına .çatmış və müqəddəs nahiyə tərəfindən vəkillik etmişdir

Məhəmməd ibn Osman da öz atası kimi şiə böyüklərindən olmuş, təqva və ədaləti ilə

seçilmişdir. Bu şəxs imam Həsən Əsgərinin (ə) e’tibarlı yaxınlarından olmuş və şiələr tərəfindən sevilmişdir. Atası haqqında danışılarkən bəyan olunduğu kimi, Əhməd ibn İshaq imam Həsən Əsgəriyə (ə) sual ünvanlandığı vaxt imam buyurmuşdur: «Əmri və onun oğlu hər ikisi e’tibarlıdır. Onların çatdırdığı mənim tərəfimdəndir və sənə dedikləri mənim dediklərimdir. Onları dinlə və onlara itaət et. Çünki bu iki şəxs mənim e’tibar etdiyim adamlardır».

## MƏHƏMMƏD İBN OSMAN ƏMRİNİN SƏFİRLİYİNİN DƏLİLLƏRİ

Məhəmməd ibn Osman ibn Səid Əmri təqvalı və e’tibarlı bir şəxs olmasından əlavə, əhli-beytə xidmətdə ötmüş və ləyaqətli bir keçmişə malik idi. Atasının dövründə bu şəxsin vəkalət qurumunda fəal iştirakı vardı. Onun səfir seçilməsi üçün ciddi əsaslar vardı ki, bu əsasları nəzərinizə çatdırırıq:

Bu şəxs imam Həsən Əsgərinin (ə) dövründə imamın diqqətini cəlb etmiş və imam onun haqqında buyurmuşdur: «Məhəmməd ibn Osman mənim üçün e’tibarlı şəxsdir».

İmam Həsən Əsgəri (ə) onun e’tibarlı olduğunu bildirməklə yanaşı, həm də oğlu imam Mehdinin (ə) vəkili olduğunu qeyd etmişdir.

İmam Mehdinin (ə) birinci səfiri vəsiyyətində demişdir: «Məndən sonra oğlum Məhəmməd müqəddəs nahiyənin xüsusi naibidir və ona müraciət edin».

Birinci səfirin vəsiyyəti əsasında oğlu Məhəmməd onun cənazəsini dəfnə hazırlayır. İmamiyyə şiələri arasında mövcud olan əqidəyə əsasən, imamın cənazəsini dəfnə imam hazırlamalıdır. Məhəmmədin atası həzrət Mehdinin (ə) göstərişi ilə imam Həsən Əsgərinin (ə) cənazəsini dəfnə hazırlamışdı.

Ən əsası isə ikinci səfir müqəddəs nahiyə tərəfindən məktubları və göstərişləri xalqa çatdırırdı. Bu məktublar ötən dövrdəki dəst-xəttlə yazılırdı. Vəkillər bu xətt vasitəsi ilə Məhəmməd ibn Osmanın imam Mehdi (ə) ilə rabitəsinə əmin olurdular.

O həm də bə’zi vəkillərin imam Mehdi (ə) ilə görüşünü təşkil edirdi. İmam Mehdi (ə) bu görüşlərdə bildirmişdi: «Məhəmməd ibn Osman mənim səfirimdir».

Şeyx Səduq «Əl-ğeybət» kitabında bu məsələyə toxunduqdan sonra yazır: «Bu məsələ şiələr üçün bir dəlil ola bilər ki, Məhəmməd ibn Osman atasından sonra həzrət .Mehdinin (ə) səfiri seçilmişdir

Əbdüllah ibn Cə’fər Həmidi deyir: «Məhəmməd ibn Osman Əmridən soruşdum: «İmam Mehdini (ə) görmüsənmi?» Dedi: «Bəli, son dəfə həzrəti Məkkədə Allah evinin yanında «.ziyarət etdim

(Əbu-Nəsr deyir: «Məhəmməd ibn Osman bütün məsələlərini imam Həsən Əsgəri (ə

və imam-Zamandan, eləcə də, atası Osman ibn Səiddən əxz etdiyi fiqh kitabları təsnif etmişdi. Məhəmmədin vəsiyyətinə əsasən, kitablar üçüncü səfir Hüseyn ibn Ruha təhvil verilmişdir. Axırda isə dördüncü səfir Əli ibn Məhəmməd Səməri həmin kitabları .təhvil almışdı

Məhəmməd ibn Osman təqribən qırx il imam Mehdinin (ə) xüsusi naibi olmuşdur. O, yalandan nümayəndəlik iddiası edənləri məğlub etmiş və nəhayət, hicri ٣٠٥-ci ilə .camadiül-əvvəl ayının sonlarında dünyasını dəyişmişdi

Məhəmməd ibn Osman ölümündən iki ay qabaq imam Mehdi (ə) tərəfindən öz ölümü haqqında xəbər tutmuşdu. Bu səbəbdən də əvvəlcədən özü üçün qəbir hazırlamışdı. Məhəmməd və'd edilən gün dünyasını dəyişdi. Həzrət Höccətin (ə) göstərişi ilə .Məhəmməd vəsiyyət etdi ki, ondan sonra növbəti səfir Hüseyn ibn Ruh Növbəxtidir

## (HÜSEYN İBN RUH NÖVBƏXTİ (ƏBÜL–QASİM

İmam Mehdinin (ə) üçüncü səfiri böyük Şeyx Hüseyn ibn Ruh Növbəxti olmuşdur. O, Məhəmməd ibn Osman Əmrinin həyatı dövründə müqəddəs nahiyə tərəfindən Məhəmmədin canişini tə'yin edilmişdir. Məhəmməd ibn Osman ömrünün son illərində .növbəti səfirin qəbulu üçün şiələri hazırlamışdır

Hüseyn ibn Ruh Növbəxti Məhəmməd ibn Osman dünyasını dəyişdikdən sonra, hicri ٣٠٥-ci ildə naiblik vəzifəsini öhdəsinə götürmüşdür. Bu səfirin də anadan olduğu tarix əvvəlki iki səfirin anadan olduğu tarix kimi mə'lum deyil. Amma bə'ziləri qeyd etmişlər .ki, Hüseyn ibn Ruh imam Həsən Əsgərinin (ə) səhabələrindən olmuşdur

Əgər bu söz doğru olsa, onun hicri III əsrin birinci yarısında dünyaya gəldiyini qəbul etmək olar. Belə ki, o həzrətin səfirliyini qəbul etdiyi vaxt altmışdan çox yaşı olmuşdur. Bə'ziləri isə belə qeyd edirlər ki, Hüseyn ibn Ruh imam Həsən Əsgərinin (ə) dövrü arasında əlli il hüdudunda fasilə olduğundan onun on birinci imamın səhabəsi olması .inandırıcı deyil

Bu şəxs ikinci səfirin dövründə onun işçilərindən olmuş və son illərdə Məhəmməd ibn .Osman tərəfindən baş vəkil tə'yin edilmişdir

Hüseyn ibn Ruhun Bağdad şiələri arasında xüsusi bir ictimai mövqeyi vardı. Hətta ölkə başçılarının da bu şəxsə münasibəti müsbət idi.

Məhəmməd ibn Osman Əmrinin qızı Ümmü-Gülsüm deyir: «Hüseyn ibn Ruh uzun illər boyu Məhəmməd ibn Osmanın vəkili və əmlakına nəzarətçi oldu. O, Məhəmməd ibn Osmanın tapşırıqlarını şiə başçılarına çatdırırdı. Məhəmməd ibn Osman onu o qədər yaxın sayırdı ki, öz sirləri barədə onunla söhbət edirdi. Atam ayda ona otuz dinar maaş verirdi. Bundan əlavə ali-

Fərat kimi şiə rəisləri ona e’timad göstərərək yardım edirdilər. Hüseyn ibn Ruhun şiələrin qəlbində xüsusi yeri var idi. Çünki onlar bu şəxsin atamın yaxınlarından olduğunu və e’tibarlı sayıldığını bilirdilər. Onun qarşıdakı məs’uliyyəti atamın dövründə müəyyənləşmişdi. Atam həzrət Mehdi (ə) tərəfindən göstəriş almışdı ki, onu öz canişini seçsin. Atamı tanıyanlar arasında onun naibliyinə şübhə edənlər yox idi. Mən onun .«vəkilliyinə şübhə edən bir şiə tanımıram

Şeyx Səduq Məhəmməd ibn Əli Əsvəddən rəvayət edərək deyir: «İxtiyarında olan vəqf malları Məhəmməd ibn Osmanın yanına aparırdım və o da məndən qəbul edirdi. Ömrünün son günlərində apardığım malları onun göstərişi ilə Hüseyn ibn Ruha təhvil verdim və qəbz istədim. Hüseyn ibn Ruh istəyimi Məhəmməd ibn Osmana çatdırdı. Məhəmməd ibn Osman mənə tapşırdı ki, ondan qəbz istəməyim və sonra buyurdu: «Hüseyn ibn Ruha çatan şey mənim əlimə çatmış kimidir». Həmin vaxtdan başlayaraq .«ixtiyarıma verilən malları onun yanına aparır və qəbz tələb etmirdim

Əslində Məhəmməd ibn Osman ibn Səid Əmri bu səfirlik işi ilə Hüseyn ibn Ruhun gələcək məqamını vəkillərə və xalqa bəyan edirdi. Çünki vəkillər təhvil aldıqları mala .qəbz verir, səfirlər isə qəbz yazmırdılar

Hüseyn ibn Ruh Məhəmməd ibn Osmanla həmkarlıq etdiyi dövrdə üstün mövqe qazandığı üçün ehtiyaclı şiələrə yardım göstərirdi. Şeyx Səduq yazır: «Ələvilərdən biri öz maddi ehtiyacını vəzirə bildirmiş, amma ondan müsbət cavab almamışdı. Bunu .eşidən Hüseyn ibn Ruh vəzirə xəbər göndərdi və ələvinin çətinliyi həll oldu

Cə’fər ibn Məhəmməd ibn Mütəyyil deyir: «Məhəmməd ibn Osman Əmri ölüm yatağında olarkən orada idim. Həmin məqamda o dedi: «Məndən sonra Hüseyn ibn Ruh imam Mehdinin (ə) nümayəndəsi mənsəbinə tə’yin olur». İmam Mehdinin (ə) göstərişi ilə Məhəmməd ibn Osman Hüseyn ibn Ruhun səfirliyi üçün hazırlıq gördüyündən o, şiələr, xüsusi ilə də, vəkillər və vəkalət qurumunun işçiləri tərəfindən çətinliklə qarşılaşmadı. Onun yeganə problemi haqqında Şeyx Tusi yazır: «Əbu-Əbdüllah Həsən Vəcəna Bağdadın on vəkilindən biri kimi Nəsibin və Mosulda fəaliyyət göstərirdi. O, hicri ۳۰۷-ci ildə Məhəmməd ibn Fəzl Mosuli adlı biri ilə görüşdü və onun Hüseyn ibn Ruhun səfirliyini qəbul etmədiyini başa düşdü. Həsən Vəcəna onu Hüseyn

ibn Ruhun səfirliyinə inandırmaq üçün çalışsa da, Məhəmməd ibn Fəzl Mosuli bu həqiqəti qəbul etmədi. O, əvvəlki iki səfirdə gördüyü kəramətləri Hüseyn ibn Ruhda da .görmək istəyirdi

Həsən Vəcəna onu Bağdada gətirdi və o öz gözləri ilə Hüseyn ibn Ruhun kəramətini müşahidə etdi. Dərhal öz əməlindən peşiman olub Hüseyn ibn Ruhun səfirliyini qəbul .etdi

Hüseyn ibn Ruh Məhəmməd ibn Osman vəfat etdikdən sonra rəsmi səfirlik fəaliyyətinə başladı və vəkalət qurumunun işlərini əlinə aldı. İşin başlanğıcında Məhəmməd ibn Osman Əmrinin xadimi onun yanına gəlib Əbu-Cə’fərin əsasını, sandıqçasının açarını ona çatdırdı və dedi: «Əbu-Cə’fər mənə buyurdu: «Mən torpağa tapşırıldıqdan sonra bu əşyaları Hüseyn ibn Ruha, mənim canişinimə təhvil ver; .«imamların möhürləri bu sandıqçadadır

## MÜNASİB MÖVQE

Hüseyn ibn Ruhun səfirliyi dövründə İbn-Fəratın xəlifə Müqtədirin vəziri olması ilə şiələr müəyyən həddə rahatlıq tapdılar. Hüseyn ibn Ruh Növbəxtinin özünün də hakimiyyət dairələrində xüsusi hörməti vardı. Bu iki səbəbdən əvvəlki səfirlərin dövrlərindən fərqli olaraq Hüseyn ibn Ruhun dövründə şiələr rahat nəfəs aldılar və .hökumət onlara heç bir maneçilik törətmədi

Yalnız hicri ٣١٣-cü ildə şiə kimi tanınmış Qəramitə həcc karvanına hücum etdiyi vaxt Bağdadda şiələrə qarşı hücumlar oldu, İbn-Fərat və onun oğlu tutularaq həbs edildi. Həmin il Hüseyn ibn Ruh gizlənsə də, növbəti ildə həbs edilərək beş il zindanda qaldı. .Hicri ٣١٧-ci ildə o azadlığa çıxdı və yenidən öz fəaliyyətini davam etdirdi

Hüseyn ibn Ruh hicri ٣٠٥-ci ildən ٣٢۶-cı ilədək, iyirmi bir il müddətində müqəddəs nahiyə tərəfindən səfirlik vəzifəsini öhdəsinə götürdü. Hicri ٣٢۶-cı il, şə’banın ١٨-də dünyasını dəyişdi. O, Bağdadda dəfn olunmuşdur və qəbri şiələrin ziyarətgahıdır. İmam Mehdinin (ə) göstərişi və onun vəsiyyəti əsasında səfirlik məqamı Əli ibn .Məhəmməd Səməriyə çatdı

## ƏBÜL-HƏSƏN ƏLİ İBN MƏHƏMMƏD SƏMƏRİ

İmam Mehdinin (ə) dördüncü və sonuncu naibi Əli ibn Məhəmməd Səməridir. O, həzrət Höccətin (ə) göstərişi ilə Hüseyn ibn Ruhdan sonra səfirlik məqamına seçildi. Bu şəxs hicri ٣٢۶-cı ildən ٣٢٩-cu (٣٢٨-ci) il, şə’ban ayının on beşinədək vəkalət qurumuna .rəhbərlik etdi

Əli ibn Məhəmməd Səməri abbasi vəziri Cə’fər ibn Məhəmmədin bacısının əri idi. Bu qohumluq əlaqəsi onun Abbasilər hakimiyyətinə tə’sir etməsində mühüm rol

.oynamışdır

Əli ibn Məhəmməd Səməri e’tiqadlı şiə ailəsindən olmuş və vəkalət qurumunda öz gözəl xidməti ilə şöhrət qazanmışdır. Onun müsbət keçmişi, e’tibarlılığı səbəbindən səfirlik məqamını əldə etməsində şiələr və vəkalət qurumu tərəfindən çətinliyi olmamışdır. Vəkillər və xüsusi şiələr bu şəxsi imamın həqiqi səfiri olaraq rəsmi tanımış

.və dini ödəncləri müqəddəs nahiyəyə çatdırmaq üçün ona təhvil vermişlər

Şeyx Hürr Amili nəql edir ki, Səməri ailəsinin əksər üzvləri Bəsrədə böyük əmlaka sahib olmuşlar. Onlar öz gəlirlərinin yarısını imam Həsən Əsgəriyə (ə) vəqf etmiş və uyğun .gəliri imamın ixtiyarına vermişlər

Əli ibn Məhəmməd Səməri səfirliyinin qısa müddətli olması və siyasi vəziyyətin ağırlığı səbəbindən geniş fəaliyyət göstərə bilməmişdir. Bu da ola bilər ki, səfir təqiyyəyə .riayət edib, gizli fəaliyyət göstərdiyindən onun bir çox işləri qapalı qalmışdır

## SON FƏRMAN

Müqəddəs nahiyə tərəfindən son fərman Əli ibn Məhəmməd Səmərinin vəfatından altı gün qabaq verilmişdir. Bu fərmanda imam Mehdi (ə) Səmərinin vəfat tarixini bildirir və e'lan edirdi ki, bu səfirdən sonra xüsusi naib olmayacaqdır. Qeyd olunurdu ki, Səmərinin ölümü ilə kiçik qeyb dövrü başa çatır və böyük qeyb dövrü başlayır. Həmin bildirişdə deyilirdi: «Rəhman və Rəhim Allahın adı ilə. Ey Əli ibn Məhəmməd Səməri! Allah sənin ölüm müsibətində din qardaşlarının mükafatını böyük edər. Altı gündən sonra dünyanı dəyişəcəksən. Öz hesab-kitabını qaydaya sal və naiblik, canişinlik haqqında kimsəyə vəsiyyət etmə ki, sənin yerində otursun. Çünki ikinci qeyb dövrü başlamışdır. Allah istədiyi günə qədər zühur olmayacaq. O, qəlblərin bərkləşəcəyi, yer üzünü zülm-sitəm bürüyəcəyi uzun bir müddətdən sonra baş verəcək. Çoxları müşahidə iddiası edəcək. Bil ki, Süfyaninin ayağa qalxmasından və Səmadan nida qopmasından qabaq kim məni gördüyünü iddia etsə, yalançıdır. Güc və qüdrət uca .»mərtəbəli Allaha məxsusdur

Şeyx Səduq Əbu Məhəmməd Həsən ibn Əhməd Mükəttəbin dilindən yazır: «Biz Əli ibn Məhəmməd Səməri dünyasını dəyişəndə Bağdadda Mədinətus-Səlamda idik. Ölümdən bir neçə gün qabaq onunla görüşdük. O, həzrətin bu fərmanını bizə göstərdi. Biz imamın göstərişlərinin üzünü köçürdük və Əli ibn Məhəmməd Səmərini tərk etdik. Və'd olunmuş altıncı gün çatdıqda onun yanına getdik və ölüm yatağında olduğunu gördük. Ondan soruşdular ki, özündən sonra canişini kimdir, imam Mehdinin (ə) naibi kim olacaq? O dedi: «Allah öz istəyini yerinə yetirəcək. (Yə'ni kiçik qeyb dövrü başa çatmışdır və böyük qeyb dövründə imam Mehdinin (ə) xüsusi naibi olmayacaq; Bu

Allahın iradəsidir). Bu sözləri deyib canını yaradana təslim etdi. Bu sözlər onun son sözləri oldu».

Bu tarixdən başlayaraq xüsusi naiblərlə imam Mehdi (ə) arasındakı əlaqə kəsildi və böyük qeyb dövrü başladı. Mə’lumdur ki, Əli ibn Məhəmməd Səmərinin vəfat tarixi hicri ۳۲۹-cu il şə’ban ayının on beşinə təsadüf edir. Amma Şeyx Səduq onun üç yüz iyirmi səkkizinci ildə vəfat etdiyini bildirir.

## SON FƏRMANDAKI BƏ’Zİ NÖQTƏLƏR

İmam Mehdi (ə) Əli ibn Məhəmməd Səmərinin ölümündən altı gün qabaq bu hadisə barədə xəbər vermişdi. Və’d edilən gün imamın səfiri dünyasını dəyişdi. Uyğun tarixin qabaqcadan dəqiq göstərilməsi sübut edir ki, fərman, doğrudan da, həzrət Mehdi (ə) tərəfindən verilmişdir.

İmam Mehdi (ə) Əbül-Həsən Səməriyə göstəriş vermişdi ki, özündən sonra üçün canişin tə’yin etməsin. Bu göstəriş bir daha sübut edir ki, imamla birbaşa rabitəyə son qoyulmuşdu. Artıq xalq səfirlər vasitəsi ilə imama müraciət edə bilməzdilər.

Bu fərmanda kiçik qeyb dövrünün başa çatdığı və böyük qeyb dövrünün başlandığı bəyan olunmuşdu.

Həzrət Mehdi (ə) Allahın izni ilə zühur edə bilər və bizə onun zühur tarixi bəlli deyil.

Uyğun fərmanda zühurun iki əlaməti bəyan olunmuşdur. Bunlardan biri Süfyaninin qiyamı, digəri isə səmadan gələsi nidadır.

## DÖRD NAİBİN SEÇİLMƏ ME’YARI

Ötən söhbətlərdə qeyd olunduğu kimi, mə’sum imamlar müxtəlif insanları özləri üçün vəkil seçmişlər. İmam Həsən Əsgərinin (ə) dövründə vəkalət qurumunda on nəfər fəaliyyət göstərirdi. Bu e’tibarlı adamlar arasında kiçik qeyb dövrü üçün dörd səfir hansı me’yarla seçilmişdir?

Sualın cavabında əvvəlcə onu deməliyik ki, mə’sum imamlar hikmət əsasında rəftar etmişlər. Şəksiz ki, uyğun seçim üçün dəqiq me’yarlar olmuşdur. Biz bu me’yarları bilsək də, bilməsək də, onların mövcudluğu şübhə doğurmamalıdır. Yalnız onu demək olar ki, uyğun me’yarlar İslam dəyərlərinə əsaslanmışdır.

Bütün me’yarlar arasında iman, elm, təqva, bəndəlik ön yerdə dayanır. Mə’sum imamların vəkili məqamına çatmış bütün insanlarda bu xüsusiyyətlər olmuşdur. Amma kiçik qeyb dövründə müqəddəs nahiyə tərəfindən səfirliyə seçilənlərdə bu xüsusiyyətlər daha üstün həddə olmuşdur. Yuxarıda sadalanmış xüsusiyyətlərə daha

:bir neçə xüsusiyyət əlavə edə bilərik

.Ən üstün şəkildə təqiyyə və sirsaxlama .۱

Məsələn, Hüseyn ibn Ruh Növbəxti ciddi şəkildə təqiyyə edər və sirr saxlayardı. Belə ki, bütün məzhəblərdən olan alimlər Hüseyn ibn Ruhu özlərinə aid edirdilər. Hüseyn ibn Ruh

yalnız təqiyyə sayəsində hamını razı sala bilmişdi. O hətta öz xidmətçilərindən birini .Müaviyəyə lə’nət oxuduğu üçün işdən uzaqlaşdırmışdı

Hüseyn ibn Ruh təqiyyə səbəbindən məclislərdə ilk üç xəlifə haqqında xoş sözlər deyərdi. Onun sözləri yaxın şiələrdən birini təəccübləndirmişdi və həmin şəxs gülümsəmişdi. İbn Ruh onu bu işinə görə məzəmmət etmişdi. Çünki həmin şiənin .gülüşü səfirin əsil əqidəsini aça bilərdi

Həzrət Mehdinin (ə) birinci səfiri Osman ibn Səid özünü abbasi rejiminin tə’qiblərindən qorumaq üçün təqiyyəyə ciddi əməl edərdi. Hətta heç bir dini və ya siyasi məclisdə .aşkar şəkildə mübahisə etməzdi

.Ali bir dərəcədə səbr və müqavimət .٢

Səfirlərin işi çox mühüm olduğundan və düşmən imam Mehdini (ə) ələ keçirmək istədiyindən istənilən bir zəiflik və süstlük olduqca mənfi nəticələr verə bilərdi. Ona .görə də səfirlər başqalarından daha möhkəm və dözümlü olmalı idilər

Bə’ziləri Əbu-Səhl Növbəxtidən soruşdular: «Nə üçün imamın xüsusi naibi sən yox, Hüseyn ibn Ruh oldu? O belə cavab verdi: «İmamlar bu məqama kimin daha layiqli olduğunu hamıdan yaxşı bilirlər. Mən düşmənlərlə get-gəl edən adamam və tez-tez mübahisə edirəm. Hüseyn ibn Ruhun imam haqqında bildiklərini mən bilsəydim, düşmənlərlə mübahisə zamanı onları məğlub etmək üçün hər şeyi açardım və nəticədə imamın yeri mə’lum olardı. Amma Hüseyn ibn Ruh imamı əbası altında gizlətsə, onu tikə-tikə doğrasalar da, əbasını qaldırıb imamı göstərməz». Əbu-Səhl Növbəxtinin bu sözləri Hüseyn ibn Ruhun nə dərəcədə səbirli və dözümlü olduğunu .göstərir

.Səfir başqalarına nisbətən dərrakəli, ağıllı və agah olmalıdır .٣

Şeyx Tusi «Əl-ğeybət» kitabında səfirlərin dərrakə və agahlığını göstərən bir rəvayət .nəql edir. Bu rəvayətlə qarşıda tanış ola bilərsiniz

İmam Mehdi (ə) zalım abbasi hakimiyyətinin diqqətini cəlb etməmiş insanları naib .۴ .seçirdi

Çünki bu iş olduqca məxfi bir iş idi. Məsələn, birinci səfir Osman ibn Səid Əmri yağsatan kimi tanınırdı. Abbasilərin ağlına da gəlmirdi ki, o imamın xüsusi səfiri ola bilər. İkinci səfir Məhəmməd ibn Osman da atası kimi diqqəti cəlb etməmiş bir şəxs idi. Üçüncü səfir isə sarayla əlaqəli idi və sarayda xüsusi nüfuzu vardı. Abbasilər onun imam Mehdi (ə) ilə əlaqədə olduğunu təsəvvürlərinə belə gətirmirdilər.

Bu səbəbdən də Seyyid Məhəmməd Sədr deyir: «Kiçik qeyb dövründə ələvilər səfirlik məsələsinə qatılmadılar və bu iş başqalarına tapşırıldı. Hansı ki, həmin vaxt

ələvilər arasında elmi, ibadəti ilə seçilən ləyaqətli insanlar vardı. Belə bir seçimin səbəbi aydındır. Ələvilərin həyat tarixçəsi uyğun məsələni daha dəqiq aydınlaşdırır. Çünki ələvilər tarix boyu zülmə qarşı çıxmış və qiyamlar qaldırmışdılar. Ona görə də dövlətin bütün diqqəti ələvilərin üstündə cəmlənmişdi. Ələvilər həm imamların tərəfdarı idilər, həm də zülmə qarşı mübarizənin önündə gedirdilər. Zalım hakimlər yaxşı bilirdilər ki, yalnız ələvilər onlarla barışmaz mövqedə dayanır. Əlbəttə ki, belə bir zümrə daim nəzarət altında saxlanası idi. Nəzarət altında saxlanılan insan isə .müqəddəs nahiyə tərəfindən səfirlik kimi mühüm bir işi öhdəsinə götürə bilməz

## DÖRD NAİBİN ŞİƏLƏRLƏ RABİTƏSİNİN XÜSUSİYYƏTLƏRİ

Vəkalət qurumu, xüsusi ilə də imamın səfirləri siyasi durum təhlükəli olduğundan şiələr tərəfindən tanınmırdılar. Səfirliyin başlanğıcında, xüsusi ilə Osman ibn Səid Əmrinin səfirliyi dövründə onun naibliyi xalqa mə’lum deyildi. Təbii ki, belə bir şəraitdə şiələrlə səfir arasında ciddi rabitələr ola bilməzdi. Yalnız bir qrup xüsusi vəkil onu həzrətin naibi kimi tanıyır və şər’i məsələləri ondan soruşurdular. Zaman ötdükcə vəkillərin ciddi təlaşları sayəsində naiblik şiələr arasında öz yerini tapırdı. Təqiyyəyə əməl etməklə .əlaqələr güclənirdi

## İKİ NÖV RABİTƏ

Şiələr dörd naiblə iki növ əlaqə saxlayırdılar. Bu əlaqələrdən biri vasitəli, digəri isə vasitəsiz idi. Vəkalət qurumunun əsasını vasitəli rabitə təşkil edirdi. Çünki bu qurum Abbasilərin zülmündən aşkar fəaliyyət göstərə bilmirdi. Ona görə də xalqla rabitədə .gizli yollardan istifadə olunurdu

Bu rabitə növündə vəkillər vasitə rolu oynayırdılar. Xalq öz istəklərini vəkillərə bildirir, şər’i ödənclərini onlara çatdırırdılar. Vəkillər də öz növbəsində onlara verilmiş əmanəti imamın səfirlərinə təqdim edirdilər. Müqəddəs nahiyədən səfirlər vasitəsi ilə cavablar əldə olunurdu. Bu rabitə piramida şəklində təsəvvür edilərsə, səfir onun təpə .nöqtəsini, vəkillər yan tərəfini, xalq isə oturacağını təşkil etmiş olar

Bu piramidasayağı rabitə əvvəlcə Bağdad şiələri arasında qurulmuşdu. Uyğun rabitə sonra daha da genişləndi. Məhəmməd ibn Osmanın Bağdadda on vəkili vardı.

Bunlardan biri də Hüseyn ibn Ruh idi. Bu adamlar Məhəmməd ibn Osmanın ticarət işlərində vəkilləri kimi tanınırdılar. Əslində isə onlar həzrət Mehdinin (ə) vəkalət qurumunda fəaliyyət göstərirdilər. İşin başlanğıcında hətta ətrafdakı böyük alimlər də imam Həsən

Əsgərinin (ə) canişinliyindən xəbərsiz idilər. Məsələn, Məclisinin «Biharul-ənvar», Şeyx Tusinin «Əl-ğeybət» kitabında nəql etdiyi bir rəvayətə əsasən Məhəmməd ibn İbrahim Məhzyar Əhvazi imam Həsən Əsgərinin (ə) vəfatından sonra həzrət Höccəti (ə) tanımırdı. Yalnız bir neçə il ötdükdən sonra o, imamın canişinini tanımaq üçün İraqa .səfər etdi

Dinvərdə xalq imam Həsən Əsgərinin (ə) vəfatından bir neçə il ötməsinə baxmayaraq şər'i ödəncləri kimə verəcəklərini bilmirdilər. Onlar Əhməd ibn Məhəmməd Dinvərinin yanına gedib bu barədə soruşdular. Dinvəri belə cavab verdi: «Ey camaat, hələ ki .«vəziyyət mə'lum deyil. Hazırda kimin imamın səfiri və naibi olduğu bilinmir

## BİRBAŞA RABİTƏ

Kiçik qeyb dövründə naib fəaliyyətə başlayanda belə bir rabitə növü yox idi. Qərar vardı ki, naiblik məsələsi məxfi qalsın. Vəkalət qurumunun işinin gizli aparılmasının səbəbi hakimlərin bu işə qarşı gördükləri amansız tədbirlər idi. Zaman ötdükcə şiələr səfirin adını və əlamətlərini vəkillərdən öyrənir və onlarla birbaşa əlaqə saxlaya bilirdilər. Səfirlərlə birbaşa rabitə yalnız ikinci səfirin dövründə həyata keçməyə başladı. Şeyx Tusi birbaşa rabitə haqqında yazır: «Bir qrup e'tibarlı şəxs həzrət Mehdinin (ə) səfirlərinin yanına gedib məktub verməklə öz istəklərini həzrətə .çatdırırdılar. Müqəddəs nahiyədən verilən cavabları da səfirlər xalqa ötürürdü

Birbaşa rabitə zamanı bə'zən suallar yazılı şəkildə verilir və bir neçə gün sonra cavab alınırdı. Bə'zi rəvayətlərdə belə nəql olunur: «Üç gün ötəndən sonra dostum mənə dedi ki, Məhəmməd ibn Osmanın yanına gedib məktubun cavabını alıb». Başqa bir yerdə isə .«belə bildirilir: «Üç gün sonra məktubumun cavabı verildi

## ;DÖRD NAİBİN VƏZİFƏLƏRİ VƏ MƏS'ULİYYƏTLƏRİ

### HƏZRƏT MEHDİNİN VÜCUDU İLƏ BAĞLI ŞÜBHƏLƏRİN ARADAN QALDIRILMASI

Kiçik qeyb dövründə siyasi şərait ağır olduğundan şiələr imam Həsən Əsgərinin (ə) övladı olmasından xəbərsiz idilər. Əgər həzrət Mehdi (ə) məxfi həyat sürməsəydi, zalım rejim tərəfindən öldürülərdi. Hicri ۲۶۰-cı ildə imam Həsən Əsgəri (ə) dünyasını

dəyişdikdə yalnız ən yaxın adamlar həzrət Mehdinin (ə) varlığından xəbərdar idi. Dörd naibin, xüsusi ilə birinci səfirin ən mühüm vəzifələrindən biri bu idi ki, imam Həsən Əsgərinin (ə) övladı olduğunu şiələrə sübut etsin.

İmam Hadi (ə) və imam Həsən Əsgəri (ə) tərəfindən e’timadlı sayılan və imamiyyə şiələrinin böyüklərinin sədaqətli bildiyi Osman ibn Səid Əmri uyğun həssas dövrdə xalqın imam Mehdi (ə) ilə bağlı şübhələrini aradan qaldıra bildi. Eləcə də sübuta yetirdi ki, o, müqəddəs nahiyə tərəfindən xüsusi vəkildir. Bə’zənsə Osman ibn Səid Əmrinin gətirdiyi dəlillərlə kifayətlənmir və ondan kəramət, mö’cüzəyə oxşar bir şey istəyirdilər. Osman müqəddəs nahiyənin yardımları ilə insanları həqiqətə inandırırdı.

Məhəmməd ibn Yə’qub Sə’d Əş’əri Qummidən bu barədə belə nəql edir: «Qum şiələri arasında xüsusi məqama malik olan Həsən ibn Nəzr imam Həsən Əsgərinin (ə) vəfatından sonra tərəddüddə qaldı. O, Əbu-Səddam və başqaları ilə qərara gəldi ki, növbəti imamı axtarsınlar. Həsən ibn Nəzr Əbu-Səddama dedi: «Bu il həccə getmək istəyirəm». Əbu-Səddam ondan bu səfəri tə’xirə salmasını istədi. Amma Həsən ibn Nəzr yuxu görüb qorxduğunu və bu səbəbdən də hökmən həccə gedəcəyini bildirdi. O, yola çıxmazdan qabaq Əhməd ibn Yə’la ibn Həmmamdan imama çatası əmlak haqqında vəsiyyət etdi. Tapşırdı ki, imam Həsən Əsgərinin (ə) canişini mə’lum olanadək bu əmanətləri qorusun. O, Bağdada getdi və orada müqəddəs nahiyə tərəfindən verilmiş bir fərman əlinə keçdi. Beləcə, həzrət Mehdinin (ə) imamətinə və Osman ibn Səid Əmrinin xüsusi vəkilliyinə əmin oldu».

Osman ibn Səid Əmrinin dövründə bu vəzifəni yerinə yetirmək çox ağır idi. Digər səfirlərin fəaliyyəti zamanında həzrət Mehdinin (ə) imamlığı və səfirlərin tə’yinatı hansısa bir həddə şiələr üçün sübuta yetirilmişdir. Məhəmməd ibn Osmanın dövründə də müəyyən həddə şəkk-şübhələr vardı. Bu səbəbdən də uyğun mövzuda Məhəmməd ibn Osmandan rəvayətlər nəql olunmuşdur.

### İMAMIN ADININ VƏ YERİNİN GİZLİ SAXLANMASI İLƏ ONUN QORUNMASI

Səfirlər bütün hallarda imamın adını və əlamətlərini məxfi saxlamalı idilər. Çünki bu məsələlərin aşkar olunması imam üçün təhlükə yaradırdı.

İmam Mehdi (ə) Məhəmməd ibn Osman ibn Səid Əmriyə fərmanında bəyan edirdi ki, .onun adını və əlamətlərini açıqlamaqdan çəkinsin və bu istiqamətdə çalışsın

Bu vəzifənin çox mühüm olduğunu nəzərə alaraq, deyə bilərik ki, səfirlərin seçilməsində mühüm me’yarlardan biri məhz bu xüsusiyyət idi. Əvvəlki -söhbətlərimizdə Əbu

Səhl Növbəxtiyə ünvanlanmış sual və onun cavabı haqqında danışdıq. Həmin söhbət .uyğun məsələnin necə zəruri olduğunu bariz şəkildə göstərirdi

## VƏKALƏT QURUMUNUN TƏŞKİLATLANMASI VƏ ONUN HİMAYƏSİ

Kiçik qeyb dövründə xalqın imam Mehdi (ə) ilə birbaşa rabitəsi kəsildi. İmamla rabitə vəkalət qurumu vasitəsi ilə gerçəkləşirdi. Əvvəlki imamların dövründə Bağdadda, Samirrada və başqa məntəqələrdə vəkalət qurumunun çoxsaylı vəkilləri fəaliyyət göstərirdi. İmam Həsən Əsgəri (ə) dünyasını dəyişdikdən sonra vəkalət qurumuna rəhbərlik dörd naibin ixtiyarına keçdi. Hər bir naib öz dövründə uyğun quruma .rəhbərlik edirdi

Bu qurum vasitəsi ilə şiələr öz suallarını vəkillərə ünvanlayır, onlar da səfirlər vasitəsi ilə müqəddəs nahiyədən alınmış cavabları şiələrə çatdırırdılar. Xüms-zəkat kimi dini .ödənclər də vəkillərə verilirdi və vəkillər bu əmanətləri quruma çatdırırdılar

Onlar öz fəaliyyətlərində vəkalət qurumunu düşmənin nüfuzundan qorumağa borclu idilər. Əgər düşmən vəkalət qurumuna nüfuz edə bilsəydi, vəkilləri və məs’ulları tanımaqla xalqla imam arasındakı əlaqəni kəsə bilərdi. İmam özü də bu istiqamətdə vəkillərə kömək göstərirdi. Məsələn, Mö’təzidin vəziri Übeydullah ibn Süleyman vəkalət qurumunu dağıtmaq üçün həzrətin vəkillərindən birinə dini ödənc göndərmişdi. O, bu yolla vəkillərin kimliyini müəyyənləşdirmək istəyirdi. Həzrət Höccət (ə) bu məsələdən xəbər tutan kimi fərman verdi ki, müvəqqəti olaraq heç bir vəkil xalqdan şər’i ödənc qəbul etməsin. Məhəmməd ibn Osman ibn Sə’di Əmri imam .Mehdinin (ə) bu fərmanını vəkillərə çatdırdı və bu yolla vəzirin qurğusu puça çıxdı

## FİQHİ VƏ E’TİQADİ SUALLARIN CAVABLANDIRILMASI

Dörd naibin mühüm vəzifələrindən biri də fiqhi və e’tiqadi suallara cavab verilməsi idi. Onlar bə’zən bu ehtiyacın ödənilməsi üçün imamla gizli görüşlərini açıqlamalı olurdular. Bə’zən müqəddəs nahiyə tərəfindən verilmiş fərman vasitəsi ilə şübhələr aradan qaldırılırdı. Bə’zən də fiqhi və e’tiqadi suallar imama ərz edilir və alınmış cavab şiələrə bildirilirdi. Misal olaraq İshaq ibn Yə’qubun və Qum əhlinin dördüncü səfirə ünvanlanmış suallarını göstərmək olar. Səfir sualları imama ərz edib, aldığı cavabları

ünvanına çatdırdı. Bə’zən isə mübahisəli məsələlərdə həqiqəti üzə çıxarmaq üçün .imam Mehdidən (ə) dəlillər öyrənilir və bəyan olunurdu

## İMAMA AİD ƏMLAKIN QƏBULU VƏ BÖLÜŞDÜRÜLMƏSİ

Vəkillər qurumunun imam Sadiqin (ə) dövründən fəaliyyətdə olan iş istiqamətlərindən biri xüms-zəkat kimi dini ödənclərin qəbul olunması və bölüşdürülməsi idi. Səfirlər imam Mehdiyə (ə) aid olan bu əmlakı birbaşa və ya vəkillər vasitəsi ilə qəbul edirdilər. Həmin əmanətlər ya mümkün yolla imama təhvil verilir, ya da onun göstərişi əsasında bölüşdürülürdü. İmam Mehdi (ə) atası imam Həsən Əsgərinin (ə) vəfatının səhəri günü Qumdan gəlmiş hey'ətə göstəriş verdi ki, ona aid olan əmlakı Bağdaddakı vəkillərə .təhvil versinlər

## VƏKİLLİK İDDİASINDA OLAN FIRILDAQÇILARLA MÜBARİZƏ

Dörd naibin vəzifələrindən biri də vəkillik iddiasına düşmüş fırıldaqçılarla mübarizə aparmaq, onları ifşa etmək idi. Peyğəmbər və imamların əsas məqsədi insanların hidayəti, doğru yola sövqü olduğundan xalqın fırıldaqçılar tərəfindən aldadılmasının qarşısı alınmalı idi. Ona görə də imamın xüsusi səfirləri fırıldaqçılarla mübarizə aparır, mümkün çaşqınlıqların qarşısını alırdılar. Bu istiqamətdə fəaliyyətin əsasını imam .Mehdinin (ə) xüsusi naiblərinin tanıtdırılması təşkil edirdi

Yetmiş illik kiçik qeyb dövründə bir çox fırıldaqçılar ifşa edildi. Belələrinə misal olaraq Hüseyn ibn Mənsur Həllacı, Məhəmməd ibn Əli Şələmğanini, ibn Əzaqiri, Əbu-Bəkri, Məhəmməd ibn Müzəffəri və başqalarını göstərmək olar. Dörd naib hər biri öz növbəsində belələrinə qarşı mübarizə aparır və müqəddəs nahiyədən fərmanlar alırdılar. Bu yalançı zümrənin işinin mahiyyətinin açıqlanması imamiyyə şiələrini çaşqınlıqdan qoruyurdu. Nəticədə xalq dörd naibin səfirliyinə daha çox e'timad göstərirdi. Uyğun məsələ ilə bağlı verilmiş fərmanlardan bə'zilərini nəzərdən keçirək: Əhməd ibn Hilal Kərxi yolunu azdıqda və bə'zi dini zərurətləri inkar etdikdə, eləcə də, Məhəmməd ibn Osman Əmrinin naibliyinə qarşı çıxdıqda müqəddəs nahiyə tərəfindən fərman verildi. Həmin fərmanda imam Mehdi (ə) Məhəmməd ibn Osman Əmriyə xitabən buyurdu: «Biz ibn Hilal və ondan uzaqlaşmayan hər bir kəsə arxa çeviririk. Allah onu bağışlamasın. Sən İshaqı və onun həmvətənlərinə dediklərimi e'lan et. Hər kəs .«səndən İbn-Hilal haqqında soruşsa, əhvalatı danış

Eləcə də, Məhəmməd ibn Osman Səid Əmrinin səfirliyi dövründə naiblik iddiası edən

Əbu-Məhəmməd haqqında müqəddəs nahiyə tərəfindən fərman verildi və onun .kimliyi şiələrə açıqlandı

## XAİN VƏKİLLƏRLƏ MÜBARİZƏ

Kiçik qeyb dövrünün başlanğıcında hələ imam Həsən Əsgəri (ə), hətta imam Hadinin (ə) dövründən vəkillik fəaliyyəti göstərmiş nümayəndələr vardı. İmam Həsən Əsgərinin (ə) dövründə bu vəkalət qurumunda fəaliyyət göstərmişdilər. Onlara Əbu Osman ibn Səid Əmri nəzarət edirdi. İmam Həsən Əsgərinin (ə) vəfatından sonra bu vəkillər həzrət Mehdinin (ə) səfiri Osman ibn Səid Əmriyə tabe idilər. Sonra isə onların fəaliyyətinə Məhəmməd ibn Osman ibn Səid Əmri başçılıq etmişdi. Bə’zən vəkillər arasında xəyanətə yol verənlər olurdu. Onlar öz ilahi vəzifələrinin icrasında çaşqınlıqlara yol verərək vəkalət qurumu üçün çətinlik yaradırdılar. Elə vəkillər olmuşdu ki, topladığı dini əmlakı imamın xüsusi səfirinə təhvil verməmiş və özündə saxlamışdı. Dörd naibdən hər biri öz dövründəki xain vəkillərlə mübarizə aparırdı. Bə’zən də müqəddəs nahiyə tərəfindən verilmiş fərman əsasında xalq belə vəkillərin .azğınlığından xəbər tuturdu

## XALQIN BÖYÜK QEYB DÖVRÜNƏ HAZIRLANMASI

Dörd naibin, xüsusi ilə də son səfir Əli ibn Məhəmməd Səmərinin son mühüm vəzifəsi .şiələrin böyük qeyb dövrünə hazırlanması olmuşdur

Yuxarıda sadalanmış vəzifələr arasında ikisi xüsusi yönümə malikdir. Bunlardan biri imam Mehdinin (ə) varlığı haqqındakı şübhənin aradan qaldırılması, imam Həsən Əsgərinin (ə) hazırda imam olan övladının dünyaya gəlişinin sübuta yetirilməsidir. Bu .vəzifə daha çox Osman ibn Sə’d Əmrinin öhdəsinə düşmüşdür

Xüsusi yönümə malik iki vəzifədən o biri xalqın böyük qeyb dövrünün qəbuluna hazırlanmasıdır. Bu vəzifə isə daha çox son səfir Əli ibn Məhəmməd Səmərinin öhdəsinə düşmüşdür. Bu sahədə imam Mehdi (ə) kəramət və mö’cüzə yolu ilə Əli ibn Səməriyə kömək göstərmiş və altı gün öncədən onun ölümü haqqında mə’lumat vermişdir. Bu dəqiq mə’lumat höccəti tamamlamış və şiələrin böyük qeyb dövrünü .qəbul etməsində mühüm rol oynamışdır

:Seyyid Məhəmməd Sədr bu barədə yazır: Səfirliyin iki əsas məqsədi var

Düşüncələri imam Mehdinin (ə) böyük qeyb dövrünə hazırlamaq və imamın

görünməməsi ilə bağlı narahatlıqları addım-addım aradan qaldırmaqdır. Çünki belə bir şəraitə hazır olmayan xalq imam Mehdini (ə) qəti şəkildə inkar edə bilərdi. Bu məqsədlə imam Hadi (ə) və imam Həsən Əsgərinin (ə) imamın qeyb məsələsini necə tədricən aşkarlamasını görürük. İmam Həsən Əsgəri (ə) şəxsən özünü xalqdan çox gizləyirdi. Səfirlik dövrü də düşüncələri böyük qeyb dövrünə tədricən hazırlamaq .məqsədi daşımışdır

İmamın səhnədən kənarlaşıb pünhan olması ictimai səhnədə durğunluqla müşayiət

edilir. Bütün hallarda ictimai rəhbərin kənarlaşması həmin cəmiyyətdə problemlərin həllini təhlükə altında qoyur. Səfirliyin tə’yin olunmasında məqsəd imamın xalqa .səfirlər vasitəsi ilə rəhbərlik etməsidir

Bütün səfirlər bu sahədə öz vəzifələrini yerinə yetirmişlər. Onlar imkan daxilində ictimai səhnədə iştirakı tə’min etmiş, zalım hakimiyyətin təzyiqləri altında səfirlik .məs’uliyyətlərini yetərincə icra etmişlər

## KİÇİK QEYB DÖVRÜNDƏ ƏHALİSİ ŞİƏ OLAN MƏNTƏQƏLƏRƏ VƏKİLLƏRİN TƏ’YİNİ

Kiçik qeyb dövründə dörd naib və səfirdən əlavə, həzrət Mehdinin (ə) xüsusi vəkilləri də fəaliyyət göstərmişdir. İslam aləminin şiə yaşayan müxtəlif məntəqələrində çoxsaylı vəkillər vəzifəsini icra edirdi. Əvvəlki imamların vəkilləri sayaq fəaliyyət göstərmək əmri almış nümayəndələr öz sualları ilə xüsusi vəkillərə və dörd naibə müraciət edirdilər. Onlar ən ucqar nöqtələrdə, eləcə də, dörd naibin sakin olduğu Bağdadda fəaliyyət göstərirdilər. Təbii ki, kiçik qeyb dövründə vəkillər şiələrlə Bağdad arasında rabitəni tə’min edirdilər. Bu vəkillərin çoxsaylı olmasına dəlillər mövcuddur. Təəssüf ki, onların adları tarixi mənbələrdə dəqiq göstərilməmişdir. Şeyx Tusi «Əl-ğeybət» kitabında vəkillərin çoxsaylı olmasını qeyd edərək, onlardan yalnız bə’zilərinin .adını zikr edir

Əvvəlki əsrlərdə olduğu kimi, qeyb dövründə də vəkalət qurumunun fəaliyyəti zəruri olduğundan həzrət Höccət (ə) ehtiyac olan qədər vəkillər tə’yin edirdi. Mənbələrdə verilən mə’lumata əsasən, imam rəsmən özü bu işlə məşğul olurdu. Məsələn, Məhəmməd ibn İbrahim ibn Məhzyar Əhvazi şəxsən həzrət Mehdinin (ə) göstərişi ilə Əhvaz nahiyəsinə vəkil tə’yin olunmuşdu. Həzrət uyğun məsələ ilə bağlı buyurmuşdur: .««Səni (Məhəmmədi) atanın yerinə vəkil olaraq tə’yin etdim

## :ADI MÜƏYYƏNLƏŞDİRİLMİŞ BƏ’Zİ VƏKİLLƏR

### MƏHƏMMƏD İBN CƏ’FƏR ƏL-ƏSƏDİ ƏL-KUFİ ƏL-RAZİ

Şeyx Tusi öz «Rical» kitabında bu şəxsi «Əhədul-Əbvab» adı ilə xatırlamışdır. O, «Əl-ğeybət» kitabında Məhəmmədi qeyb dövrünün ləyaqətli vəkillərindən saymış və ona xüsusi səfirlər tərəfindən fərmanlar gəldiyini bildirmişdir. Sonra isə bu şəxsin

məqamını açıqlayan rəvayətlər nəql olunmuşdur. Rəvayətlərdən mə’lum olur ki, bu şəxs Rey məntəqəsində baş vəkil kimi fəaliyyət göstərmişdir. Ətrafdakı vəkillər öz suallarını ona

ünvanlanmışlar. Bu rəvayətlərdən biri də Saleh ibn Əbu-Salehin dilindən nəql olunur: «Hicri ٢٩٠-cı ildə bə'zi adamlar məndən tələb etdilər ki, onların xüms-zəkatını qəbul edim. Mən bu barədə müqəddəs nahiyədən vəzifəmi soruşdum. Cavab gəldi ki, «Məhəmməd ibn Cə'fər Reydə e'tibarlı vəkildir və şər'i ödənclər ona təhvil verilməlidir».

Rəvayətdən mə'lum olur ki, Əbül-Həsən Əsədi ikinci səfir Məhəmməd ibn Osman Əmrinin naibliyi dövründə vəkillik məs'uliyyətini daşımışdır. Bu şəxs həm də baş vəkil olmuşdur. Bə'zi dəlillərə əsasən, bu şəxs həm də İranın şərq məntəqələrindəki vəkillərə nəzarət etmişdir.

### ƏBU-ƏBDÜLLAH İBN HARUN İBN İMRAN ƏL-HƏMƏDANİ

Şeyx Tusi «Təhzib» kitabında göstərdiyi kimi, bu şəxs şiə böyüklərindən olmuşdur. Nəcaşinin bildirdiyinə görə o və onun oğlu Həmədan nahiyəsində ətrafdakı vəkillərin müraciət etdiyi baş vəkil olmuşlar. Nəcaşi belə yazır: «Həmədanda Qasim ibn Məhəmmədin dövründə onunla yanaşı Əbu-Əli Bəstam ibn Əli və Əl-Əziz ibn Züher vəkillik fəaliyyətinə məşğul olmuşlar. Onlar öz fəaliyyətlərində Həsən ibn Harun ibn İmran Həmədaniyə tabe idilər. Ondan qabaq isə atası Əbu-Əbdüllah ibn Haruna müraciət edərdilər. Əbu-Əbdüllah və onun oğlu Əbu Məhəmməd hər ikisi imamın vəkilləri idilər».

### MƏHƏMMƏD İBN SALEH İBN MƏHƏMMƏD ƏL-HƏMƏDANİ

Şeyx Tusi «Rical» kitabında bu şəxsi imam Həsən Əsgərinin (ə) səhabələrindən saymışdır. Şeyx Səduq bu şəxsi imam Mehdinin (ə) vəkillərindən saymış və onun imamla görüşdüyünü, həzrətin mö'cüzələrindən xəbərdar olduğunu bildirmişdir.

### MƏHƏMMƏD İBN İBRAHİM MƏHZYAR ƏL-ƏHVAZİ

Bu şəxs də müqəddəs nahiyə tərəfindən tə'yin olunmuş vəkil kimi tanınmışdır. Şeyx Səduq da bu şəxsi həzrət Mehdinin (ə) vəkillərindən saymışdır. O bildirir ki, Əbu-İshaq imamla görüşə nail olub, onun mö'cüzələrini müşahidə etmiş vəkillərdəndir. Bu şəxs Əhvaz nahiyəsinin vəkili olmuş, atası dünyasını dəyişdikdən sonra onun ixtiyarında olan əmlakı Bağdada aparıb imamın səfirinə təhvil vermişdir. Nəhayət, müqəddəs nahiyə tərəfindən verilən fərmanla Əbu-İshaq atasının yerinə tə'yin olunmuşdur.

### QASİM İBN ƏL–Ə’LA

Bu şəxs Azərbaycan əhli olmuş və müqəddəs nahiyə tərəfindən həmin məntəqəyə vəkil tə’yin olunmuşdur. Şeyx Səduq onun həzrət Mehdi (ə) ilə görüşmüş vəkillərdən olduğunu bildirir. Şeyx Tusi «Əl-ğeybət» kitabında bu şəxs haqqında müfəssəl mə’lumat vermişdir. Şeyx Tusinin bildirdiyinə görə, həzrət Mehdinin (ə) ona xüsusi diqqəti .olmuşdur

### HƏSƏN İBN MƏHƏMMƏD İBN QƏTTAH SEYDƏLANİ

Həsən ibn Məhəmməd kiçik qeyb dövründə Vasət məntəqəsində vəqf vəkili olmuşdur. Cə’fər ibn Məhəmməd nəql edir ki, Əbu-Cə’fər Əmri onu bir miqdar libas və pulla Vasətə göndərdi. Burada Həsən ibn Məhəmmədlə görüşdükdə xəbər tutur ki, Vasət şiələrindən olan Məhəmməd ibn Əbdüllah dünyasını dəyişmişdir və bu libasla pul onun dəfni üçün göndərilmişdir. Bu söhbətdən mə’lum olur ki, Həsən ibn Məhəmməd ikinci .səfirin dövründə vəkilliklə məşğul olmuşdur

### MƏHƏMMƏD İBN ŞAZAN İBN NUƏYM ƏL–ŞAZANİ ƏL–NİŞABURİ

Bu şəxs də müqəddəs nahiyənin vəkillərindən sayılmışdır. O öz vəkilliyi haqqında belə bir əhvalat danışmışdır: «Hesabımda dörd yüz səksən dirhəm pul toplanmışdı. İyirmi dirhəm də özümdən əlavə edib Əbül-Həsən Əsədiyə göndərdim. Mən həmin pula iyirmi dirhəm əlavə etdiyimi yazmamışdım. Əbül-Həsən Əsədi yazdığı cavabda .«bildirirdi ki, iyirmi dirhəmi mənə məxsus olan beş yüz dirhəmi almışdır

Bu əhvalat onun vəkil olduğunu göstərir. Çünki onun ixtiyarında yığılmış dörd yüz səksən dirhəm imam malı olmuşdur. Şeyx Səduq da onun imamın vəkili olduğunu və imamla görüşüb mö’cüzələrini müşahidə etdiyini təsdiqləyir. Mənbələrdən bu da mə’lum olur ki, o

Nişaburda vəkillik etmiş, Əbül-Həsən Əsədinin, eləcə də, ikinci naib Məhəmməd ibn Osmanın müasiri olmuşdur.

### ƏZİZ İBN ZÜHEYR

Nəcaşi bildirir ki, Əziz ibn Züheyr müqəddəs nahiyə tərəfindən tə'yin edilmiş vəkillərdən olmuş və Həmədanda fəaliyyət göstərmişdir. O, vəkalət işlərində Əbu-Məhəmməd Həsən ibn Haruna tabe olmuşdur.

### MƏNBƏLƏRDƏ ADI GÖSTƏRİLMİŞ SAİR VƏKİLLƏR

Mənbələrdə bildirilir ki, Qasim ibn Məhəmməd ibn Əli ibn İbrahim Həmədani Həmədanda, Əbu-Əli Bəstam ibn Əli yenə həmin şəhərdə, Əli ibn əl-Hüseyn ibn Əli Ət-Təbəri Səmərqənddə, Əbu Haşim Davud ibn əl-Qasim əl-Cə'fəri hansısa bir məntəqədə, Həsən ibn Ən-Nəzr əl-Qummi adı çəkilməyən bir ərazidə, Haciz ibn Yəzid əl-Vəşşa Bağdadda vəkillik fəaliyyəti göstərmişlər.

### XAİN VƏKİLLƏR VƏ VƏKİLLİK İDDİASI EDƏN YALANÇILAR

Əvvəlki fəsildə işarə olunduğu kimi, vəkalət qurumunun fəaliyyətində bə'zi mənfi cərəyanlar da müşahidə edilmişdir. Cərəyanların müxtəlif səbəbləri olmuşdur. Həmin cərəyanlardan biri imamlar tərəfindən vəkil tə'yin olunduqdan sonra xəyanətə əl atan adamlar arasında müşahidə edilir. İkinci mənfi cərəyan vəkillik iddiasına düşmüş fırıldaqçılara aiddir. Belələri qısa bir müddət ətraflarına bir qədər adam toplasalar da, sonradan yalanları üzə çıxmış və rüsvay olmuşlar. Bu iki cərəyanla həm kiçik qeyb dövründə, həm də vəkalət qurumunun tə'sisindən əvvəlki dövrlərdə rastlaşmaq olur. Kiçik qeyb dövründə uyğun hallar daha geniş şəkildə gözə çarpır. Olsun ki, bunun səbəbi imamın qeybə çəkilməsi və işin vəkillərə həvalə edilməsi olmuşdur. Xainlər və fırıldaqçılar bu şəraiti özləri üçün münasib fürsət hesab etmişlər.

Bu iki cərəyanla yaxından tanış olmaq üçün onların öncüllərini tanımaq lazım gəlir. Söhbətimizin

əvvəlində vəkillərin xəyanəti, onlar arasındakı fəsadlar, bu fəsadların səbəbləri və .nəticələri ilə tanış olacaq, sonra isə ikinci cərəyanı araşdıracağıq

## VƏKALƏT QURUMUNUN BƏ'Zİ NÜMAYƏNDƏLƏRİNİN XƏYANƏTİ

Şübhəsiz ki, vəkillik olduqca məs'uliyyətli bir iş olduğundan mə'sum imamlar vəkil seçimində böyük diqqət göstərər və e'tibarlı adamları vəkil tə'yin edərdilər. Amma nəfsinin tərbiyəsi ilə ardıcıl şəkildə məşğul olmayan insanın daim büdrəmə ehtimalı vardır. İmamların vəkilləri arasında da elə adamlar müşahidə edilir ki, ilkin tə'yinatda zəruri şərtlərə malik olan bu adamlar şərait dəyişdikdən sonra xəyanətə əl atmış, .nəticədə, imamın lə'nətlərinə düçar olmuşlar

Əlbəttə ki, bütün xəyanətlərin və büdrəmələrin ayrı-ayrı səbəbləri mövcuddur. Bütün büdrəmələrin arxasında nəfsin tərbiyə olunmaması dayansa da, vəkillərin xəyanətlərinin ayrı-ayrılıqda səbəblərini araşdırmaq üçün onların şəxsiyyətləri ilə yaxından tanış olmaq lazım gəlir. İmkan daxilində əvvəlcə bu cərəyanların kiçik qeyb dövründən əvvəlki vəziyyəti ilə tanış olacaq, sonra isə kiçik qeyb dövründəki xain .vəkillərin şəxsiyyətini araşdıracağıq

## VAQİFİYYƏ

Hicri ١٨٣-cü ildə imam Kazim (ə) dünyasını dəyişdikdən sonra onun bir qrup yaxın adamı və müxtəlif nöqtələrdəki vəkilləri iddia etdilər ki, imam sağdır, sadəcə, nəzərlərdən gizlidir. Guya o, tezliklə qaim adı ilə zühur edib, ədalətli bir İslam hökuməti quracaq. Onlar əvvəlcə imamın səkkiz aydan sonra zühur edəcəyini bildirirdilər. Bir qrup şiə onların bu baxışını müdafiə edirdi. İmam Kazimin (ə) qaim olduğuna və ondan sonra heç bir canişinin olmamasına inananlar şiələr arasında «vaqifiyyə» ardıcılları kimi tanınmağa başladılar. Vaqifiyyə məsləkində olanlar arasında tanınmış alimlər və mühəddislər də vardı. Bə'zi şiə alimləri vaqifiyyə məzhəbinin hicri beşinci əsrdə məhv olub getdiyini təsəvvür etsələr də, ən azı hicri altıncı əsrin ortalarınadək bu məzhəbin .ardıcılları mövcud idilər

İmam Kazimin (ə) ən yaxın tərəfdarlarından və vəkillərindən ibarət olan vaqifiyyə başçıları ilə tanış olaq: Əli ibn Əbu-Həmzə Bətaini, Osman ibn İsa Ərrəvasi, Ziyad ibn

Mərvan əl-Qəndi, Əhməd ibn Əbu-Bəşər əl-Sərrac, ibn Əbu-Səid əl-Məkari, Mənsur .ibn Yunus Bəzərc

.Bu vəkillərin ixtiyarında şiələrin imam Kazimə (ə) göndərdiyi dini haqlar toplanmışdı

Təbii ki, həzrətin vəfatından sonra bu əmlak onun canişini imam Rizaya (ə) təhvil verilməli idi. Amma yuxarıda adı sadalanan vəkillər ixtiyarlarında olan əmlaka tamah salaraq, imam Rizanın (ə) canişinliyini inkar etdilər. Vəkillərin belə bir məqsəddə olduğunu müxtəlif rəvayətlər təsdiqləyir. Bu rəvayətlərdən biri də Yunus ibn Əbdür-Rəhman tərəfindən nəql olunmuşdur. Rəvayətin məzmunu belədir: «İmam Kazimin vəfatından sonra onun vəkillərinin ixtiyarında böyük miqdarda əmlak toplanmışdı. Vaqifiyyə söhbətinin ortaya atılmasının və imamın vəfatının inkar olunmasının səbəbi həmin bu əmlak idi. Məsələn, Ziyad ibn Mərvan Qəndinin ixtiyarında yetmiş min, Əli ibn Əbu-Həmzənin ixtiyarında otuz min dinar toplanmışdı». Yunus ibn Əbdür-Rəhman vəkillərin bu çaşqınlığını müşahidə etdikdən sonra xalqı imam Rizanın (ə) imamətinin qəbuluna də'vət etmişdir. Onun bu çağırışlarından xəbər tutan Əli ibn Əbu-Həmzə və Ziyad ibn Mərvan Yunusa on min dinar təklif edərək bu çağırışlardan çəkinməsini istəmişlər. Yunus onların cavabında demişdir: «İmamlardan rəvayət olunmuşdur ki, ortaya bid'ət çıxdıqda bundan agah olan şəxs bildiyini izhar etməlidir. Əgər belə etməsə, Allah iman nurunu ondan alar. Mən heç bir halda cihad və ilahi göstərişə arxa çevirmərəm». Həmin iki şəxs Yunusun cavabını eşitdikdən sonra onunla düşmənçiliyə .başlamışlar

Vaqifiyyə başçılarını doğru yoldan sapdıran səbəblərdən biri də onların imam Rizanın (ə) məqamına həsəd aparmaları ola bilər. Əlbəttə ki, vaqifiyyə başçılarının iddialarına qəlbən inananlar da olmuşdur. Vaqifiyyə başçıları öz iddialarını xalqın beyninə yeritmək üçün bütün vasitələrdən istifadə edirdilər. Nəql olunur ki, Məhəmməd ibn Bəşir insan formalı bir müqəvva düzəldib, onu müxtəlif üsullarla hərəkətə gətirər və avam adamların beyninə yeridərdi ki, bu imam Kazimdir. İmam Riza (ə) bu hərəkətinə görə Məhəmməd ibn Bəşirin qanını halal buyurmuşdu. İmam (ə) Əli ibn Hədid Mədainiyə buyurmuşdu: «Əgər bacarsan, onu qətlə yetir. İmkanın olduğu halda onu .«öldürməsən, günahkar olacaqsan

### İMAM RİZAYA (Ə) QARŞI CASUSLUQ

Dünyapərəstlik, onun aldadıcı zahirinə meyl, iman zəifliyi və imamların yetərincə tanınmaması imamın ətrafındakı bə'zi insanların şeytana aldanmasına səbəb olurdu. İmama yaxın olduğu halda yolunu çaşanlardan biri də Hişam ibn İbrahim Abbasi

Həmədani Raşidi olmuşdur. Şeyx Səduqun bildirdiyinə görə, bu şəxs imam Riza (ə) Tus şəhərinə köçürülənədək onun ən yaxın adamlarından olmuşdur. Hişam imamın Mədinədəki işlərini yerinə yetirərdi. O, alim və ədib bir insan idi. Əslində Hişam imamın Mədinədə baş vəkili vəzifəsini daşıyırdı. Müxtəlif məntəqələrdən imama ünvanlanmış xüms-zəkat və digər dini

ödənclər ona verilirdi. İmam Riza (ə) Tus şəhərinə köçürüldükdən sonra Hişam ibn İbrahim hökumət dairələri ilə yaxınlıq edərək bir müddət sonra onların casusuna çevrildi. Xəlifə Mə’mun Hişamı imama qapıçı tə’yin etdi. İmam Rizanın (ə) evində baş verən ən kiçik hadisələr belə Hişam vasitəsi ilə Mə’muna çatdırılırdı. İmamla görüşmək istəyənlər Hişam ibn İbrahimə müraciət etməli idilər. Bu şəxs xəlifə Mə’muna o qədər yaxınlaşdı ki, onun e’tibarını qazanaraq Mə’munun oğlu Abbasın tə’limini öz öhdəsinə .götürdü. Ona görə də Hişama «Hişam Abbasi» deyərdilər

## İMAM HADİNİN (Ə) XAİN VƏKİLİ FARİS İBN HATƏM İBN MAHUYEYE QƏZVİNİ

Bu şəxs imam Hadinin (ə) Samirrada əsas köməkçilərindən biri olmuşdur. Özü Qəzvindən olduğu üçün həmin məntəqənin əhalisi, adətən, ona müraciət edər, xüms-zəkatlarını ona verərdilər. Amma bu insanın batinindəki dünyapərəstlik zaman .ötdükcə özünü büruzə verməyə başladı

O, yolunu azaraq, imam malına əl uzatmağa başladı. Onun yolunu çaşmasının nişanələrindən biri də imamın Samirradakı digər bir baş vəkili Əli ibn Cə’fər Həmani ilə rəqabət aparması oldu. Bu rəqabət güclənib, sonda düşmənçiliyə çevrildi. Bu düşmənçilik hər tərəfdən hücumlara mə’ruz qalan şiə cəmiyyəti üçün təhlükəli bir vəziyyət yaratdı. Eləcə də, həzrətin vəkillərinə qarşı bədbinlik, inamsızlıq özünü göstərməyə başladı. Bu səbəbdən bə’zi şiələr xüms-zəkat kimi dini ödənclərini vəkillərə təqdim etmədilər. Bundan əlavə, həmin iki şəxs baş vəkil olduğundan müxtəlif məntəqələrdəki vəkillər şiələrdən toplanmış məbləği imama çatdırmaqda .müşkülə düşdülər

İmam vəziyyətə müdaxilə edərək Əli ibn Cə’fər Həmaninin tərəfini tutdu və məntəqələrdəki vəkillərə göstəriş verdi ki, imamla rabitələrində Faris ibn Hatəmdən istifadə etməsinlər. Eləcə də, vəkillərə tapşırıldı ki, bu göstərişə məhrəmanə əməl edərək Faris ibn Hatəmi qızışdırmasınlar. Çünki Faris nüfuzlu bir adam idi və şiələrlə imam arasında mühüm rola malik olmuşdu. İranın mərkəz və qərb məntəqələrinin şiələri, adətən, öz xüms-zəkatlarını onun vasitəsi ilə imama çatdırardılar. Amma imamın göstərişinə baxmayaraq, Faris həmin dini ödəncləri toplayır və imama təqdim etmirdi. Bir qədər sonra imam Farislə bağlı göstərişini şiələrə aşkar şəkildə e’lan

etmək qərarına gəldi. Bütün vəkillərə çatdırıldı ki, kimsə dini ödənclərini Farisə təqdim etməməlidir. Nəhayət, imam hicri ۲۵۰-ci ildə, rəbiül-əvvəl ayının doqquzunda Farisi yazılı şəkildə lə’nətləyərək bəyanat verdi. Həmin bəyanatdan sonra xəyanətkar vəkil açıq

şəkildə imama qarşı mübarizəyə başladı. Mənbələrdə onun fəaliyyətləri haqqında ətraflı mə’lumat verilməsə də, bildirilir ki, o şiələri bid’ətə çağırır və imama itaətdən .çəkindirirdi

Məsələ o qədər ciddi bir şəkil almışdı ki, imam bu şəxsin qətli haqqında hökm çıxarmışdı. Belə göstərişlər olduqca istisna hallarda verilərdi. İmamın bu hökmündən sonra Cüneyd adlı bir şiə Farisi qətlə yetirdi və beləcə, vəkalət qurumu üçün olduqca .təhlükəli olan cərəyanlardan birinin kökünə balta çalındı

## ÜRVƏ İBN YƏHYA

Ürvə imam Hadi (ə) və imam Həsən Əsgərinin (ə) Bağdaddakı vəkili idi. Bu şəxs ilk əvvəllər o qədər e’tibarlı idi ki, imam Həsən Əsgəri (ə) onun məqamı haqqında xoş sözlər söyləmişdi. Amma o da Faris ibn Hatəm kimi sonradan imam malına göz dikdi, hətta imam Hadi (ə) haqqında yalan danışmaqdan da çəkinmədi. O əvvəlcə imam Həsən Əsgərinin (ə) malından bir hissəsini oğurladı, sonra isə həmin malın digər hissəsini yandırdı. Onun bu hərəkəti imamı qəzəbləndirdi və imamın nifrini ilə elə .səhəri gün həlak oldu

## ƏHMƏD İBN HİLALUL–İBRƏTAİ VƏ ƏHMƏD İBN HİLALUL–KƏRXİ

Mamağani və Xoyi kimi bə’zi alimlərin fikrincə, bu iki ad eyni bir şəxsə aiddir. Amma Şeyx Tusi «Əl-ğeybət» kitabında bildirir ki, birinci şəxs kiçik qeyb dövründən əvvəl, ikinci şəxs isə kiçik qeyb dövründə vəkil olmuşdur. Rəsmi şəkildə imam Həsən Əsgərinin (ə) fərmanı ilə lə’nətlənən isə Əhməd ibn Hilal olmuşdur. Bu şəxs imam malına göz dikərək xəyanətə yol vermişdir. Əvvəlki imamlarla müasir olmuş bu şəxs imam Həsən Əsgərinin (ə) vəkili olmuşdur. İmamın fərmanından sonra şiə cəmiyyəti yenidən onun .haqqında həzrətə sorğu ünvanlamış və ikinci fərmanla əvvəlki fərman təsdiqlənmişdir

Əhməd ibn Hilal Kərxi isə kiçik qeyb dövründə müqəddəs nahiyənin ikinci səfiri ilə .düşmənçilik etdiyindən müqəddəs nahiyənin fərmanı ilə lə’nətlənmişdir

## (MƏHƏMMƏD İBN ƏLİ İBN BİLALİL–BİLALİ (ƏBU TAHİR

Bu şəxs imam Həsən Əsgərinin (ə) səhabələrindən olmuşdur. Təbərsi onu kiçik qeyb

dövrünün səfirlərindən və tanınmış nümayəndələrindən saymışdır. Onun sözlərindən belə görünür ki, Əbu–Tahir e’tibarlılıqda Qasim ibn əl–Ə’la, Əhməd ibn İshaq Əş’əri, –Əbül

Hüseyn Əsədi kimi uca məqamlı bir şiə olmuşdur. Şeyx Tusi isə onu qeyb dövrünün bəyənilməmiş vəkillərindən hesab etmişdir. Bu səbəbdən də Əllamə onun .rəvayətlərini nəql etməkdən çəkinmişdir

Əbu-Tahir imam Həsən Əsgərinin (ə) dövründə onun vəkili və imamın vəfatından sonra müqəddəs nahiyənin nümayəndəsi olmuş, amma ikinci səfir Məhəmməd ibn Osman Əmri fəaliyyətə başladıqdan sonra ixtiyarındakı imam malını saxlayaraq, Məhəmməd ibn Osman Əmriyə qarşı müxalif mövqe tutmuşdur. Bu şəxslə ikinci səfir arasında maraqlı bir əhvalat baş vermişdir. Əmri ibn Bilalın bir qrup adamla əyləşdiyi otağına daxil olaraq, onu Allaha and vermişdir ki, əsrin imamının dini ödənclərin Əmriyə təhvil verilməsi barədəki fərmanını e'tiraf etsin. İbn-Bilal e'tiraf etməyə məcbur olmuşdur. Əmri otaqdan xaric olduqdan sonra o öz ardıcıllarına bildirmişdir ki, Əmri məni bir otağa daxil etdi, həmin otağın üst hissəsindən bir şəxs mənə Əmri haqqında göstəriş verdi. Otaqdakı şəxsin heybətindən anladım ki, o həzrət Mehdidir. İbn-Bilal həmin şəxsdir ki, imam Həsən Əsgərinin (ə) baş vəkili Əli ibn Cə'fər Həmaninin əliaçıqlılığına e'tiraz etmişdir. Onun bu e'tirazına cavab olaraq imam buyurmuşdur ki, onlara aid işlərə kimsə qarışa bilməz. Azğın yol tutmuş Şərii, Numəyri, .Hilali kimi Bilal da müqəddəs nahiyə tərəfindən lə'nətlənmişdir

### (MƏHƏMMƏD İBN ƏLİ ƏL-ŞƏLƏMƏĞANİ (ƏBU-CƏ'FƏR, İBN ƏBİL-ƏZAQİR

Bu şəxs Vasət məntəqəsindəki Şələmğan kəndindən olduğu üçün «Şələmğani» adlandırılmışdır. O əvvəlcə düzgün e'tiqada malik alim, saleh bir şəxs olmuşdur. «Ət-təklif», «Əl-İsmət», «Əl-Əvsiya» və bir sıra başqa kitablar bu şəxsə məxsusdur. Şələmğani o qədər e'tibarlı sayılmışdır ki, üçüncü səfir Hüseyn ibn Ruh, Müqtədirin dövründə gizlənməyə məcbur olduğu vaxt onu öz yerinə canişin qoymuşdur. Həmin vaxt şiələr öz sualları və istəkləri ilə ona müraciət edər, imam Mehdinin (ə) fərmanları .onun vasitəsi ilə çatdırılardı

Amma onun Hüseyn ibn Ruha qarşı kinli münasibəti, eləcə də əqidəsindəki çaşqınlıqlar haqq məzhəbi tərk edib, batil bir məzhəbə daxil olmasına səbəb olmuşdur. O, zaman .ötdükcə daha da azğınlaşmış və nəhayətdə kafir və mürtəd dərəcəsinə enmişdir

Şələmğani öz ardıcıllarını inandırırdı ki, həzrət Peyğəmbərin (s) ruhu Məhəmməd ibn Osman Əmriyə, həzrət Əlinin (ə) ruhu Hüseyn ibn Ruha, həzrət Fatimənin (s) ruhu Ümmü-Gülsümə keçmişdir. O bütün bunları öz ardıcıllarına sirr kimi açıqlayırdı. Bu şəxs öz küframiz fikirlərini Hüseyn ibn Ruha aid etmişdir. Bu xəbər ibn Ruha çatdıqda o Şələmğanini lə'nətləyərək, şiələri ondan uzaqlaşmağa çağırmışdır. Amma Şələmğaninin aldadıcı düşüncələri Bəni-Bistami kimilərini özünə cəlb etmişdir. İbn-Ruh məktubla Bəni-Bistamiyə müraciət etmiş, onun Şələmğanidən uzaqlaşmasını .istəmişdir

Əvvəldə qeyd etdiyimiz kimi, bu şəxsin batil əqidələrindən biri bu idi ki, guya həzrət Zəhranın (s) ruhu Əbu-Cə'fər Əmrinin qızı Ümmü-Gülsümün bədəninə keçmişdir. Bu azğın fikir Bəni-Bəstama o qədər tə'sir etmişdi ki, Hüseyn ibn Ruh şiələr arasında Şələmğaniyə lə'nət xəbərini yaymağa məcbur olmuşdur. Xüsusi ilə Bəni-Növbəxt şiələrinə ondan uzaqlaşmaq əmr edilmişdir. Daha sonra həzrət Höccət tərəfindən Şələmğani ilə bağlı fərman çıxarılmışdır. Bu fərman ibn Ruha Müqtədirin evində məhbus olduğu vaxt çatdı. Fərman Əbu-Əli ibn Həmmam vasitəsi ilə bütün şiə .başçılarına bəyan edildi. Hamı yekdil şəkildə Şələmğanidən üz döndərdi

İbn-Ruhun müxalifliyindən xəbər tutan Şələmğani xəlifə Razinin vəzirinin məclisində, şiə camaat arasında belə dedi: «Bizimlə bir yerdə olun, əlimi onun əlinin üstünə qoyum. Əgər göydən bir atəş enib onu yandırmasa, dedikləri haqdır. O, bu sözləri ilə İbn-Ruhu «mübahiləyə» (Allahdan haqsız kəsə cəza istəməyə) çağırdı. Amma bu söz xəlifəyə çatdıqda o, Şələmğanini həbs edib qətlə yetirdi. Bununla da şiələr onun şərrindən .qurtuldular

Şələmğani Hüseyn ibn Ruhun ona e'timadından, şiə xalqının sadəliyindən öz pis məqsədləri üçün istifadə etdiyindən, İbn-Ruha həsəd apardığından, dünyapərəstlik xəstəliyinə yoluxduğundan çox pis aqibətə düçar oldu və imamət məqamı tərəfindən .lə'nətləndi

### VƏKİLLİK İDDİASINDA OLAN FIRILDAQÇILAR

Vəkillik şiələr arasında uca bir məqam idi. Şiələr mə'sum imamın vəkili, nümayəndəsi kimi tanıdıqları şəxsə böyük ehtiram göstərir, bütün məsələlərdə ona müraciət

edirdilər. Bu şəxs böyük ictimai məqama malik olurdu. Vəkillərin mühüm fəaliyyətlərindən biri xüms-zəkat kimi şər’i ödənclərin qəbulu olduğundan onlar imamın və şiələrin e’tibarı ilə böyük məbləğlərə nəzarət edirdilər. Bu səbəbdən də bə’ziləri heç bir əsas olmadan özünü

imamın vəkili kimi təqdim edirdi. Qeyd olunduğu kimi, belə yalan iddiaları doğuran dünyapərəstlik, bə’zən də əqidə çaşqınlığı olurdu. Bu sayaq cərəyanları müşahidə edərkən görürük ki, kiçik qeyb dövründə uyğun sahədəki fırıldaqçılıq zirvə həddinə çatıbmış. Belələri imamın qeybdə olmasını özləri üçün fürsət sayırdılar. Uyğun məsələ ilə bağlı qeyb dövrünü nəzərdən keçirməzdən qabaq yalançı vəkillər haqqında bə’zi .cərəyanlar haqqında danışacağıq

### (ƏHMƏD İBN MƏHƏMMƏD SƏYYARİ (ƏBU–ƏBDÜLLAH

Bu şəxs imam Cavadın (ə) dövründə yalandan vəkillik iddiası etmiş, imamın nümayəndəsi olduğunu bildirmişdi. Bu işdən xəbər tutan imam onu ifşa edərək, şiələrin ona müraciət etməsinə qadağa qoymuşdur. İmam həmin şəxs haqqında verilmiş sualı belə cavablandırmışdır: «O şəxs iddia etdiyi məqamda deyil, ona heç nə .«verməyin

### ƏLİ İBN HƏSİKƏ, QASİM ŞI’RANİ, MƏHƏMMƏD İBN FƏRAT

Bu üç şəxs imam Hadinin (ə) dövründə yanlış əqidəyə malik olmuş, hətta peyğəmbərlik iddiası etmişlər. Əli ibn Həsikə Qasim Şi’raninin ustadı olmuş, öhdəsindən şər’i vəzifələrin götürüldüyünü iddia etmişdir. Bu cərəyan o qədər təhlükəli şəkil almışdı ki, imam Hadi (ə) onun və onun həmfikirləri haqqında bir məktubda çox sərt göstəriş vermişdir. Şiələrə müraciətlə yazılmış məktubda belə deyilir: «İbn Həsikə, ona Allahın lə’nəti olsun, yalan deyir. Mən onu yalnız bir bəndə kimi tanıyaram. And olsun Allaha ki, bütün peyğəmbərlər təkallahlığa, namaza, zəkata, oruca, həccə, vilayətə də’vət etmişlər. Məhəmməd yalnız bir Allaha itaətə çağırmışdı. Biz də onun canişinləri, övladlarıyıq. Bu şəxsin dediyi sözlərdən Allaha pənah aparıram. Onları, Allahın lə’nəti olmuş bu şəxsləri özünüzdən uzaqlaşdırın. Xəlvəti bir məkan olduqda, əliniz onlara .«çatsa başlarını əzin

### HƏSƏN İBN MƏHƏMMƏD İBN BABA QUMMİ

İmam Hadi (ə) və imam Həsən Əsgəri (ə) dövrünün fırıldaqçılarından biri də bu şəxs olmuşdur. Kəşşinin nəql etdiyi bir rəvayətə görə, imam Həsən Əsgəri (ə) bu şəxsin peyğəmbərlik və vəkillik iddiasına düşdüyünü bildirmişdir. Həzrət ardıcıllarından olan

Übeydi Kitabətə belə buyurmuşdu: «Mən Fəhri və Həsən ibn Məhəmməd ibn Baba Qummidən

Allaha pənah aparıram. Səni və bütün ardıcıllarımı ondan həzər qılmağa çağırıram. Bu iki şəxsə Allahın lə’nəti olsun. Onlar bizim vasitəmizlə xalqdan qazanmaq istəyirlər. Hər ikisi fitnə əhlidirlər. Allah onları əzaba salsın. İbn-Baba güman edir ki, mən onu peyğəmbərliyə seçmişəm. Ona lə’nət olsun ki, şeytanın hakimiyyəti altına düşüb».

Kəşşi, Səhl ibn Məhəmmədin belə dediyini nəql edir: «İmam Hadiyə (ə) ərz etdim ki, ey mənim ağam, sizin ardıcıllarınız üçün Həsən ibn Məhəmməd ibn Babanın məsələsi müşkül olub. Bu barədə nə buyurursunuz? Onunla necə rəftar edək, yaxınlaşaq, yoxsa uzaqlaşaq? Həzrət öz mübarək xətti ilə belə yazdı: «O və Faris ibn Hatəm məl’undurlar. Bu iki şəxsdən uzaq olun. Allah hər ikisinə lə’nət etsin və Farisə olan lə’nətini artırsın».

Bəli, Həsən ibn Məhəmməd ibn Baba imam Hadi (ə) və imam Həsən Əsgəri (ə) dövrünün fırıldaqçılarından olmuş və mə’sumlar tərəfindən öz yalan iddialarına görə lə’nətlənmişdir.

### (ƏBU–MƏHƏMMƏD (ŞƏRİƏ

Şeyx Tusi bildirir ki, bu şəxsin adı Həsən, künyəsi Əbu-Məhəmməd olmuşdur. O imam Hadi (ə) və imam Həsən Əsgərinin (ə) səhabələrindəndir. Qeyb dövründə layiq olmadığı məqam iddiasına düşən ilk şəxs Əbu-Məhəmməd olmuşdur. Heç bir əsassız vəkillik iddiası edən bu insan imam tərəfindən lə'nətlənmişdir. İmam Mehdi (ə) onu lə'nətləyən bir fərman vermişdir. Sonralar bu şəxsdən küframiz sözlər eşidilmişdir.

### MƏHƏMMƏD İBN NƏSİR NƏMİRİ FƏHRİ

Şeyx Tusinin bildirdiyinə görə, o əvvəllər imam Həsən Əsgərinin (ə) səhabələrindən olmuşdur. İmam vəfat etdikdən sonra ikinci səfirlə müxalifətçilik etmiş, vəkillik iddiasına düşmüşdür. Amma Allah-təala onu küframiz sözlərinə görə rüsvay etmişdir. İkinci səfir onu lə'nətləmiş və ondan uzaq olmağa çağırmışdır. Şiələr səfirin göstərişinə uyğun olaraq bu şəxsə arxa çevirmişlər. Hətta Məhəmməd ibn Nəmirinin Əbu Cə'fər Əmri tərəfindən lə'nətlənməsindən sonra bu şəxs Əmrinin diqqətini cəlb etmək üçün çalışmış, amma Əmri tərəfindən rədd edilmişdir.

Bu şəxs iddia edirdi ki, imam Hadi (ə) Allahdır və onu peyğəmbərliyə seçmişdir. Eləcə də, ruhların bədəndən-bədənə keçməsinə inanmış, izdivac məsələsi ilə bağlı azğın fikirlər söyləmişdir. Sonradan Müqtədirin vəziri olmuş İbn-Fərat bu şəxsə yardım göstərmişdir. Onun bu işi xilafət və hökumətin həmin əsrdəki mövqeyinə kölgə salır.

Məhəmməd ibn Nəsir xəstələnib ölüm yatağına düşdükdə ondan canişini haqqında soruşurlar. O, dili topuq çala-çala deyir: «Əhməd». Onun bu cavabı ardıcıllarının üç dəstəyə bölünməsinə səbəb olur. Bir qrup onun öz oğlu Əhmədi canişin seçdiyini düşünür, başqa bir qrup Əhməd ibn Məhəmməd ibn Musa ibn Fəratı nəzərdə tutduğunu güman edir, digər bir qrup isə Əhməd Əbül-Hüseyn ibn Bəşər ibn Yəzidə işarə etdiyini zənn edir. Əvvəldə deyildiyi kimi, bu şəxs İbn-Baba Qummi ilə birlikdə imam Həsən Əsgərinin (ə) fərmanı ilə lə'nətlənmişdir.

### ƏBU–BƏKR, MƏHƏMMƏD İBN ƏHMƏD İBN OSMAN BAĞDADİ

Əbu-Bəkr Bağdadi adı ilə tanınmış bu şəxs birinci səfirin nəvəsi, ikinci səfirin isə

qardaşı oğlu olmuşdur. Şeyx Tusinin bildirdiyinə görə, bu şəxs savadsızlığı ilə tanınmışdır. Onun yolunu çaşmasından əmisi Əbu-Cə’fər Əmri xəbərdar olmuşdur. Bə’zi şiələr isə onun haqqında bir çox məsələlərdən xəbərsiz qalmışdılar. Bu şəxs kiçik qeyb dövründə yalandan səfirlik iddiası etmiş və Əbu-Dəlf Katib kimi bə’zi şiələr onun .ardınca getmişlər

Tanınmış şiələr ondan səfirlik iddiasında olması barədə soruşduqda, o bunu inkar etmiş, hətta and da içmişdir. Belə bir iddiada olub-olmadığını yoxlamaq üçün xüms-zəkat təqdim etdikdə demişdir: «Bu malları qəbul etmək mənə haramdır». Deyirlər ki, bu şəxs bir müddət Bəsrədə Yəzidinin xidmətində olmuş və xeyli mal toplamışdı. Amma düçar olduğu çaşqınlıqlar səbəbindən Yəzidi onu həbs etmiş və nəhayət, qətlə .yetirmişdir

### İSHAQ ƏHMƏR VƏ BAQƏTANİ

Bu iki şəxs ikinci səfir Məhəmməd ibn Osman ibn Səidin dövründə heç bir əsassız vəkillik iddiası etmişlər. Bu barədə Əhməd Dinvəri maraqlı bir əhvalat danışmışdır: İkinci səfirin dövründə Dinvəri Dinvər əhalisinin on altı min dinar xüms-zəkatını Bağdada aparır. Həmin şəhərdə imamın naibini axtarmağa başlayır. Ona bildirirlər ki, şəhərdə üç şəxs imamın vəkili olduğunu iddia edir. Onlardan biri Baqətani, ikincisi İshaq Əhmər, üçüncüsü isə Əbu-Cə’fər Əmridir. Dinvəri əvvəlcə Baqətaninin yanına gedir. Cazibədar zahiri görkəmə malik olan bu şəxs həm də xeyli varlı idi. Dinvəri bu adamdan onun vəkilliyini sübuta yetirəcək dəlil istəyir. Şeyx onu üç gün get-gələ salsa da, heç bir dəlil gətirə bilmir. Dinvəri ondan ümidini üzüb İshaq Əhmərə müraciət edir. Bu şəxs də Baqətani kimi varlı-dövlətli bir adam idi. Dinvəri yenə də vəkilliyin təsdiqi üçün dəlil tələb edir. Amma İshaq Əhmər də bu dəlili göstərməkdə aciz qalır. Nəhayət, Dinvəri Əbu-Cə’fər Əmriyə üz tutur. Əvvəlkilərdən fərqli olaraq onun sadə bir həyat tərzi keçirdiyinə şahid olur. Əbu-Cə’fər Əmridən kəramətlər görən Dinvəri gətirdiyi .xüms-zəkatı ona təhvil verir

### (HÜSEYN İBN MƏNSUR (HƏLLAC

Xeyli ardıcıla malik olan və haqqında xeyli tarixi qeydlər olan bu şəxs məşhur sufi Mənsur Həllacdır. Bə’ziləri onu ilahi övliyalardan saymışlar. Amma şiə mənbələrindən

görünür ki, o da kiçik qeyb dövründəki yalançı vəkillərdən olmuşdur. Şeyx Tusi bu şəxs haqqında, onun müxtəlif şiə alimləri ilə görüşləri barəsində ətraflı mə’lumat vermiş və onun əqidə baxımından azğın bir şəxs olduğunu bildirmişdir. Həllac əvvəldə haqqında danışdığımız Hilali və Bilali kimi müqəddəs nahiyə tərəfindən lə’nətlənmiş .adamlardandır

Həllac öz saxta əqidələrini yaydığı üçün abbasi hakimləri tərəfindən həbs edilərək qətlə yetirilmişdir. Şeyx Bəhayi öz «Kəşkül» əsərində onun haqqında yazır: Bağdad əhli bu şəxsin qanının halal olması barədə yekdil qərara gəlmişdi. Hansı ki, o özü daim deyirdi: «Mənim qanımı tökmək istəyəndə Allahı yada salın, mənim qanımı axıtmaq haramdır. Amma Bağdad əhli onun qanını halal saydı. Həllac Müqtədirin zindanına düşdü. Müqtədir ona min şallaq vurulmasını əmr etdi. Tapşırdı ki, əgər min şallaqdan ölməsə, yenə də şallaqlasınlar, sonra isə boynunu vursunlar. Vəzir isə göstəriş verdi ki, əgər o şallaqdan ölməsə, iki ayağını və başını kəssinlər, bədənini yandırsınlar. Bu .«göstərişlər yerinə yetrildi. Bu hadisə hicri ٣٠٩-cu ildə baş verdi

### ƏBU DƏLF, MƏHƏMMƏD İBN ƏL–MÜZƏFFƏR, ƏL–KATİB

Şeyx Tusi bu şəxs haqqında Ümmü-Gülsümün oğlu Hibətullah ibn Əhməd Əl-Katibdən nəql edir ki, Əbu-Dəlf Katib əvvəllər müxəmmisə məzhəbində olmuşdur. O özü bu barədə deyir: «Mənim ağam şeyx Saleh, yə'ni Əbu-Bəkr Bağdadi məni Əbu-Cə'fər Kərxi məzhəbindən düzgün məzhəbə döndərdi. Çünki kərxilər müxəmmisə məzhəbinə .meylli idilər, Əbu-Dəlf də bu məktəbdə tərbiyə almışdı

Əbu-Dəlf Əbu Bəkr Bağdadinin ardıcıllarından idi. Hətta Əbu-Bəkr Bağdadi onu öz canişini e'lan etmişdi. Əbül-Qasim onun haqqında deyir: «Biz Əbu-Dəlf Katibi dindən çıxmış kimi tanıyırıq. O, dindən çıxdıqdan sonra dəli oldu və zəncirləndi. Azad edildikdən sonra nə vaxt görünürdüsə təhqir edilirdi». O hətta Əli ibn Məhəmməd Səməri dünyasını dəyişdikdən sonra da naiblik iddiasında idi. Bu işinə görə şiələr onu .yalançı sayırdılar

### XAİN VƏ YALANÇI VƏKİLLƏR HAQQINDA BİR NEÇƏ NÖQTƏ

Xain və yalançı vəkillər haqqında tarix və rical kitablarında bildirilənləri nəzərdən keçirdik. Vəkalət qurumundakı bu iki mənfi cərəyanla bağlı bir neçə nöqtəni qeyd .etmək lazım gəlir

Bə'zi insanları vəkillik işində xəyanətə, eləcə də, yalana sövq edən bə'zi səbəblərə .١ nəzər salaq: Vəzifəpərəstlik, dünyapərəstlik, var-dövlət hərisliyi, imam malına tamah, .həqiqi vəkillərə həsəd, azğın düşüncə, hakimiyyətə meyl

Kiçik qeyb dövründə, xüsusi ilə də ikinci səfir Məhəmməd ibn Osmanın zamanında .۲ vəkilliklə bağlı yalan iddialar öz zirvə nöqtəsinə çatdı. Belə bir təzahürün əsas səbəbi həmin dövrdə imam qeybdə olduğundan şiələrin vəkillərə müraciət etməyə məcbur olmaları idi. Osman ibn Səidin dövründə bu səfir şiələr arasında böyük nüfuz sahibi olduğundan

kimsə belə işlərə cür’ət etmirdi. O, dünyasını dəyişdikdən sonra azğın insanlar fürsətdən istifadə edərək, özlərini şiələrə naib kimi tanıtdırmağa cəhd göstərdilər. Cəmiyyətdə tərəddüdlü vəziyyət yarandığından bu dövrdə vəkillik iddiasına düşənlər .başqa dövrdəkilərdən daha artıq idi

Bu sayaq azğın fəaliyyətləri öz siyasətinə xeyirli bilən abbasi hökuməti yalnız zəruri .saydıqda onlara qarşı çıxırdı

İmamların vəkillərin tə’yinatında ciddi sə’ylərinə baxmayaraq, müxtəlif səbəblərdən .۳ vəkillik məqamına göz dikənlər olurdu. Kimi imam malını oğurlamaq istəyir, kimi batil əqidəsini yayır, kimi də xalqın ehtiram göstərdiyi vəkillərə həsəd aparırdı. Belələrinin çoxu əvvəllər imamların e’tibarlı nümayəndələri olmuşlar. Əli ibn Əbu-Həmzə Bətaini, Osman ibn İsa Qəvasi Ziyad Qəndi, Faris ibn Hatəm Qəzvini, Ürvə ibn Yəhya, Əhməd ibn Hilal İbrətai, Əhməd ibn Hilal Əl-Kufi, Məhəmməd ibn Əli ibn Hilal Əl-Bilali, Əbu-Cə’fər Şələmğani belələrindən idi. İmamlar, adətən, belələrini lə’nətləyər, onların əsil .simasını xalqa tanıtdırardılar. İstisna hallarda onların qətlinə fərman verilərdi

Vəkillərin mühüm işlərindən biri dini ödənclərin toplanması olduğundan vəkillik işi bir .۴ çox tamahkarları özünə cəlb edirdi. Onlar bu malı ələ keçirmək üçün vəkil olduqlarını iddia edirdilər. Əlbəttə ki, bu sayaq iddiaların irəli sürülməsində həsədçiliyin də öz rolu var idi. Şöhrətpərəstlik, həsədçilik azarına tutulanlar arasında Əbu-Əbdüllah Əs-Səyyari, Qasim Əl-Şi’rani, Məhəmməd ibn Fərat, Əli ibn Həsikə, ibn Baba Qummi .kimiləri vardı

## ŞİƏLƏRİN İCTİMAİ–SİYASİ VƏ DÜŞÜNCƏ DURUMU

Kiçik qeyb dövründə şiələrin düşüncə durumu hansı vəziyyətdə idi? Qeyd etməliyik ki, həmin dövrdə şiələrin düşüncə durumu qənaətbəxş bir səviyyədə idi. Şiələr uyğun dövrdə İslam aləminə böyük alimlər, düşüncə sahibləri təqdim etmişdilər. Çünki imamın qeybi ilə üzləşmiş şiələr anlamışdılar ki, İslam maarifinin qorunmasına əvvəlkindən daha çox ehtiyaclıdırlar. Ona görə də yetmiş illik bu dövrdə olduqca .dəyərli kitablar yazılmışdır

Həmin dövrdə Qum və Kufə şiəliyin mühüm elm və hədis mərkəzləri idi. Əş’əri, Həmiri,

İbn-Babuyyə, Fərat ibn İbrahim, Əhməd ibn Məhəmməd Xalid Bərqi kimi böyük alimlər bu iki şəhərdə elmi fəaliyyət göstərir, dəyərli kitablar yazırdılar. Uyğun dövrün :bə’zi alimləri və onların kitabları ilə tanış olaq

;«Əbül-Qasim, Fərat ibn İbrahim ibn Fərat Kufi, «Təfsire-Fərat Kufi

;«Məhəmməd ibn Məs’ud ibn Əyyaşi, Təmimi Kufi Səmərqəndi, «Təfsire-Əyyaşi

;«Məhəmməd ibn Yə’qub Kuleyni «Üsule-Kafi», «Furue-Kafi», «Rövzeye Kafi» və s

Əbu-Əli, Məhəmməd ibn Əbu-Bəkr Həmmam, «Əl-Ənvar fittarixul-əimmə», «Əl-təmhiz ;«fi bəyan məvcubati təmhiz zunubul-mu’minin

;«Əhməd ibn Vazeh Yə’qubi, «Tarixe Yə’qubi

;«Məhəmməd ibn Həsən ibn Fərrux Səffar, «Bəsairul-dərəcat

;«Əhməd ibn Məhəmməd ibn Xalid Bərqi, «Əl-Məhasin

Əli ibn Hüseyn ibn Musa ibn Babəvəyh Qummi (Şeyx Səduqun atası) ibn Nədim yazır ki, Əbu-Cə’fər atasının iki yüzədək kitab yazdığını bildirir. Nəcaşi «Əl-fehrest» kitabında .onun on səkkiz kitabının adını çəkir

;«Seyyid ibn Əbdüllah ibn Əbu-Xələf Əş’əri Qummi, «Kitabur-rəhmə», «Mənaqibe şiə

;«Əbül-Əbbas, Əbdüllah ibn Cə’fər Həmiri Qummi, «Qurbul-əsnad

;«Əbu-Cə’fər Məhəmməd ibn Əbdullah ibn Cə’fər Həmiri Qummi «Qurbul-əsnad

.«Əbu-Zeynəb, Məhəmməd ibn Cə’fər No’mani, «Əl-ğeybət

## SİYASİ VƏZİYYƏT

Abbasilər xilafətinin mərkəzi Bağdadda kiçik qeyb dövründə şiələr siyasi məqamlardan məhrum idilər. Hakimiyyət Abbasilərin əlində idi və onlar talibilərə, .xüsusi ilə də Əli və onun şiələrinə müxalif mövqedə dayanırdılar

Bu müxaliflik bə’zən zirvə həddinə çatır, bə’zən isə qismən yumşalırdı. Mö’təzidin xəlifəliyi dövründə şiəliklə düşmənçilik əvvəlki dövrlərdən daha amansız idi. O, öz onillik xilafəti dövründə şiələrə qarşı cəbhəni genişləndirmiş, bir növ qılınca sarılmışdı. Bu münasibət xəlifə Müqtədirin dövründə xeyli yumşaldı, hətta şiələrin xeyrinə işlər də .görüldü. Həmin dövrdə hakimiyyətdə şiələrin də iştirakı vardı

Bu dəyişiklik hakimiyyətdə bəni-Fərat ailəsinin iştirakı ilə müşayiət edilirdi. Həmin dövrdə şiələr hakimiyyət dairələrində müəyyən məqamları tuturdular. Əbül-Həsən Əli ibn Məhəmməd ibn Fərat üç dəfə vəzirliyə seçilmişdi. O, hicri ۲۹۶-۲۹۹-cu illərdə Müqtədirin vəziri olmuş, hicri ۲۹۹-cu ildə Bağdaddakı qarətlə əlbir olma ittihamı ilə həbs edilmişdi. Bu şəxs hicri ۳۰۴-cü ildə ikinci dəfə vəzir məqamını tutmuş və hicri ۲۰۶-cı ildə beytül-malı israf etmə ittihamı ilə zindana salınmışdı. O, üçüncü dəfə hicri ۳۱۱-ci ildə vəzir tə’yin edilmişdi. Son dəfə ۳۱۲-ci ildə vəzirlikdən uzaqlaşdırılmış və oğlu ilə birlikdə .zindana salınmışdı. Sonradan ata və oğul qətlə yetirilmişdilər

Şiə Əli ibn-Fəratın vəzirlik dövründə şiələr nisbətən rahat nəfəs alırdılar. Onlar bu fürsətdən istifadə edərək öz əqidələrini möhkəmləndirirdilər. Hüseyn ibn Ruh Növbəxtinin səfirliyi də bu dövrə təsadüf edir. Mövcud siyasi durum vəkalət qurumunun da fəaliyyəti üçün münasib fürsət yaratmışdı. İbn-Fəratın vəzirliyi dövründə Hüseyn ibn Ruhun siyasi şəxsiyyətlər arasında yüksək mövqeyi vardı. O, bu .fürsətdən şiələrin vəziyyətini yaxşılaşdırmaq üçün istifadə edirdi

Xəlifə Razinin dövründə bu şiə ailəsi hakimiyyətdə nüfuza malik idi. Bu ailənin üzvləri müxtəlif dövlət işlərində çalışmaqla yanaşı, vəzirlik məqamına da sahib olmuşdular. .Hicri ۳۲۵-۳۲۶-cı illərdə Fəzl ibn Cə’fər ibn Fərat xəlifənin vəziri idi

Amma mərkəzdən kənardakı muxtar ərazilərdə şiələrin siyasi vəziyyəti daha münasib idi. Hətta bə’zi məntəqələrdə siyasi hakimiyyət şiələrin əlində idi. Məsələn, hicri ۱۸۴-۲۹۶-cı illərdə Tunisdə əğləbə dövlətində, hicri ۲۲۱-۳۱۲-ci illərdə Mərakeşdə İdrisiyan dövlətində, hicri ۲۹۶-۵۶۷-ci illərdə Misirdə Übeydiyan dövlətində, hicri ۳۲۰-۳۳۸-ci illərdə cənubi və mərkəzi İranda, Təbəristanda Ali-Buyə dövlətində, hicri ۳۱۹-۳۹۴-cü illərdə .Mosul və Hələbdə Ale-Həmdan dövlətində şiələr hakim idilər

## İCTİMAİ VƏZİYYƏT

Abbasilər xilafətinin mərkəzində və onun nüfuzu altında olan məntəqələrdə şiələrin elə bir ictimai məqamı yox idi. Bu xoşagəlməz vəziyyətin müxtəlif amilləri vardı. :Onlardan bə’zilərini nəzərdən keçirək

;Abbasi hakimlərinin şiələrə zidd siyasəti

;Əş’əri məzhəbinin mö’təzilə və şiə məzhəblərinə qalib gəlməsi

.Qəramitə və Sahibe-Zənc vəhşiliklərinin şiələrin ayağına yazılması

Hicri ۳۱۱-ci ildə Qəramitələrin törətdiyi vəhşiliklərin ciddi təbliğatlar sayəsində şiələrə aid edilməsi səbəbindən Bağdad əhli şiələrə qarşı qalxdı və şiə vəzir Əli ibn Fərat və onun oğlu həbs edilərək qətlə yetirildi. Uyğun hadisə ilə əlaqədar Hüseyn ibn Ruh .Növbəxti də həbs edildi və zindana salındı

Amma Abbasilər hökumətinin xaricindəki muxtar məntəqələrdə inqilabi şiə .hökumətləri qurulmuşdu və şiələr üstün ictimai mövqeyə malik idilər

## XÜLASƏ

Kiçik qeyb dövründə hökumət və xilafət altı abbasi xəlifəsinin ixtiyarında idi: ,Mö’təməd

Mö’təzid, Müktəfi, Müqtədir, Qahir, Razi. Bu dövrün siyasi vəziyyət və xüsusiyyətləri özündən əvvəlki dövrün xüsusiyyətlərinin davamı idi. Müxtəlif istilalar, eləcə də, türklərin nüfuzu mərkəzi hökuməti günbəgün zəifləşdirirdi. Bu dövrdə xilafət mərkəzi Samirradan Bağdada köçürüldü. Qəramitə fitnəsi də həmin bu dövrə təsadüf edir. Əvvəlki dövrdə şiddətlənmiş ələvi qiyamları qəramitənin vəhşilikləri səbəbindən zəifləməyə başladı. Dəməşqdə ibn Ər-Riza qiyamları, Həsən ibn Yəhyanın Yəməndəki qiyamı, Təbəristanda və Deyləmdə Həsən ibn Əlinin qiyamı, Afrikanın şimalında Mehdi adı ilə birinin zühuru, Misir və şimali Afrikada fatimilər dövlətinin tə’sis edilməsi, müstəqil və muxtar dövlətlərin yaradılması uyğun dövrün ən mühüm hadisələri idi. İctimai vəziyyət də əvvəlki dövrün ictimai vəziyyətindən fərqlənmirdi. Firqələrarası, məzhəblərarası, qəbilələrarası, təbəqələrarası ixtilaflar, xəlifələrin və digər hakimiyyət nümayəndələrinin əyyaşlığı kiçik qeyb dövrünün ictimai vəziyyətinin əsas .xüsusiyyətindən idi

Əqidə baxımından bu dövrün iki səciyyəvi xüsusiyyəti var idi: Biri əhle-hədis məktəbinin bir qolu olan əş’əri düşüncəsinin yaranması, digəri isə rəvayət kitablarının .tərtibi

Qeyb dövrünün başlanması haqqında müxtəlif baxışlar mövcuddur. Şiə alimləri isə bildirirlər ki, bu dövr imam Həsən Əsgərinin (ə) şəhadəti vaxtından başlamışdır. İmamın ictimai mövqeyi Abbasiləri qıcıqlandırdığından onlar həzrəti şəhadətə yetirmək qərarına gəldilər. İmamın məhz Abbasilər tərəfindən qətlə yetirilməsinə yetərincə dəlillər vardır. Amma Abbasilər belə bir görüntü yaratmağa çalışırdılar ki, .imam təbii şəkildə dünyasını dəyişmişdir

Abbasi xəlifələri imam Həsən Əsgərinin (ə) övladı olub-olmaması barədə ciddi axtarış aparır, ehtimal olunan canişinin həyatına son qoymaq istəyirdilər. Amma onlar öz şeytani hədəflərinə çata bilmədilər. İmam Mehdinin (ə) əmisi Cə’fər abbasi xəlifələrinə bu istiqamətdə kömək göstərirdi. Cə’fər imamət məqamına sahib durmaq üçün imam Həsən Əsgərinin (ə) cənazə namazını qılmağa cəhd göstərmişdi. Amma həzrət Mehdi (ə) bu işə mane olmuşdu. Çünki dünyasını dəyişmiş imama namaz qılmaq ona canişin olmaq əlaməti idi. Cə’fər imamlıq və canişinlik iddiasında idi. O iddia edirdi ki, imam Həsən Əsgərinin (ə) ondan başqa varisi yoxdur. O, hökuməti imam Mehdinin (ə)

.axtarışına vadar edirdi

Bütün bu fəaliyyətlərinə baxmayaraq, həzrət Mehdinin (ə) ikinci səfiri Məhəmməd ibn Osman müqəddəs nahiyə tərəfindən Cə'fərin öz ömrünün sonunda tövbə etdiyini .bildirən fərman bəyan etmişdir

Söhbətimin bu hissəsində bəyan olunan digər bir məsələ sərdabə əhvalatı idi. Bə'zi

şiə düşmənləri şiələri ittiham edirlər ki, onlar imam Mehdinin (ə) bu günədək ac-susuz sərdabədə qaldığına inanırlar. Hansı ki, heç bir şiə alimi belə bir mə’lumat verməmişdir. Şiələr həzrət Mehdinin (ə) bu günədək sərdabədə qalmasına inanmır və irəli sürülmüş .bu sayaq ittihamları rədd edirlər

İslami rəvayətlərdə qeyb fəlsəfəsi haqqında müəyyən açıqlamalar verilmişdir. Onun ilahi sirlərdən bir sirr olması, saleh insanların imtahanı və xəlbirdən keçirilməsi, insanların zülmə uğraması, imamın zalımlara bey’ətdən azad edilməsi və varlığının .hifzi qeyb səbəbləri kimi göstərilir

Şeyx Tusi bu barədə yazır: «İmam Mehdinin (ə) qeybinin ilkin fəlsəfəsi, sirri və və ya hikməti onun canının qorunması, düşmən tərəfindən qətlə yetirilməsinin qarşısının .«alınmasıdır

İmam Mehdinin (ə) kiçik qeyb dövründə dörd səfiri və xüsusi naibi olmuşdur. Bu dörd şəxs dörd naib (nəvvabe-ərbəə) adı ilə tanınır. Osman ibn Səid Əmri (Əbu-Əmr), Məhəmməd ibn Osman ibn Səid Əmri (Əbu-Cə’fər), Hüseyn ibn Ruh Növbəxti (Əbül-Qasim) və Əli ibn Məhəmməd Səməri (Əbül-Həsən) imamın yetmiş illik kiçik qeyb .dövründəki xüsusi səfirləri olmuşlar

Osman ibn Səid Əmrinin dövründə onun naibliyindən yalnız bir qrup xüsusi şiə xəbərdar olmuşdur. Bu şəxs imam Hadi (ə) və imam Həsən Əsgəri (ə) tərəfindən təsdiq edildiyindən zaman ötdükcə şiələr arasında məşhurlaşmışdır. Osmanın müsbət .keçmişindən xəbərdar olan xalq onun səfirliyini qəbul etmişdir

Məhəmməd ibn Osmanın dövründə bir qrup yalançı və fırıldaqçı şəxs naiblik və səfirlik iddiası etmişdir. Bu adamlar müqəddəs nahiyə tərəfindən verilmiş fərmanla rüsvay .olmuşlar

Hüseyn ibn Ruhun səfirliyi dövründə yalan iddialar azalmışdı. Hüseyn ibn Ruh cəmiyyətdə və abbasi hakimləri arasında nüfuz sahibi olmuşdur. Qəramitə fitnələri .şiələrin ayağına yazıldığından Hüseyn ibn Ruh beş il zindanda qalmışdı

Əli ibn Məhəmməd Səmərinin səfirliyi uzun sürməmişdi. O, hicri ۳۲۶-cı ildən hicri ۳۲۹-cu

ilədək həzrət Höccətin (ə) səfiri kimi fəaliyyət göstərmişdir. Onun ölümündən sonra .xüsusi səfirlik fəaliyyəti başa çatmışdır

İmam Mehdinin (ə) diqqəti cəlb edən son fərmanı Əli ibn Məhəmməd Səmərinin dövründə verilmişdir. Vəkalət qurumunda xeyli e'tibarlı insanlar olmuşdur. Ələvilərin də arasında böyük fəzilət sahibi olan insanlar az deyildi. Maraqlıdır ki, nə üçün bütün ləyaqətli insanlar həmin dörd nəfər səfirliyə seçilmişdir? İmam Mehdi (ə) uyğun dörd səfiri konkret me'yarlar əsasında seçmişdir. Bu insanların iman, təqva, ədalət, elm və agahlıqdan savay çox yüksək

həddə təqiyyə və sirsaxlamaları, səbr və müqavimətləri, ali dərəcədə agahlıqları olmuşdur. Bütün bunlardan əlavə, bu dörd şəxs Abbasilərin diqqətindən yayına .bilmişdilər

Səfirlər şiələrlə həm vəkillər vasitəsi ilə, həm də birbaşa əlaqə saxlamışlar. Amma .vəkalət qurumundakı rabitələr vasitəli rabitə olmuşdur

:İmam Mehdinin (ə) dörd xüsusi naibinin aşağıdakı vəzifələri olmuşdur

;Xalqın imam Mehdinin (ə) vücudu ilə bağlı şübhələrinin aradan qaldırılması.١

;İmamın adının və olduğu yerin gizlədilməsi ilə onun qorunması.٢

;Vəkalət qurumunun təşkili və himayəsi.٣

;Fiqhi və e’tiqadi sualların cavablandırılması.۴

İmam Mehdiyə (ə) aid xüms-zəkat kimi dini ödənclərin toplanması və.۵ ;bölüşdürülməsi

;Yalançı vəkillərlə mübarizə və onların ifşa edilməsi.۶

;Xəyanətkar vəkillərlə mübarizə.٧

.Xalqın böyük qeyb dövrünün qəbuluna hazırlanması.٨

Birinci vəzifənin əsas ağırlığı ilk səfir Osman ibn Səid Əmrinin, son vəzifənin əsas .ağırlığı isə son səfir Əli ibn Məhəmməd Səmərinin üzərinə düşmüşdür

Kitabın bu fəslində uyğun dövrdə bə’zi xain və yalançı vəkillər haqqında da danışdıq. .Eləcə də, bu dövrdə şiələrin ictimai-siyasi və düşüncə durumu nəzərdən keçirildi

## SƏKKİZİNCİ FƏSİL

## BÖYÜK QEYB DÖVRÜNÜN BƏZİ MÜHİM

İmam Mehdi (ə) tərəfindən fərman göndərilməsi ilə və dördüncü səfir dörd naibin sonuncusu olaraq dünyasını dəyişdikdən sonra on ikinci imamın böyük qeyb dövrü .başladı. Kiçik qeyb dövrünün arxada qalması ilə şiə tarixinin yeni səhifəsi açıldı

Əvvəlki fəsildə uyğun fərman haqqında danışdıq, onu nəzərdən keçirdik. Kitabın bu fəslində isə böyük qeyb dövrünün ən mühüm məsələlərini aşağıdakı dörd başlıq :altında xülasə şəkildə nəzərdən keçirəcəyik

;Böyük qeyb dövründə şiə tarixi, inqilablar və şiə dövlətləri.١

;Bu əsrdə şiə alimlərinin ideoloji-siyasi mübarizələri.٢

;Bu əsrdə dini və siyasi mərcəiyyət dövrləri.٣

.Kiçik və böyük qeyb dövrlərində Mehdilik iddiaları.۴

### BÖYÜK QEYB DÖVRÜNDƏ ŞİƏ TARİXİ, İNQİLABLAR VƏ ŞİƏ DÖVLƏTLƏRİ

Böyük qeyb dövründə şiə tarixini araşdırmazdan qabaq kiçik qeyb dövründəki şiə .tarixinə nəzər salmaq münasib olardı

Böyük qeyb dövründən qabaq hicri I-IV əsrlərdə şiəliyin vəziyyəti necə idi? Həzrət peyğəmbərin xilafət və canişinliyini, elmi və dini mərcəiyyəti həzrət Əli (ə) və onun on .bir övladının haqqı bilənlərə imamiyyə şiəsi deyilir

Həzrət Əli (ə) və onun tərəfdarları həzrət Peyğəmbərdən (s) sonra şuranın çıxardığı qərarlara e'tiraz etdilər. Amma İslam və müsəlmanların faydasını nəzərə alaraq, eləcə də, yetərincə qüvvəyə malik olmadıqlarından qanlı qiyama əl atmadılar. Qəti şəkildə demək olar ki, həzrət və onun ardıcılları həmin məqamda əksəriyyətin əqidəsinə .təslim olmadılar

Şiə əqidəsinə görə, cəmiyyət üçün ən əhəmiyyətlisi əsl İslam tə'limlərinin aydınlaşdırılmasıdır. İkinci yerdə həmin tə'limlərin cəmiyyətdə gerçəkləşməsi dayanır.

Bu iki məqsədi yalnız mə’sum rəhbər yerinə yetirə bilər. Hökumətə mə’sum şəxs .rəhbərlik etmədikdə o, zalım bir səltənətə çevrilir və pak dini maarif təhrif olunur

İslam tarixi bu e’tiqadı sübuta yetirmiş və şiələr uyğun əqidələrində daha da möhkəmlənmişlər. Onlar İslamın qüdrətini hifz etmək məqsədi ilə aşkar müxalifətçilik göstərməmiş, başqaları ilə çiyin-çiyinə cihada getmiş və ümumi işlərdən kənarda .qalmamışlar

Hicri ٣٥-ci ilin axırlarında, iyirmi beş il ardıcıl büdrəmələrdən sonra həzrət Əli (ə) rəhbərlik məqamına qalxdı və mənfəətpərəst müxaliflərlə savaşa başladı. Dörd il beş aydan sonra Xəvaric (xarici məzhəblər) həzrəti şəhadətə yetirdi və Müaviyə min bir hiyləgərliklə xilafətə hakim oldu. O, İslam hakimiyyətini irsi yolla ötürülən sultanlığa çevirdi və hakimiyyətdə olduğu iyirmi il ərzində şiəliyin kökünə balta çalmaq üçün .əlindən gələni etdi

İmam Həsən Müctəba (ə), Əlinin (ə) sadiq tərəfdarlarının şəhadəti, faciəli Kərbəla hadisəsi, bəni-Üməyyə sülaləsinin harınlığı şiəlik əqidəsini zaman keçdikcə möhkəmləndirdi. Seyyidüş-şühəda Hüseynin (ə) şəhadəti hətta İraq, Yəmən, İran kimi .ucqar məntəqələrdə də şiəliyin yayılması ilə nəticələndi

Ona görə də hicri I əsrin sonlarında bəni-Üməyyə hökuməti zəifləməyə başladı. Şiələr İslam məmləkətinin ətrafından sel tək axışıb imam Baqirin (ə) ətrafında toplanır v İslam maarifindən bəhrələnirdilər. Qum şəhərinin bünövrəsi qoyuldu və bu məntəqədə şiələr sakin oldu. Amma şiələr təqiyyə vəziyyətində yaşayırdılar. Bəni-Üməyyə hökumətinin təzyiqləri ələvi qiyamları ilə müşayiət olunurdu. Bu qiyamlar .məğlubiyyətə uğrayır, ələvilər öz canlarını bu müqəddəs yolda qurban verirdilər

Əhli-beyt şəhidlərinin qanı və dərin şiə təbliğatı bəni-Üməyyənin hakimiyyətdən getməsi və Abbasilərin hakimiyyəti oğurlamasına səbəb oldu. Abbasilər ilk günlərdə bəni-Üməyyəni qətlə yetirir, şiələrə məhəbbət göstərirdilər. Amma çox keçmədi ki, onlar da bəni-Üməyyənin azğın yolunu tutdular və harınlığa başladılar. Beləcə, Abbasilərin hakimiyyətə gəlməsi şiələrin vəziyyətini cüz'i də olsa dəyişmədi. Xalqın əqli elmlərə üz tutması, xəlifə Mə'munun Mö'təzilə məzhəbinə meydan verməsi şiə .alimlərinin daha qızğın şəkildə öz məzhəbini təbliğ etməsinə səbəb oldu

Vəliəhdliyin səkkizinci imama verilməsi ələviləri bir qədər sıxıntıdan çıxarsa da, abbasi xəlifəsi Mütəvəkkil qılıncını şiələrə qarşı çevirdi, hətta imam Hüseynin (ə) məzarı da .onun əlindən amanda qalmadı

## BÖYÜK QEYB DÖVRÜNDƏ ŞİƏLƏR

Abbasilərin amansızlığı və ələvilərin ardıcıl qiyamları mövcud hakimiyyətin sütunlarını

laxlatdı və şiə dövlətlərinin zühuru üçün şərait yarandı. Bu şərait şiə məzhəbinin azad .təbliği üçün də münasib idi

Hicri IV əsrdə Ərəbistan yarımadasının böyük şəhərlər istisna olmaqla əksər hissəsində

şiələr sakin idi. Sünnə əhlinin mərkəzi sayılan Bəsrənin də əhəmiyyətli bir hissəsi şiələrdən ibarət idi. Trablosda, Nablosda, Təbəriyyədə, Hələbdə və Həratda şiələr çox .idi. Əhvaz və Fars körfəzinin sahillərində şiələr məskunlaşmışdı

Bağdad, Bəsrə və Nişabur kimi böyük şəhərlərdə tez-tez şiələr və sünnilər arasında .çəkişmələr olardı

Hicri ٥-٩-cu əsrlərdə şiəlik genişlənir və şiə dövlətləri iş başına gəlirdi. İranın mərkəz hissəsində yüz əlli ilə yaxın İsmailiyyə hakimiyyətdə oldu. Mər’əşi seyyidləri səkkizinci əsrin ortalarından doqquzuncu əsrin ortalarınadək Mazandarandan Qəzivinədək ərazilərdə hakim oldu. Monqol xanlarından olan sultan Məhəmməd Xudavəndi şiəliyi qəbul etmişdi. Ondan sonra sultanlar arasında şiəlik yayılmağa başladı. Əllamə Hilli və onun oğlunun nüfuzu sayəsində şiəliyin hüdudları daha da genişləndi, inqilabi əhli-beyt .məktəbi formalaşmağa başladı

Təbrizdə Qaraqoyunlu və Ağqoyunlu sultanları hakimlik etmiş, Fars və Kirmanadək .məntəqələr onların hakimiyyəti altında olmuşdur

Ali-Əyyub sultanlarının gəlişi ilə Misir və Şam şiələri dini azadlıqlarını itirmiş və bir çox şiələr qılıncdan keçirilmişdir. Şəhide-əvvəl adı ilə tanınmış Məhəmməd ibn Məkki Amili kimi şiə fəqihi hicri ٧٨۶-cı ildə Dəməşqdə öldürülmüşdü. Şeyxe-İşraq (Şəhabəddin Söhrəvərdi) Hələbdə fəlsəfə ilə məşğul olduğu üçün günahlandırılaraq qətlə .yetirilmişdir

Bu beş əsr ərzində şiələrin vəziyyəti sultanların məzhəb və qüdrətindən asılı olmuşdur. Uyğun zaman kəsiyində heç bir məntəqədə şiə məzhəbi rəsmi məzhəb kimi e’lan .olunmamışdır

Hicri X əsrin başlanğıcında şiə məzhəbindən olan İsmail Səfəvi öz qiyamına Ərdəbildən başlamışdır. O bir çox döyüşlər apararaq parçalanmış İranı vahid dövlət şəklinə gətirmiş və şiə məzhəbini rəsmi hökumət məzhəbi e’lan etmişdir. On ikinci əsrin .ortalarınadək səfəvilər şiə məzhəbini rəsmi məzhəb sayaraq hakim olmuşlar

Şah Abbas Kəbir ölkənin sahəsini və cəmiyyətini indikindən iki dəfə artıq həddə çatdıra

bilmişdir. Şiə məzhəbi hicri on dördüncü əsrədək İranda rəsmi məzhəb sayılmışdır. Hazırda Yəmən və İraq cəmiyyətinin əksəriyyətini şiələr təşkil edir. Əksər müsəlman ölkələrində şiələr məskunlaşmışdır. Dünyadakı müsəlmanların sayı çoxdan bir milyardı .aşmışdır

Hicri on beşinci əsrin əvvəllərində uzun-uzadı mübarizələrdən sonra mütərəqqi .«vilayəte-fəqih» nəzəriyyəsi əsasında İranda şiə İslam hökuməti qurulmuşdur

Zülmə qarşı İslamda ilkin olaraq şiələr qiyam bayrağı qaldırmışdır. Şiə nəzəriyyələri daim inqilabi ruha malik olmuşdur. Şiələrin imamət məsələsinə dərin inancı olanların zalım hakimlər qarşısında mübariz mövqe tutması ilə müşayiət olunmuşdur. Şiə tarixi .bu həqiqətin aşkar göstəricilərindəndir

Şiə e’tiqadına görə, mə’sum imamın və onun naibinin rəhbərlik etmədiyi hakimiyyət qəsbkar və zalımdır. Bu səbəbdən də şiələr daim öz inqilabi hərəkatları ilə tarixi .zənginləşdirmişlər

Şiə mübarizləri və rəhbərləri zalım hakimlərdən heç zaman çəkinməmişlər. Onlar təqiyyə etməklə, sirr saxlamaqla ən çətin şəraitlərə dözmüş, sarsıdıcı tufanlar .qarşısında diz çökməmişdilər

Şiələrin siyasi mübarizələri mə’sum imamların dostlarının rəhbərliyi altında aşkar və .gizli şəkildə davam etmişdir

Əzəmətli şiə qiyamları xalq kütlələri və böyük şəxsiyyətlər tərəfindən himayə .olunmuş, ona böyük din alimləri başçılıq etmişlər

Şiə hərəkatları öz inqilabi təlaşlarını həzrət Peyğəmbərin vəfat etdiyi gündən .başlamışdır

Bu inqilabların bir çoxu İraqda və Hicazda baş vermişdir. Şiələr azğın xəlifələrə qarşı .mübarizə səngərini heç vaxt boş buraxmamışlar

Şiələr öz mübarizələrində məzhəbi qruplara yox, əzilən xalq kütlələrinə arxalanmışlar. Ona görə də onların əməvilərə və Abbasilərə qarşı qiyamları geniş xalq kütlələri tərəfindən rəğbətlə qarşılanmışdır. Əslində Əhli-beyt ardıcıllarının parlaq simasını yalnız şəhadət meydanlarında axtarmamalıyıq. Bu çöhrələr mədəniyyət inqilabları çərçivəsində də şö’lələnməkdədir. İdris ibn Həsən Müsənna məğrib məntəqəsini təbliğ vasitəsi ilə fəth etdi. Eləcə də, İndoneziya və İslam dünyasının uzaq şərqi təbliğ yolu ilə haqqı tapdı. Hicri beşinci əsrdə Hindistan xalqının böyük bir hissəsi yalnız iki şiənin təbliği ilə İslamı qəbul etdi. Hansı ki, Abbasilər üç yüz il müddətində əllərində qılınc qan

.tökməklə İslamı yaymağa çalışmışdılar

İnqilabi şiə hərəkatları bütün dünyada hərəkat ruhu yaratdı. Bu hərəkatlar ardıcıl məğlubiyyətlərə uğradıqdan sonra, nəhayət, hicri dördüncü əsrdə əhəmiyyətli .nəticələr qazandı. İslam dünyasında bir sıra inqilabi dövlətlər formalaşdı

İnqilabi İdrisilər dövləti iki əsr, Ələvilər dövləti yarım əsr, Ali-Buyə dövləti bir əsrdən çox Fatimilər dövləti üç əsrədək yaşaya bildi. Eləcə də, Həmdanilər, Bəni-Mərdas, Bəni-Əmmar hicri dördüncü əsrin əvvəllərindən hicri altıncı əsrin əvvəllərinədək .Şamat məntəqəsində hakimiyyətdə oldu və şiə dəyərləri təbliğ edildi

Bu növ dövlətlər nəzəri baxımdan ideal tövhidi dövlətlə müqayisədə əməvi və Abbasilərin bir sıra səhvlərini təkrarlasalar da, onların əsas məqsədləri İslam nizamını qorumaq olmuşdu. Bu dövlətlər elm, ədəbiyyat sahəsində qiymətli xidmətlər .göstərmiş, böyük İslam alimlərini himayə etmişdilər

.Ali-Buyə öz hakimiyyətində İslam mədəniyyəti və əhli-beyt tə’limlərinə əsaslanırdı

Onlar başqa məzhəb nümayəndələri ilə yaxşı davranır, onlara qarşı mərhəmətsizlik göstərmirdilər. Bu xüsusiyyətlər əksər şiə dövlətlərinə aiddir. Hansı ki, qeyri-şiə .dövlətlərində şiələr daim tə’qib olunur, bə’zən də qılıncdan keçirilirdilər

Buna görə də şiə inqilabi dövlətləri əsri sayılan hicri IV əsr İslam mədəniyyətinin çiçəklənmə dövrü sayılmışdır. Bu yüksəlişin yeganə səbəbi şiə dövlətləri sayəsində yaranmış və elmi inkişafa aparan düşüncə azadlığı olmuşdur. Uyğun tərəqqinin ən böyük amili məhz hakim dövlətlərin tə’sisçilərinin uca idealları olmuşdur. İslam mədəniyyətini tənəzzülə uğradansa müxtəlif hakimlərin addım-addım İslami .amallardan uzaqlaşması sayılmalıdır

Rəhbərlər arasındakı ixtilaf, dövlət xadimlərinin inqilabi ideallardan uzaqlaşması nəticəsində İslam dünyası hicri VI-VII əsrlərdə Abbasilər dövlətinin süqutuna, siyasi hakimiyyətin bölüşdürülməsinə, kiçik dövlətlərin formalaşmasına, əbləhanə .keməkeşlərin, qardaş qırğınlarının və rəqabətlərin şahidi oldu

Hicri ۴۸۹-cu ildə təşkilatlanmış səlib yürüşlərinin ilk dövrü başladı. Hansı ki, xilafət mərkəzində eyş-işrətdən başqa bir şey haqda düşünən yox idi. Belə bir şəraitdə Monqolların İslam dünyasına hücumu başladı. İslam hökuməti monqolların istilaları .altında uçulub dağıldı

İslamı bu istilalardan başıuca çıxaran siyasi hakimiyyətdə heç bir payı olmayan

müsəlman alimlərin qalib monqolların qəlbinə yol tapıb, onları İslam qarşısında müt’iliyə sövq etmələri oldu. Əgər Bağdad əhlindən doqquz yüz min nəfəri qətlə yetirən monqol Hulaku xan imam Kazimin (ə) məqbərəsinin bərpası barədə göstəriş vermişdisə, bunun səbəbkarı Müəyyəd-din əl Qəmə və Xacə Nəsirəddin Tusi kimi .şücaətli İslam alimləri olmuşdu. Hansı ki, bu insanlar olmazın böhtanlarına tuş gəldilər

Xacə Nəsirəddinin məqsədi qırğınların və mə’nəvi dağıntıların qarşısını almaq idi. O, monqol təşkilatına nüfuz etməklə bir çox İslam alimlərinin həyatını xilas edə bildi. O, altmışdan çox əsər yazmaqla İslamın ən qatı düşmənlərini bu dinə və şiə məzhəbinin şüarlarına iman gətirməyə məcbur etdi. Nəticədə İslamın əyilmiş qəddi düzəldi, o vəhşi istilalara qalib gəldi. Bəli, elm və din keşikçilərinin məqamı o qədər yüksələ bilər ki, onlar hakimiyyət dairələrini öz nüfuzu altına alar və öz tədbirləri ilə mədəniyyət .düşmənlərinə məscid və kitabxanalar tikdirərlər

Monqollar İslam məmələkətlərinə gələrkən özləri ilə budda və məsihi dinlərini də gətirmişdilər. Çünki onlar öz siyasətlərini bu dinlərlə əlaqələndirmişdilər. Bütün !?müqavimətlər qırıldığı bir vaxtda İslam dünyasını hansı aqibət gözləyirdi

Amma şiə alimlərinin alovlandırıcı inqilabi qiyamları monqolların ayağı altında qalmış dini onların qəlbinə hakim etdi. İslama qənim kəsilmiş istilaçılar İslamın inkişafında .vasitəyə çevrildi

Hicri VIII və IX əsrlərdə İranın şimalı və şərqi bir sıra inqilabi hərəkatların şahidi oldu. Şiə nəzəriyyəsi üzərində qurulmuş səfəvilər dövləti bir çox zəifliklərinə baxmayaraq məzəhəbi şüarları canlandırırdı. Səfəvilərin hakimiyyəti altında olan sünnilər, məsihilər, .yəhudilər və zərdüştilərlə müdara edilirdi

Əkinçiliyin inkişafı nisbi də olsa xalqın rifah halının yaxşılaşması səfəvilər dövlətinin iqtisadi siyasətinə qarşı xalqda rəğbət oyadırdı. Səfəvilər dövründə elm və sənət .inkişaf edir, eləcə də, İslami maarifin genişlənməsinə xidmət göstərirdi

Hökumətin siyasi və idarəçilik sistemindəki dəyişikliklərin yaranması və alimlərin siyasi işlərə qatılması üçün münasib zəmin olması bu dövrün digər səciyyəvi xüsusiyyətlərindəndir. Şiəlik istiqlalı və şəxsiyyətinin geri qaytarılması, biganə qorxusundan qurtuluş və dinin varlığının kamil şəkildə hidayət edilməsi səbəbindən şiə .alimləri səfəvi sultanlarının siyasi hakimiyyətini təsdiqlədilər

Amma sonradan səfəvi hakimlərinin dünya zövqünə aldanması, daxili və xarici savaşlar bu dövləti tənəzzülə uğratdı, iki əsr yarımdan sonra səfəvilər dövlətinin mərkəzi İsfəhan əfqanların hücumu qarşısında diz çökdü. Belə bir şəraitdə İslami

hərəkatların formalaşması labüd idi. İranın bir çox şəhər və kəndləri qiyam qaldırdı və cəsarətlə döyüş meydanına atıldı. Səfəvi başçıları ruhdan düşsələr də, xalq partizan .müharibələri ilə fatehlərin qələbəsinə acı qatdı

Zəndilər hökuməti Nadir şahı terror etdikdən sonra hərəkatlar üçün yaranmış şərait aradan getdi. Amma hicri ۱۱۶۴-cü ildə Kərim xan Zəndinin qələbəsi ilə məzhəbi dəyərlər canlanmağa başladı və ruhanilər Kərim xan hökuməti tərəfindən himayə edildi. Amma çox

çəkmədi ki, Zəndilərlə qacarilər arasındakı rəqabət yenidən İranı savaş səhnəsinə çevirdi. Xalqın e’tiqadlarına və istəklərinə diqqətsizlik, eləcə də, qədim səlibçi düşmənlərin tamahkarlığı nəticəsində İran qərbin müstəmləkəsi olaraq süquta uğradı.

Qərbin İslam dünyasına siyasi, iqtisadi, mədəni və hərbi hücumları şərqin oyanışında əhəmiyyətli rol oynadı. Bu istilalar nəticəsində islami hərəkatlar sür’ətləndi, daxili istibdadlar problemləri bir az da üzə çıxardı və mübarizələrə xəlqilik verdi. Son əsrdə baş vermiş islami hərəkatlar arasındakı bağlılıq bu hərəkatları nəhayətdə vahid inqilabi oyanışa çevirmişdir. Əzəmətli oyanış və mübarizə dalğası İslam dünyasının çox böyük bir hissəsini əhatə etmişdir. Misir, Suriya, Livan, İran, Türkiyə, Əfqanıstan, Pakistan, Əlcəzair, Tunis, Mərakeş, Hicaz, İndoneziya, Hindistan və İran kimi ölkələrdə İslam prinsiplərinə əsaslanan yeni bir siyasi düşüncə yaranmışdır.

Bir çox İslam ölkələrində ruhaniyyətin xəlqiliyi onların üzərinə rəhbərlik məs’uliyyəti qoymuşdur. Bütün bu hərəkatların fövqündə imam Xomeyninin (r) İslami hərəkatı dayanır. Dünyada baş vermiş islami hərəkatların idealları məhz bu hərəkatda gerçəkləşmişdir.

## BÖYÜK QEYB DÖVRÜNDƏ ŞİƏ ALİMLƏRİNİN İDEOLOJİ VƏ SİYASİ MÜBARİZƏLƏRİ

İslam təfəkkür, düşüncə, elmi və mə’nəvi təkamül dinidir. Qur’an ayələri, İslam peyğəmbəri və onun haqq canişinlərinin hədisləri başdan başa elm və mə’rifət, hidayət və qurtuluşdur.

İslam dini insan və Allah, insanla onun özü, insanla cəmiyyət və təbiət arasındakı düzgün rabitəni müəyyənləşdirir. İlahi kəlamlarda insanın mə’nəvi təkamülünün tə’mini üçün ən üstün elmi və tərbiyəvi, ictimai və siyasi nizam tanıtdırılır. Agahlıq və dəlillər yolu ilə insanın inkişafı üçün şərait yaradılır. Mə’nəvi inkişafa mane ola biləcək daxili və xarici səbəblər insana tanıtdırılır və bu maneələrin aradan qaldırılmasında insanın bütün imkanları səfərbər edilir.

Ona görə də insanın ağıl, fitrət kimi daxili imkanları önə çəkilir, sonra isə diqqət ailə və cəmiyyət kimi xarici amillərə yönəldilir. İnsanın təkamülünə mane olacaq cəhalət, qürur, nəfsə itaət kimi xarici və daxili amillərlə mübarizəyə çağırılır.

Həmin bu məqamda da təkamülün maneələri ilə ideoloji və siyasi mübarizə başlayır. Təhrif olunmamış Məhəmmədi İslam qanunlarının hakimiyyəti İslamın son məqsədi .kimi tanıtdırılır

İnsanların ideoloji və siyasi baxışlarının formalaşdırılması həzrət Peyğəmbərin dövründə onun öhdəsinə idi. Həzrət Peyğəmbər dünyasını dəyişdikdən sonra bu vəzifə imamların

çiyninə düşdü. Qeyb dövründə isə ləyaqətli alimlər imamət və mərcəiyyət (ideoloji və siyasi istiqamətləndirmə) kimi iki mühüm əsası öhdəyə götürdülər. Mə’sum imamların vəzifələri məcmusuna nəzər salmaqla böyük qeyb dövründəki nümayəndələrin də .vəzifəsi mə’lum olur

İslam Peyğəmbəri insanın dünya həyatı və axirət səadətinin tə’mini üçün kamil bir din gətirməkdən əlavə, siyasi bir nizam, ilahi bir dövlət də tə’sis etdi. Elə bir ümmət formalaşdırdı ki, bu ümmət onun tə’limlərindən agah oldu, Allah və onun rəsulunun göstərişlərinə itaət etdi. Peyğəmbər dünyasını dəyişdikdən sonra kamil dinin, yeni tə’sis olunmuş dövlətin hifzi onun haqq xəlifələrinə tapşırıldı. Qur’ni-kərimin təfsiri, cəmiyyətin ehtiyaclı olduğu hökmlərin aydınlaşdırılması, dövlət və ümmətin təhlükələrdən qorunması, e’tiqadi, əxlaqi və əməli dəyərlərin müdafiəsi mə’sum imamların vəzifələrindəndir. İmamların ideoloji və siyasi rəhbərliyi tarixdə aydın şəkildə əks olunmuşdur. Bəli, onların İslam cəmiyyəti üçün layiqli rəhbər olmasına tarix .şahiddir

İmamların ağır missiyası, onların böyük qeyb dövrü və onun tələblərindən xəbərdar olmaları bu dövrdə insanların ideoloji və siyasi baxımdan istiqamətləndirilməsi üçün onlardan yeni bir münasibət tələb edirdi. Onların sə’ylərinin əsas bir hissəsi İslam dünyasının gələcəyi üçün rəhbər kadrların tərbiyəsinə həsr olunmuşdu. Bu əsasla da şiələr və mə’sum imamların ardıcılları bütün islami elmlərin banisi sayılmış, uyğun istiqamətdə mühüm rol oynamışlar. İslamın həqiqi simasının ilkin müdafiəçiləri şiə alimləri olmuşlar. Onların bir çoxları bu yolda canlarından keçmiş, şəhadət şərbətini .içmişlər

Şiə alimlərinin mübarizəsi ictimai həyatın müxtəlif sferalarını əhatə etmişdir. Onlar xarici və daxili düşmənlərlə həm silah, həm də elm vasitəsi ilə vuruşmuşlar. Belə ki, qeyb dövrünün müxtəlif mərhələlərində ali məqamlı şiə alimləri mübarizə meydanını .boş qoymamışlar

## QEYB DÖVRÜNDƏ ŞİƏ ALİMLƏRİNİN İDEOLOJİ MÜBARİZƏSİ

Şiə alimlərinin böyük qeyb dövründə apardığı elmi və ideoloji mübarizələr haqqında danışarkən ustad Seyyid Məhəmməd Təbatəbainin fəaliyyətlərini xatırlamaq kifayət

edər. Əllamə Təbatəbai İslam elmlərində şiə üsulunu bəyan etdikdən sonra İslam elmlərinin inkişafında şiələrin rolunu aydınlaşdırmağa çalışmışdır. Əllamə buyurur:

«Şiələr hədis, kəlam və fiqh elmlərində var qüvvələri ilə çalışmış, bu və bununla bağlı dirayə, rical və üsul elmlərini kamal həddinə çatdırmışlar».

Əllamənin olduqca dəyərli «Əl-mizan» təfsiri, bu kitabda toplanmış elmi məcmuələr onu digər sünni və şiə təfsirlərindən fərqləndirir və çox-çox uca bir mərtəbəyə qaldırır. Şəhid Sədr kimi mütəfəkkirlərin, Əllamə Təbatəbai məktəbi şagirdlərinin elmi əsərləri .İslam elmlərinin inkişafında mühüm rol oynamışdır

İslam hökumətinin qurulması və siyasi, mədəni fəzaların azad olunması, elmi araşdırmalar üçün şərait yaranması şiə elmi cəmiyyətini xeyli irəli aparmış və müxtəlif .elmləri rövnəqləndirmişdir

## QEYB DÖVRÜNDƏ ŞİƏ FƏQİHLİYİ VƏ FİQH MƏRKƏZLƏRİ

Fiqh və fəqihlik İslam elmlərinin ən mühüm sahələrindəndir. Dini mərcəiyyət fiqh və fəqihlik üzərində möhkəmlənmişdir. Başqa elm sahələrində eniş-yoxuşlar olsa da, fiqh elmi günbəgün inkişaf etmiş və güclənmişdir. Deyilənləri böyük İslam filosofu ustad Şəhid Mürtəza Mütəhhərinin sözləri bir daha təsdiq edir. Alim buyurur: «Üçüncü əsrdən başlayaraq bu günədək fiqh ardıcıl bir həyat yaşamış və heç vaxt qət olmamışdır. Fiqhi hövzələr, mərkəzlər on bir əsr yarım ərzində dayanmadan fəaliyyət göstərmişdir. Ustad və şagird rabitəsi bütün bu müddət ərzində qırılmamışdır. Zahirən heç bir mədəniyyətdə İslamdakı bu on bir əsr yarımlıq davamlı həyat olmamışdır. İslam mədəniyyətindən savay heç bir mədəniyyət belə bir uzun müddət ərzində nizamlı və ardıcıl şəkildə vahid ruha malik olmamışdır. Tarixdə daha çox davam etmiş .mədəniyyətlərdə qırılmalar, qət olmalar müşahidə edilir

Kiçik qeybin təsadüf etdiyi hicri üçüncü əsri fiqh üçün başlanğıc götürməyimiz üçüncü əsrdən əvvəl fiqhin olmaması demək deyil. Üçüncü əsrdən qabaq şiə fəqihlərinin imamların nəzarəti altında olması səbəbindən onun başlanğıcını qeyb dövründən götürdük. Əslində ictihad və fəqihliyin başlanğıcı, eləcə də, fiqh kitablarının tərtibi .səhabələr dövründən başlamışdır

## İMAMLARIN DÖVRÜNDƏ FİQH VƏ FƏQİHLİK

Şiə fiqhi imamların dövründən kiçik qeyb dövrünədək və kiçik qeyb dövründən bu günədək müxtəlif mərhələlər keçmişdir. Həzrət Əlinin (ə) imamətindən imam Həsən Əsgərinin (ə) rehlətinədək mə’sum imamlar məcmusu İslam cəmiyyətində elmi bir

hərəkat və düşüncə cərəyanı yaratmışlar. Bu iş qeyb dövründə dini mərcəiyyət .tərəfindən davam etdirilmişdir

İmamların dövründə Peyğəmbər əhli-beytinin xəttinə müvafiq düşüncə məktəbinin bünövrəsi qoyulmuşdur. İmamlar tərəfindən səpilmiş toxum qeyb dövründə cücərib .ərsəyə gəlmişdir

Bu məktəb üç əsas üzərində qurulmuşdur: elm və düşüncə cövhəri, tə'lim-tərbiyə .üsulu, bu yükü daşıyacaq şəxsiyyətlər

Bu məktəbin əsil mürəbbi və müəllimləri mə'sum imamlar olmuşdur. Onların tərbiyə etdiyi şəxslərə nümunə olaraq Zürarəni, Məhəmməd ibn Müslimi, Əbanı, Əbu-Həmzə .Kəmalini, Yunis ibn Əbdürrəhmanı göstərmək olar

Məktəb üçün zəruri olan mətnlər (təfsir, fiqh, üsul və s.) mə'sum imamlar tərəfindən ravilərə və səhabələrə çatdırılmışdır. İmamların səhabələri də öz növbələrində onların göstərişləri əsasında rəvayətləri toplamış və zaman keçdikcə kitab halına gətirmişlər. Həmin maarif əsasında bir çox dəyərli şəxsiyyətlər tərbiyə olunmuş, əhli-beyt ardıcılı .olan fəqih məktəbləri formalaşmışdır

## KİÇİK QEYB DÖVRÜNDƏ ŞİƏ FİQHİ VƏ FƏQİHLİYİ

Kiçik qeyb dövründə mə'sum imamlarla birbaşa rabitə kəsildi. Hələ kiçik qeyb dövründən bir qədər əvvəl imam Hadi (ə) və imam Həsən Əsgəri (ə) xalqı əhli-beyt məktəbinin fəqihlərinə müraciət etməyi öyrədirdilər. Fəqihlər cəmiyyətin müstəqil şəkildə idarə olunmasına hazırlanırdılar. Həmin dövrdə bir çox hədis kitablarının məhv olmaq təhlükəsi vardı. Çünki şiələr ciddi təzyiqlərə mə'ruz qalırdılar. Dini mətnlərin vahid bir mətn şəklində olması istiqamətində sə'ylər göstərilirdi. İlk hədis məcmuəsini .Məhəmməd ibn Yə'qub Kuleyni «Kafi» kitabında topladı

Hədis rəvayətçiləri (ravilər) dərəcə e'tibarı ilə mərtəbələrə bölündülər. Hər bir rəvayətçinin e'tibarı nəzərdən keçirilirdi. Bu yolla imkan həddində dəqiq mə'lumatlar əldə etmək mümkün olurdu. İmamların səhabələrinin tərtib etdiyi məcmuələrin qeydə alındığı mündərəcatlar hazırlanırdı. Zaman ötdükcə dəlillərə əsaslanan fiqh .formalaşırdı. Bir çox elm və araşdırma mərkəzləri tə'sis olunurdu

Həmin iki dövrdə əsas iki fiqh məktəbi formalaşdı. Bu məktəblərdən biri Qumda mərkəzləşmiş «hədis raviləri» məktəbi, digəri isə Bağdadda mərkəzləşmiş

Şeyx Müfid məktəbi əvvəldə adı çəkilən iki məktəbin bəhrəsi idi. Bu məktəb böyük qeyb dövründən bu günədək təkamül yolu keçmiş, zaman ötdükcə daha bəhrəli, .möhkəm və əsaslı olmuşdur

Şeyx Müfiddən sonra onun dəyərli şagirdləri seyyid Mürtəza və Şeyx Tusi üsul fəqihləri məktəbinin bünövrəsini qoydular. Şeyx Tusi şiə fiqhini yeni bir mərhələyə daxil etdi. Bu məktəb fəqihliklə bağlı bütün elmi sahələrdə yenilik və ixtira ardınca gedirdi. Bu .məktəb bizim üçün olduqca dəyərli əsərlər miras qoymuşdur

Şeyx Müfid, Seyyid Mürtəza, Şeyx Tusi şiə mərcəiyyətini guşənişinlikdən çıxardılar. Sünnə əhlinin fiqhini, kəlamını, təfsirini üstələyən şiə mərcəiyyəsi Bağdadda kəlam və fiqh ustadlıq kürsüsünü tutdu. Bu məhzəblərdən olan alimlər şiə fəqihlərinin biliyindən .bəhrələnməyə başladı

Çox çəkmədi ki, firqələrarası ixtilaflar və siyasi vəziyyət Şeyx Tusini mühacirətə vadar etdi. Həmin vaxtdan başlayaraq Nəcəf fəqihlik mərkəzi oldu. Dini mərcəiyyət bu əsrdə şiə təhsil mərkəzlərinin elmi və maddi ehtiyaclarını öz üzərinə götürdü. Ən yüksək təhsil dövrün mərcə’sinin öhdəsinə idi. Vəkillərin tə’yini, qəzavət mərcəiyyətin vəzifələrindən sayılırdı. Ünvanlanmış suallara da mərcə’ cavab verməli idi. Şiə fiqhi hazırkı əsrdə də Şeyx Müfid məktəbinin davamıdır. Əsrin fiqhi Şeyx Müfid məktəbinin .bəhrələrindən faydalanır

## BÖYÜK QEYB DÖVRÜNDƏ ELMİ HÖVZƏLƏR VƏ ŞİƏ FƏQİHLİK MƏRKƏZLƏRİ

Böyük qeyb dövrünün başlanğıcında Bağdad fiqh və fəqihlik mərkəzi idi. Şeyx Tusinin Nəcəfe-Əşrəfə mühacirəti ilə hicri ۴۴۸-ci ildə bu şəhər bir əsrə qədər ən böyük fiqh mərkəzi oldu. Nəcəflə yanaşı Hələb şəhəri də Şeyx Mürtəzanın şagirdi Səllar tərəfindən mərkəzə çevrilmişdi. Bu mərkəz əsrin ortalarınadək fəaliyyət göstərdi. Bu hövzənin məşhur böyüklərindən biri «Əl-Ğəniyyə» kitabının müəllifi Seyyid Əbül-.Məkarim ibn Zöhrə olmuşdur

Nəcəf hövzəsində elmi durumun zəifləməsi ilə ibn İdris Hilli Hillə şəhərində fiqhi hərəkata başladı. Beləcə, şiə fiqhinin elmi mərkəzi İraqın Hillə şəhəri oldu. Mühəqqiq Hilli, Əllamə Hilli kimi şöhrətli fəqihlər Şeyx Tusidən sonra şiə fəqihliyinin yeni

mərhələsinin bünövrəsini qoyanlardan sayılırdı. Onlar şiə fiqhini mükəmməl vəziyyətə .gətirib Şeyx Müfidin xəttini davam etdirdilər

Hillə şəhərindən sonra fəqihlik mərkəzi Cəbəle-Amil və Şam məntəqəsinə

köçürüldü. Əllamə Hillinin oğlu Fəxrul-Mühəqqiqinin şagirdi Şəhide-Əvvəl, sonra isə Şəhide-Sani bu mərkəzin məşhur fəqihləri olmuşlar. Onlar Şeyx Müfidin fiqh məktəbini .Cəbəle-Amilə gətirdilər və güclü bir hövzə yaradıldı

Şiə fiqhinin Şəhide-Əvvəl, sonra Şəhide-Sani və onların şagirdləri tərəfindən nizamlanması şiə aləmində yeni bir hərəkat vücuda gətirdi. Şiə dövlətinin rəhbəri üçün «Lümə» mətnini yazıb göndərən Şəhide-Əvvəl bu siyasi baxışına görə şəhadətə .yetirildi

Şəhid Mütəhhəri Cəbəle-amil fəqihlərinin, Səfəvilər dövlətinin və İran elmi hövzələrinin xəttindəki rolu barədə yazır: «Cəbəle-Amil fəqihləri səfəvilər xəttində mühüm rol oynamışdır. Bildiyimiz kimi, səfəvilər dərviş idilər. Əgər səfəvilərin ilk öncə tutduğu dərvişlik xətti Cəbəle-Amil fəqihləri tərəfindən dəyişdirilməsəydi, onların işinin sonu Türkiyə və ya Şamdakı ələvilərin mövqeyinə gedib çıxardı. Uyğun tə’sirdən əvvəla, İran dövlət və millətinin gedişi büdrəmələrdən amanda qaldı. İkinci, şiə təsəvvüfü orta bir yol tutdu. Ona görə də Mühəqqiq Kərzki, Şeyx Bəhayi kimi Cəbəle-Amil fəqihlərinin İsfəhan fiqhi hövzəsinin tə’sisində böyük haqqı vardır. Həmin vaxt Müqəddəs Ərdəbili və başqa alimlər vasitəsi ilə canlandırılmış Nəcəf hövzəsi bu gün də işini davam etdirir. İran şəhərlərindən yalnız Qum şəhəri Bağdad fəqihlik mərkəzi olduğu zaman fiqhi mərkəz şəklinə gətirildi. Bu mərkəz Qacar dövründə Mirza Əbül-Qasim Qummi tərəfindən canlandırıldı. Bu mərkəzin növbəti dəfə həyat əldə etməsi Hacı Şeyx Əbdül-Kərim Hairi Yəzdinin xidmətləridir. Qum hazırda iki böyük şiə .«mərkəzindən biridir

Nəcəf elmi mərkəzinin daimi olaraq hücumlara mə’ruz qalması, hövzə rəhbərlərinin şəhadətə yetirilməsi səbəbindən digər alimlər və tələbələr İrana hicrət etdilər. Növbəti dəfə şiə fəqihlik mərkəzi Qum oldu. Nəcəf hövzəsində böyük alimlər olmasına .baxmayaraq, hazırda hərəkat və təravət Qumdadır

Şəhid Mütəhhəri buyurur: «Tarix, xüsusi ilə səfəvilərdən sonra İranın Həmədan, Şiraz, Yəzd, Kaşan, Təbriz, Zəncan, Qəzvin, Tus kimi şəhərlərində elmi mərkəzlər tə’sis olundu. Qum, İsfəhan və kiçik bir müddət Kaşan istisna olmaqla İran şəhərlərindən «.heç biri fiqh mərkəzinə çevrilmədi

Səfəvilər dövründən sonra Nəcəf hövzəsində yeni bir ruhiyyə yarandı və Kərbəla bir müddət şiə mərkəzi oldu. Sonradan şiə mərkəzi yenidən Nəcəfə köçürüldü. İran İslam .inqilabında da ilk sözü Nəcəf elmi mərkəzində tərbiyə almış fəqihlər söylədi

## ŞİƏ ALİMLƏRİNİN MÜBARİZƏLƏRİ, SİYASİ FƏALİYYƏT ÜÇÜN ŞƏRTLƏR

Böyük qeyb dövründə şiə alimlərinin siyasi mübarizələri məcmusunu iki mövzuda xülasələşdirmək olar: ١. Siyasi fəaliyyət zəminəsi; ٢. Siyasi fəaliyyət mərhələləri və hər .mərhələdə onun növləri

:Siyasi fəaliyyət iki istiqamətdə aparılır

İslam dövləti sərhədləri daxilində və müsəlman, qeyri-müsəlman müstəbid hakimlər ;qarşısında mübarizə

.İslam dövləti sərhədləri xaricində xarici və istilaçı qüdrətlərlə mübarizə

:Ölkə daxilində siyasi fəaliyyətləri nəzərdən keçirək

;İslam ümmətinin əlindən alınmış siyasi hüquqların tələbi

;Hakimlərin azğınlıqları ilə mübarizə

;İslami birliyin hifzi

;Cəmiyyətin islami simasının qorunması

.İdeoloji və əxlaqi azğınlıqlarla mübarizə

:Ölkə sərhədlərindən kənarda aparılan mübarizə növlərini nəzərdən keçirək

;İslam düşmənlərinin ideoloji və e'tiqadi hücumlarına cavab

;İslam ölkələrinə edilən silahlı hücumlara qarşı müqavimət

;Super dövlətlərin siyasi və iqtisadi hegemonluqlarına qarşı mübarizə

;İslam dünyasını parçalayan təfriqələrə qarşı mübarizə

.Super dövlətlərin məğlubedilməzlik mifinə qarşı mübarizə

## BÖYÜK QEYB DÖVRÜNDƏ ŞİƏLİK DİNİ MƏRCƏİYYƏTİ, MƏRCƏİYYƏTİN ƏSASI VƏ İMAMƏT XƏTTİNİN DAVAMI

İslam kamil, ümumbəşəri və əbədi bir dindir. İslam insan vücudunun müxtəlif həyat mərhələlərində bütün yönümlərinə diqqət yetirir. Bu baxışda cəmiyyət də bir fərd, dünya da axirət kimi bir yer tutur. İslam bəşəriyyət üçün ən münasib həyat proqramını .bəyan edir

İslamın ümumbəşəriliyi və əbədiliyi İslam nizamında rəhbərlik məsələsini olduqca

.əhəmiyyətli edir

Həzrət Peyğəmbərin İslam cəmiyyətinin gələcəyindən və bəşəriyyətin İslama üz tutacağından xəbər verməsi, özündən sonra insanların diqqətini on iki imama yönəltməsi, on ikinci imamın uzun çəkəcək qeybi haqqında danışması nəzərə alınarsa, İslam dəyərlərini qoruyacaq rəhbərliyin zəruriliyi də qəbul olunar. Əgər bu gün imam qeybdədirsə, demək, onun hər hansı bir nümayəndəsi İslam dinini təhlükələrdən qorumalıdır. Ona görə də on ikinci imamın qeyb dövründə rəhbərlik məsələsi məntiqi, ağılabatan və zəruri bir məsələdir. Belə bir əsasın inkar olunması kamilliyin, şəriətin idarəçilik gücünün inkar olunmasıdır. İmam qeybdə olduğu bir dövrdə zəruri şərtlərə malik fəqihin rəhbərliyi mövcud vəziyyətdən ən gözəl çıxış yoludur. Bu səbəbdən də fəqih hakimliyi haqqında dini mətnlərdə, Qur’an və peyğəmbər sünnəsində mə’lumatlar verilmişdir. Belə bir qurumun tə’sisi İslam cəmiyyətinin qeyb dövründəki bir çox problemlərini aradan qaldırmışdır. Fiqh və fəqihlik sayəsində tarixin ən eniş-.yoxuşlu dövrlərində belə şiə düşüncəsi öz təravətini itirməmişdi

Qur’ni-kərimdə buyurulur: «Din alimləri və fəqihlər isə kitabdan qorunub saxlanılanlarla hökm edərdilər.»Həzrət Peyğəmbərdən (s) nəql olunmuş rəvayətlərdə də alimlər peyğəmbərlərin varisləri kimi tanıtdırılır və fəqihlərin peyğəmbər əmanətçisi, xalqa hakim olduğu bildirilir. Mə’sum imamlardan nəql olunmuş rəvayətlərdə fəqihlərə təqlid edilməsi zəruri sayılır. Vəkalət qurumu kiçik qeyb dövründə mə’sumlara bağlı ən fəal qurum olmuşdur. Fəqihlər də mə’sum imamlar tək ictimai həyata qatılaraq, xalqın dini vəzifələrinin tə’yin edilməsində aparıcı rol oynamışlar. Onlar təqiyyə zamanı bir cür, aşkarlıq zamanı isə başqa cür hərəkət .etmişlər

Dinin təbliği, dinlə bağlı şübhələrin aradan qaldırılması fəqihlərin ilkin vəzifələrindən .olmuşdur. Onların elm və siyasət səhnəsindəki xidmətlərinə tarix şahiddir

## MƏRCƏİYYƏTİN, FƏQİHLİYİN MƏRHƏLƏLƏRİ VƏ DÖVRLƏRİ

Böyük qeyb dövründə şəraiti nəzərə alaraq dini rəhbərlik üçün mərhələlər müəyyənləşdirilə bilər. Dini hərəkat hədəflərini nəzərə alaraq bu hərəkat üçün üç :mərhələ müəyyənləşdirilə bilər

Təqiyyə mərhələsi: Din və siyasət rabitələri sahəsindəki məxfilik böyük qeyb.۱ dövründən qabaq başlamışdır. Məntəqədəki siyasi vəziyyətdən asılı olaraq təqiyyə

dərəcəsi müəyyənləşdirilmişdir. İnqilabi şiə dövlətləri həmin dövlətdəki imkanlara .münasib olaraq zühur üçün şərait hazırlamışlar

Hakimiyyətə çatmaq üçün təlaş mərhələsi: Fəqihlər hakimiyyətə birbaşa nəzarət.۲ .etmədiklərindən hicri X əsrdən sonranı ikinci mərhələ saya bilərik

Hakimiyyətə çatma mərhələsi: Bu mərhələ hicri XV əsrdən İslam inqilabının qələbəsi.۳ ilə başlamışdır. Cameüş-şərait fəqihin rəhbərlik vəzifəsini öz öhdəsinə götürməsi ilə .İslam qanunları cəmiyyətə hakim olmuşdur

## ŞƏHİD SƏDRİN BAXIŞINA ƏSASƏN MƏRCƏİYYƏT MƏRHƏLƏLƏRİ

Böyük şəhid və mərcə Seyyid Məhəmməd Baqir Sədr şiə tarixi boyu mərcəiyyət :hərəkatı üçün beş mərhələ müəyyənləşdirmişdir

Birinci mərhələ: İmamların səhabələrinin dövründən Əllamə Hillinin dövrünədək .davam edən bu mərhələdə xalqın fəqihlərlə rabitəsi sorğu-sual həddində olmuşdur

İkinci mərhələ: Şəhide-Əvvəlin zamanında Vəhid Behbehaninin zamanınadək davam .etmiş mərhələdə fəqihlər xalqla öz vəkilləri vasitəsi ilə rabitə saxlamışlar

Üçüncü mərhələ: Şeyx Cə’fər Kaşiful-Ğitanın dövründən İslam dünyasının istismar dövrünədək davam edən bu mərhələdə hər bir fəqihin vəzifəsi müəyyənləşdirilmişdir. .Fəqihlik fəaliyyəti mərkəzləşmiş qaydada həyata keçirilirdi

Dördüncü mərhələ: İslam dünyasının istismar dövründən hicri XV-əsrədək davam etmiş bu mərhələ daxili istibdad və xarici istismara qarşı siyasi mübarizələrlə .zəngindir

Beşinci mərhələ: Hicri XV əsrdən başlamış bu mərhələ fəqihlərin hakimiyyətə birbaşa .nəzarəti istiqamətində ciddi addımlar atılmışdı

## MEHDİLİK İDDİASINDA OLANLAR

Şiə e’tiqadına, bir çox sünni rəvayətlərinə əsasən son dövrdə həzrət Peyğəmbər ailəsindən olan Mehdi adlı canişin zühur edəcəkdir. İki rəvayət nəql etməklə

kifayətlənirik: Həzrət Peyğəmbər (s) buyurur: «Əgər dünyanın ömründən bir gün də qalmış olsa, Allah-təala həmin gün mənim ailəmdən bu şəxsi ayağa qaldırar və yer

üzünü zülm-sitəm tutduqdan sonra onu ədalətlə doldurar».(1) Başqa bir rəvayətdə isə həzrət belə buyurur: «Əgər dünyanın ömründən bir gün də qalmış olsa Allah-təala həmin günü o qədər uzadar ki, mənim ailəmdən bir şəxs ayağa qalxar. Onun adı mənim adımdandır.»(2)

Həzrət Mehdinin (ə) zühurundan danışan rəvayətlər o qədər çoxdur ki, onları inkar etmək və ya şübhə ilə qarşılamaq mümkünsüzdür. Bu rəvayətlərin çoxluğu səbəbindən Mehdinin (ə) zühuruna e’tiqad bütün məzhəblərdə özünü göstərməkdədir.

Həzrət Mehdinin (ə) xüsusiyyətləri sadalanmış rəvayətlərə əsasən, o, imam Həsən Əsgərinin (ə) oğludur, həzrət Peyğəmbər (s) Əhli-beytindən on ikinci imamdır. Onun iki qeyb dövrü var: kiçik qeyb və böyük qeyb.

Təəssüf ki, bə’zi İslam məzhəblərində bu inancdan pis məqsədlə istifadə edilmiş və bə’ziləri zühuru gözlənilən Mehdi (ə) olduğunu iddia etmişdir. Hansı ki, rəvayətlərdə sadalanmış xüsusiyyətlər onlarda yoxdur. Məsələn, iddiaçıların heç biri imam Həsən Əsgərinin (ə) övladı deyildir.

Bə’zi fəzilətli insanlar isə özləri heç bir iddia etmədikləri halda başqaları tərəfindən Mehdi (ə) kimi qəbul olunmuşlar. Məsələn, həzrət Əlinin (ə) oğlu Məhəmməd Hənəfiyyə, Məhəmməd ibn Əbdullah ibn Həsən, imam Cə’fər Sadiq (ə), imam Kazim (ə), İsmail ibn Cə’fər, imam Baqir (ə), imam Həsən Əsgəri (ə) bə’zi cahillər tərəfindən Mehdi (ə) kimi qəbul olunmuşlar. Bə’zən isə Mehdi abbasi, Əbu Müslim Xorasani kimi qəddar insanlar Mehdi (ə) kimi tanıtdırılmışlar. Dünyapərəstlik və sair çirkin məqsədlərlə Mehdilik (ə) iddiası etmiş bə’zilərinin adını xatırlayaq: Übeydullah ibn Məhəmməd Fatimi (Übeydiyan və ya Fatimiyan silsiləsinin bünövrəsini qoymuş şəxs), hakim Beəmrillah (Misir Übeydiləri xəlifələrindən olmuşdur), Təhami (Yəmənin Təhamiyyə məntəqəsində dövlət qurmuşdu), Baba İshaq (Osmanlı Sultan Süleymanın dövründə yaşamış və Keyxosrov tərəfindən qətlə yetirilmişdir), Abbas Reyfi, Abdullah Cəbəli, Molla Ərşi Kaşani (İsfəhanda Mehdilik, hətta peyğəmbərlik iddiası etmişdir), Mirzayi Bəlxi, Şeyx Əbdül Qədir Buxarayi, Məhəmməd Zunpuri Hindi, Şeyx Şəmsəddin Məğribi, Şeyx Məğribi, Şeyx Zadeye-Kürdüstani, Əbdüllah Əcəmi, Benqali, Seneqali, Şeyx Səid Yəmani, Məhəmməd Sudani, Sumal, Əli Məhəmməd Şirazi, Mirza Qulam

.Əhməd

Böyük qeyb dövründə də bə’ziləri özlərini həzrət Mehdinin (ə) səfiri kimi təqdim etdilər və axırda rüsvay oldular. Özünü həzrət Mehdinin (ə) naibi kimi təqdim edənlərə aşağıdakı şəxsləri nümunə göstərmək olar: Əbu Dəlf Məcnun, Məhəmməd ibn Sə’d, Əhməd ibn



---

.Biharul-ənvar» ۵۱-ci cild, səh. ۸۵» [۹] -۱

.Sünəne-Əbu-Davud» ۲-ci cild, səh. ۳۰۹» [۱۰] -۲

Hüseyn Razi, Hüseyn ibn Əli İsfəhani Katib, Əli ibn Məhəmməd Səcəstani, Seyyid .Məhəmməd Hindi, Şeyx Məhəmməd Məşhədi, Seyyid Məhəmməd Əli Şirazi

## XÜLASƏ

Həzrət Peyğəmbər dünyasını dəyişdikdən sonra əhli-beytin haqqı uğrunda və xilafət .məsələsində e’tiraz edənlərin əksəri on iki imamçı şiələr oldu

Şiələr Raşidi xəlifələri dövründə (hicri ۱۱-۳۵) daim təzyiqlərə mə’ruz qaldılar. Hicri ۴۰-۱۳۰-cu illərdə Bəni-Üməyyənin hakimiyyəti zamanında şiələrin malına və canına təcavüz edildi. Hakimlər öz amansızlıqlarını dərinləşdirdikcə şiələr əqidələrində daha .da möhkəmləndilər, məzlumiyyətləri onların əqidələrini daha da səmərəli etdi

Şiələr hicri II əsrin ortalarında Abbasilərin hakimiyyətinin əvvəlində azca nəfəs dərdikdən sonra yenidən sıxıntılara mə’ruz qaldılar və hicri III əsrin axırlarınadək bu .sıxıntı gücləndi

cü əsrin əvvəllərindən V əsrin axırlarınadək inqilabi şiə dövlətlərinin iş başına-۴ gəlməsi ilə (ali-Buyə, Fatimilər, Həmdanilər, Ələvilər) şiələr bir qədər azadlıq əldə edib .e’tiqadi mübarizələrini aşkarladılar

Hicri VI və VII əsrlərdə monqolların İslam dünyasına hücumu və səlib yürüşlərinin davamı nəticəsində şiələr bir o qədər də çətinlik görmədilər. Bə’zi monqol xanlarının şiə əqidəsində olması İranda, Mazandaranda və Xorasanda şiə cəmiyyətini .gücləndirdi və bu cəmiyyət say baxımından xeyli artdı

Hicri IX əsrdə səfəvilər dövlətinin yaranması ilə şiə məzhəbi rəsmi olaraq tanındı və bu rəsmilik son dövrlərədək davam etdi. Beş əsr ardıcıl İran və İraq şiəlik mərkəzi kimi .fəaliyyət göstərdi və bu iki ölkədə şiə fiqh mərkəzləri möhkəmləndi

Hicri XV əsrin başlanğıcında mütərəqqi vilayəte-fəqih nəzəriyyəsi əsasında İslam hökuməti təşkil edildi. Bu hökumət hal-hazırda dünya müsəlmanlarının arzularının .gerçəkləşməsində mühüm rol oynayır

Beləcə, hicri ۳-۵-ci əsrlər inqilabi şiə dövlətləri dövrü, hicri ۶-۹-cu əsrlər şiələrin

təqiyyədən aşkar fəaliyyətə keçdiyi dövr, hicri ۱۰-۱۵-ci əsrlər şiələrin rəsmi İslam .məzhəbi kimi formalaşması dövrü adlandırıla bilər

İslam elmlərinin tə’sisçisi şiələr olmuşdur. İslam dünyasında elmi hərəkatda ilk addım atan da onlardır. Şiələrin hədis, fiqh, kəlam, fəlsəfə və digər elm sahələrindəki inkişafı .inkaredilməzdir

Fiqh və fəqihlik ardıcıl və bəhrəli bir həyatdan faydalanmışdır. Dövrün şəraiti ilə bağlı şiə fiqhi və fəqihliyi səciyyəvi xüsusiyyətlərə malik üç dövr-hüzur, kiçik qeyb və böyük .qeyb dövrlərini görmüşdür

Zaman ötdükcə şiə məktəbindəki ifratçı və təfritçi cərəyanlar sönükmüş və kamil bir fiqh məktəbi yaranmışdır. Bütün çətin məqamlarda ilk sözü deyən şiə mərkəzləri böyük qeyb dövründə Qum, Bağdad, Nəcəf, Hillə, Cəbəle-Amil, İsfəhan, Nəcəf, .Kərbəla və Qum şəhərlərində möhkəmlənmişdir

Şiə alimlərinin siyasi fəaliyyətləri müxtəlif şəraitlərdə müxtəlif mərhələlər keçmişdir. Şiəliyin varlığının qorunmasından İslam hökumətinin qurulmasınadək əhli-beyt üsuluna əsaslanan təkamül yolu keçilmişdir. Bu fəsildə həm də Mehdilik və səfirlik .iddiası etmiş fırıldaqçılar haqqında danışdıq

səh:۱۶۸

## DOQQUZUNCU FƏSİL

### «İMAM MEHDİNİN (Ə) YOLU VƏ ƏSƏRLƏRİ «MÜŞK SONLUQ

İmam Mehdinin (ə) yolu və əsərləri haqqında bir çox mə'lumatlar əldə edilmişdir. Kitabın sonunda onlardan bə'zilərini xülasə şəkildə nəzərdən keçirmək yerinə düşər.

### YOL

İmam Mehdinin (ə) üslubu, rəftarı və əsərləri iki baxımdan araşdırıla bilər: kiçik qeyb dövründə və zühur dövranında. Bu səciyyələr bizim üçün yaxşı bir nümunə olduğundan onlardan bə'zilərini xatırlamaq münasib olar.

### QEYB ƏSRİ

İmamın hidayət və rəhbərlik, müsəlmanların və şiələrin hifzi, ümumdünya inqilabı üçün şərait və yardımçıların hazırlanması kimi şə'nləri vardır . . . Həzrət bütün şə'nləri və vəzifələrini ən üstün şəkildə yerinə yetirməkdədir. Qeyb prinsipinə uyğun gələn bütün işlərdə həzrətin diqqəti vardır. Belə ki, rəvayətdə nəql olunmuşdur: «Qeybim dövründə məndən faydalanmaq buludlar arxasında gizlənmiş günəşdən faydalanmaq kimidir».

Həzrət cəmiyyətdə iştirak etmədiyi üçün yox, sadəcə, zahir olmadığı üçün Ğaib (qeybdə olan) adlandırılmışdır. Qeybin cəmiyyətdə hazır olmamaq kimi yozulması həzrətə qarşı yersiz bir böhtandır. Belə düşünənlər zühurla hüzur arasındakı fərqi bilmirlər. Həzrətin gəlişi onun hüzuru yox, zühuru mə'nasındadır. Onun aşiqləri Allahdan həzrətin hüzurunu yox, zühurunu diləyirlər. Həzrət zahir olduğu vaxt insanlar heyrətdən yerində donar və təəccüblə deyərlər ki, biz onu nə vaxtsa görmüşük.

Həzrətin xüsusiyyətlərini öyrənmək üçün müxtəlif rəvayətlərə, dualara, ziyarətnamələrə, həzrətin bə'zi şiələrə ünvanladığı fərman və məktublara, həzrətin hüzuruna nail olmuş e'tibarlı insanların söhbətlərinə müraciət etmək olar.

Dualarda, göstərişlərdə daha çox nəzərə çarpan həzrətin şiələrin vəziyyətinə, problemlərinə diqqət yetirməsidir. Bu mətnlərdə bəyan olunmuş bə'zi nöqtələrə nəzər salırıq:

;Şiələrin vəziyyətindən xəbərdarlıq .۱

Şeyx Müfid üçün çıxarılmış fərmanda bildirilir: «Biz sizin vəziyyətinizdən agahıq və bu

.«sahədə bizim üçün gizli bir şey yoxdur

;Şiələrin çətinlikdən və düşmənlərin şərindən hifzi .٢

Həmin göstərişdə bildirilir: «Biz sizə yardımda yubanmamış və sizi yaddan çıxarmamışıq. Əgər belə olmasaydı, çətinliklər və müsibətlər sizi sarsıdar, .«düşmənləriniz kökünüzü qazardılar

İmamın xalqa yardımına misal olaraq Bəhreyn xalqının istilaçılar və onların nökərlərinin əlindən xilas olunmasını göstərmək olar. Bəhreynin baş naziri şiələrlə kitab əhlindən olan hərbi kafirlər kimi rəftar etmək istədikdə, onlardan zəlilcəsinə cizyə almaq planı qurduqda, kişilərini öldürüb, qadın və uşaqlarını əsir götürmək qərarına gəldikdə həzrət Mehdi (ə) onun hiylələrini puça çıxarmaq üçün böyük rol .oynadı

;Xalq arasında hüzur .٣

No’maninin «Əl-ğeybət» kitabında oxuyuruq: «Sahibul-əmr (imam Mehdi (ə)) onların arasında gəzir, bazarlarına get-gəl edir, xalçaları üstə qədəm götürür. Amma onu .«tanımırlar. O, yalnız Allahın izni ilə özünü insanlara tanıtdırır

Digər bir rəvayətdə həzrət Əli (ə) buyurur: «And olsun Əlinin Allahına, Allahın höccəti onların arasındadır. Küçə və bazarlarında gəzir, evlərinə varid olur, şərq və qərbə səyahət edir, xalqın danışdıqlarını eşidir, cəmiyyətlərində iştirak edir, onlara salam «.verir. O, xalqı görür

Nüdbə» duasında belə oxuyuruq: «Canım sənə qurban! Sən bizim aramızda olan» qaibsən. Canım sənə fəda! Sən vətənindən uzaq düşmüş o kəssən ki, bizdən uzaq .«düşməmisən

.Həcc mərasimində daimi hüzur .۴

Kəmalud-dində» oxuyuruq: «Həzrət hər il həcc mərasimində iştirak edir. Hamını görür» .«və tanıyır. Başqaları isə onu görür, amma tanımır

Sadalanan xüsusiyyətlərdən əlavə, həzrət çətinliyə düşənlərə əl tutur, yolunu

itirənlərə yol göstərir, əlacsız xəstələrə şəfa verir, mö’minlərə dua edir, bə’zilərinin dəfnində iştirak edir, alimlərin bə’zi elmi məsələlərini aydınlaşdırır, ümidsizlərə ürək-dirək verir. O tanınsa da, tanınmasa da, özü birbaşa və ya başqasının vasitəsi ilə .aşiqlərinə əl tutur

**ZÜHUR DÖVRANI**

:Həzrətin bə’zi tərbiyəvi və əxlaqi xüsusiyyətlərini nəzərdən keçirək

Rəvayətdə nəql olunur: «Bizim Qaim qiyam edəndə əlini bəndələrin başına qoyar, onların ağıllarını təmərküzləşdirər, əxlaqlarını kamala çatdırar. Həzrətin diqqəti və

hidayəti sayəsində düşüncələr çiçəklənər, bir çox ictimai fəsadların səbəbi olan dar .«baxışlar, əxlaqi çirkinliklər aradan qalxar

.«Mehdi (ə) dövlətində bütün xalqa hikmət və elm öyrədilər»

.«Mehdi qiyam etdiyi vaxt Allah-təala bəndələrin qəlbinə ehtiyacsızlıq hissi salar»

.«Bizim Qaim qiyam edəndə sinələrdən kinlər çıxar»

Qaim qiyam edəndə hər bir əhli-beyt düşməninə iman təklif edər. Əgər qəlbən qəbul» .«etsələr onları bağışlayar, qəbul etməsələr, boyunlarını vurar

O, xalqı Allahın kitabına, peyğəmbər sünnətinə, Əli vilayətinə və düşmənlərə arxa» .«çevirməyə çağırır

Həzrət Peyğəmbər (s) buyurur: «Onun yolu və sünnələri mənim yolum və sünnəmdir.» .«Xalqı mənim din və ayinimə gətirər və onları Allahımın kitabına də’vət edər

:İmamın ictimai səciyyələri haqqında bə’zi nöqtələri qeyd edək

.«Yer üzünü zülm-sitəm bürüdükdən sonra onu ədalətlə doldurar»

.«Mehdi (ə) sizə göstərər ki, ədalətli yol necədir»

.«Ədaləti hamını əhatəyə alar»

.«And olsun Allaha, Mehdi (ə) ədaləti evlərə isti-soyuğun daxil olduğu kimi daxil edər»

Qeyri-qanuni rabitələr, məstedici içkilər, sələmçilik aradan qalxar, xalq ibadət-itaətə» .«üz tutar, əmanətlər qorunar, şər insanlar məhv edilər, saleh insanlar qalxar

Bizim Qaim qiyam edəndə həqiqi dostluq, həqiqi səmimiyyət ayaq tutub gəzər, hər bir» ehtiyaclı öz iman qardaşının cibindən ehtiyac duyduğu qədər götürər və qardaşı bu işi .«ona qadağan etməz

Əsil yollar genişləndirilər, yol üstə tikilmiş məscidlər sökülər, balkonlar və küçəyə» .«açılan pəncərələr bağlanar, küçəyə açılan su ayaqları tutular

Sizə həzrət Mehdinin (ə) gəlişi ilə müjdə verirəm. Göy və yerin sakinləri ondan razı» olar. O, sərmayələri düzgün şəkildə bölər. (Bir şəxs Peyğəmbərdən bu bölgünün .«necəliyi haqqında soruşdu və həzrət buyurdu) Yə’ni xalq arasında bərabər bölər

Mehdi (ə) xalq arasında elə bir bölgü aparar ki, bir nəfər də olsa, ehtiyaclı tapılmaz,» .«kimsə zəkata möhtac olmaz

## SİYASİ SƏCİYYƏLƏR

:İndi isə zühur dövrünün siyasi səciyyələri ilə tanış olaq

.«Qaim qiyam etdiyi vaxt batil dövlətlər məhv olar»

səh:۱۷۱

.«Həmin gün İslam hökumətindən savay heç bir hökumət olmaz»

Heç şübhəsiz ki, gecə və gündüzün çatdığı hər bir nöqtəyə Məhəmməd (s) ayinləri» .«çatacaq və yer üzündə şirkdən əsər qalmayacaq

.«O yalnız qılınc tanıyar»

.«Mehdi (ə) dövləti dünyanın şərqini və qərbini də'vət edər»

.«Allahın düşmənlərini öldürər ki, Allah razı olsun»

Mehdi (ə) qiyam etdiyi vaxt «Əşhədu Əlla İlahə İlləllah və Əşhədu Ənnə Muhəmmədən» .«Rəsulullah» fəryadının çatmadığı yer qalmaz

Peyğəmbərdən soruşdular ki, əsrin imamı zimmə əhli ilə necə rəftar edər? Həzrət» buyurdu: «İslam Peyğəmbəri kimi onlarla müqavilə bağlayar, onlar da mütilik .«göstərərək öz əlləri ilə cizyə ödəyərlər

O, qiyam qaldıranda ədalətlə hakimlik edər, onun dövründə zülmün kökü kəsilər və» «.yollar əmin-aman olar

O, azğınlar arasında qılınc çəkər və kimsədən tövbə qəbul etməz. Vay Mehdi (ə) ilə» .«düşmənçilik edənin halına

Pərvərdigara! Sənə ümid edirik ki, imam zamanın kəraməti ilə dövlət zühura» gətirəsən, İslam və əhlinə onunla izzət bəxş edəsən, nifaq və nifaq əhlini zəlil .«buyurasan

.«Allah-təala həzrət Mehdi (ə) vasitəsi ilə bu ümməti büdrəmələrdən sonra islah edər»

.«Qaimin tərəfdarları Allah razı olanadək öz qılınclarını yerə qoymazlar»

Bizim Qaim qiyam edən zaman qan-tər axar, mübarizə meydanlarında atlara süvar» .«olunar

Haradadır təcavüzkarların qəddini qıran? Haradadır şirk və nifaq binalarını viran» «?qoyan? Haradadır azğınlıq və tüğyan əhlini məhv edən

:Zühur dövrünün iqtisadi səciyyələrinə nəzər salaq

Həmin zamanda mənim ümmətim bu vaxtadək heç bir ümmətin bəhrələnmədiyi» ne’mətlərdən bəhrələnər. Yer üzü başdan-başa məhsul verər və heç nəyi onlara əsirgəməz. Hər kəs həzrət Mehdinin (ə) yanına gəlib ondan mal istəsə, həzrət .«yubanmadan onun istədiyini əta edər

.«Mehdinin (ə) dövlətində sələmçilik aradan götürülər»

.«Mehdi (ə) bütün ölkələrdəki nümayəndələrinə tapşırar ki, şəhərlər abad edilsin»

.«Yer üzü Mehdinin (ə) əli ilə abad, xürrəm olar»

Yerin təkindəki bütün mə’dən və xəzinələr həzrətin hökuməti zamanı aşkarlanıb,» .«istixrac olar. Yer üzündəki bütün xarabalıqlar həzrət tərəfindən abad edilər

səh:۱۷۲

.«Yer bütün olanlarını cücərdər, mal-qara bol olar»

Həzrətin zühuru zamanı səmadan bol yağış yağar, torpağın təkində göyərməyən bir» .«şey qalmaz

.«Var-dövlət hesaba alınmadan bölünər»

Bizim Qaim qiyam edən zaman zalım hakimlərin mənimsədiyi və ya həvalə etdiyi» «.torpaqlar geri qaytarılar

.«Həzrət xalq arasında elə bir bölgü aparar ki, heç bir ehtiyaclı qalmaz»

:Uyğun dövrün elmi səciyyələrinə nəzər salaq

Elm və bilik ٢٧ hərfdən, şö’bədən ibarətdir. Peyğəmbərlər onun yalnız ikisini xalq üçün» gətirmişlər. Xalq bu günədək ٢٧ hərfdən ikisini tanımışdır. Qaim qiyam etdiyi vaxt qalan .«٢٥ şö’bə də aşkar olar

Qaim qiyam edəndə Allah-təala bizim şiələrin qulaqlarını və gözlərini o qədər» gücləndirər ki, onlarla Qaim arasında vasitəçiyə ehtiyac qalmaz. Onunla danışar və onun danışdıqlarını eşidərlər, o öz yerində insanlar isə ucqarda olduqları vaxt onları .«görər

Mö’min şəxs Qaimin zamanında şərqdə olduğu halda qərbdəki qardaşını görər. Eləcə» .«də, qərbdə olan kəs şərqdəki qardaşını müşahidə edər

Me’rac hədisində buyurulur:) Küləkləri ona müti edərəm, şimşəkli buludlar ona ram)» .«olar. Onu səmalara səfər üçün vasitə ilə səmalara ucalmağa müvəffəq edərəm

:Hüzur dövrünün mühakimə səciyyələrinə nəzər salaq

.«O (Mehdi (ə)) xalq arasında həzrət Davud kimi mühakimə edər»

.«Həzrət Mehdi (ə) həzrət Davud və Süleyman kimi hakimlik edər və dəlil tələb etməz»

Həzrət Tövrat əhli ilə Tövratla, İncil əhli ilə İncillə, Zəbur əhli ilə Zəburla, Qur’an əhli ilə» .«Qur’anla mühakimə aparar

Hətta qadınlar da evlərdə Allahın kitabı və peyğəmbər sünnəsi əsasında mühakimə»
.«edərlər

.«Onun hökmlərində rüşvətə yol yoxdur»

:Hüzur dövründə həyatvericilik səciyyələri

.«Həzrət kitab və sünnədə tərk olunmuş hökmləri dirildər»

Allah–təala Mehdinin (ə) vasitəsi ilə bid’ətləri və azğınlıqları aradan qaldırar, sünnələr»
.«dirildilər

Allah-təala onun vasitəsi ilə ölü torpaqları dirildər, dini onun əli ilə aşkarlayar, » .«müşriklərə xoş gəlməsə də, haqqı gerçəkləşdirər

.«Bütün bid'ətlər aradan qaldırılar, bütün sünnələr canlandırılar»

İmam Sadiq (ə) bir Qur'an ayəsinin təfsirində buyurur: «İnsanların kafir olması ilə yer» .«öləndən sonra Allah-təala onu Qaim vasitəsi ilə dirildər

Haradadır Qur'an və onun hədlərini diriltmək üçün arzu edilən kəs? Haradadır din və» ?din əhlinin nişanələrini dirildən kəs

:Peyğəmbərlik və ələvilik səciyyələri

.«Onlar arasında peyğəmbər üsulu ilə rəftar edər, peyğəmbərin yolunu gözləyər»

Cəddi peyğəmbərin yolu ilə gedər və həyat tərzi Əmirəl-mö'mininin (ə) həyatı kimi» .«olar

.«Həzrət Mehdi (ə) mənim yolumu davam etdirər, mənim yolumdan kənarlaşmaz»

.«Bütün bid'ətləri Mehdi (ə) aradan qaldırar və əməl edilməyən bir sünnə qalmaz»

Qaim qiyam edən vaxt, bir zaman Peyğəmbər (s) yeni əmr gətirdiyi tək yeni əmr» .«gətirər

## İMAM MƏHDİNİN FƏRDİ SƏCİYYƏLƏRİ

Gecə namazı və gecələr oyaqlıq səbəbindən həzrət Mehdinin (ə) rəngi sarıya çalır.» Fəda olum o kəsə ki, gecələr səcdə və rüku halındadır, ulduzların tülu və qürubunu izləyir. Fəda olum o kəsə ki, Allah yolunda edilən məzəmmətlər ona tə'sir göstərmir. O mütləq qaranlıqlarda hidayət çırağıdır. Fəda olum o kəsə ki, Allahın əmri ilə qiyam .«edər

.«Mehdi (ə) Allah qarşısında təvazökardır»

.«Mehdi (ə) Allah qarşısında mütidir»

.«Mehdi (ə) Allah qarşısında hamıdan təvazökardır»

.«O yaxşılıqlara və xeyirxahlıqlara tələsir, mübariz və çalışqandır»

.«Onda Musanın kamalı, İsanın şövkəti, Əyyubun dözümü var»

«.Allahın kitabına və peyğəmbər sünnəsinə elm Mehdi (ə) qəlbində kök atmışdır»

Allah-təala mənim övladlarım və pak fitrətim arasından elə birini ayağa qaldırır ki,» başdan ayağa ədalət, bərəkət və paklıqdır. O ən kiçik haqsızlığa göz yummaz. Allahın fərmanına itaət edər, kimsə ilə qohumluq hesabı yoxdur, daşı daş üstünə qoymamışdır .«((dünya malından bir şey götürməz

Mehdinin (ə) aramlıq və vüqarı, halal-haramı tanıması, ona ehtiyac və onun» .«ehtiyacsızlığı ilə tanıyacaqsınız

səh:۱۷۴

O xalqın ən biliklisi, hikmətlisi, ən pəhrizkarı, ən dözümlüsü, ən bağışlayanı və ən» abididir. Gözləri yuxuya getsə də, qəlbi daim oyaqdır, mələklər onunla söhbət edir. .«Duası daim qəbul olur. Əgər daşa nifrin etsə, daş ikiyə bölünür

.«Mehdi (ə) iki bariz nişanəsi ilə tanınır: sonsuz biliyi və dualarının qəbul olması ilə»

.«Onun biliyi hamıdan çox, mərhəməti hamıdan genişdir»

.«And olsun Allaha ki, onun libası cod yeməyi bərk və yavanlıqsızdır»

O özü ilə əhd etmişdir ki, xalqın istədiyi tək onlar gedən yolla getsin, onlar geyən» libasdan geysin, onların miniyi kimi miniyə süvar olsun, aza qane olsun. zülmlə dolmuş yer üzünü Allahın yardımı ilə ədalətlə doldurar. Allaha Onun layiq olduğu kimi pərəstiş .«edər və qapısında keşişçi dayandırmaz

.«Təqvanı əsas götürər və bəsirətlə addım atar»

## İDARƏÇİLİK SƏCİYYƏLƏRİ

Mehdi (ə) bağışlayandır və çox bağışlayar. Öz dövlət mə’murları ilə ciddi rəftar edər,» .«çarəsizlərlə mehriban olar

Həzrət Mehdi (ə) öz tərəfdarlarını bütün şəhərlərə yayar və onlara göstəriş verər ki,».١ ədalət və ehsanla rəftar etsinlər. Onları dünya ölkələrinə hakim tə’yin edər və .«şəhərlərin abad olmasını tapşırar

Öz valilərini şəhərlərə göndərər və göstəriş verər ki, xalq arasında ədaləti bərpa».٢ .«etsinlər

O, Allahın fərmanını dəqiq yerinə yetirər. Kimsə ilə qohumluq hesabı yoxdur, daşı-».٣ daş üstə qoymaz. Allah-təala onun vasitəsi ilə haqq və həqiqət qapılarını açar, batil .«qapılarını bağlayar

.«Haqqı vacib edər».۴

Dünyada bid’ət qalmaz, mövcud bid’ətlər aradan qaldırılar. Bütün sünnələr yerinə».۵ .«yetirilər

.«Mehdi (ə) öz yaxınları ilə məşvərət edər».۶

Həzrət Mehdinin (ə) vəzirləri qeyri-ərəb olar. Onların arasında bir nəfər də ərəb».۷ .«tapılmaz. Amma onlar ərəbcə danışar və ən yaxşı vəzirlər olarlar

.«Allahın kitabına əməl edər, harada pis iş görsə, onu çirkin sayıb inkar edər».۸

.«O, himayədar və xeyirxahdır».۹

.«O, salehlər kimi rəftar edər».۱۰

O, xalqa onların özündən daha qayğılı, ata-analarından daha qayğılı, Allah».۱۱ qarşısında hamıdan təvazökardır. Xalqa nəyi əmr edərsə, özü hamıdan qabaq ona əməl edər. Xalqa qadağan etdiyi

.«şeydən əvvəlcə özü çəkinər

Mehdi (ə) zühur edəndə doğru yolu üstələmiş nəfs istəklərini səmavi hidayətə».۱۲ qaytarar. Düşüncələri bir vaxt rə’ylərin qalib gəldiyi Qur’ana yönəldər. Sizə elə bir şəxs hakim olacaq ki, bu günkü hökumətlərin soyundan deyil. Sizin Mehdi (ə) göstərəcək ki, .«hökumətdə ədalətli rəftar necə olur. Kitab və sünnədən tərk edilənlərə həyat verəcək

## ƏSƏRLƏR

Həzrətin atası ilə az olması, qeyb dövründəki məhdudiyyətlərə baxmayaraq, bə’zi :əsərləri yadigar qalmışdır. Bə’zi mühüm əsərlərə nəzər salaq

Rəvayətlər və dəlillər: Bu rəvayətlər həzrətin uşaqlıq dövrü və atası ilə birgə yaşadığı .۱ .qısa müddətlə bağlıdır

Dualar və namazlar: Dua insanın öz Allahı ilə səmimi rabitəsi və aşiqanə.۲ zümzüməsidir. Həzrətdən nəql olunmuş duaların uca və çoxsaylı məziyyətləri var. Allah, əhli-beyt, həzrət Mehdinin (ə) məqamının tanınması, qiyamət, intizar, intizar dövründə vəzifələr, haqqın batilə qələbəsi, səbr, çətinliklərin dəfi, əxlaq məsələləri ilə tanışlıq həmin məziyyətlərdəndir. Həzrətdən bu dualarla yanaşı bir sıra namazlar da .nəql olunmuşdur

Ziyarətnamələr: Ziyarət imamşünaslıq və insanla imam arasındakı rabitə.۳ göstəricisidir. Həzrətə aid olan ziyarətnamələrdə dərin maarif mövcuddur. Bu mətnlərdə imamların məqamı, vəzifələri, mö’minlərin təklifləri və başqa həqiqətlər .bəyan olunmuşdur

Fərmanlar və bəyanatlar: Həzrət Mehdi (ə) öz naiblərindən bə’zilərinə məktublarla.۴ müraciət etmişdir. Dörd naibə və şeyx Müfidə ünvanlanmış namələri misal göstərmək olar. Bu namələrdən bə’zilərində həzrətə ünvanlanmış suallar cavablandırılmışdır. Bə’ziləri isə həzrət tərəfindən verilmiş fərmanları əks etdirir. Bu namələrin bir sıra dəyərləri vardır. Məsələn, fiqhi suallara cavab, qeyb dövründə imamın rolu, xəbərdarlıqlar, təsdiqlər, təkziblər, intizarda olanların vəzifələri, qeyb dövründə .fəqihlərin məs’uliyyəti

Uyğun namələrdən əlavə, həzrətin bir sıra buyuruqları yadigar qalmışdır. Bu buyuruqlar həzrətlə görüşmüş şəxslər tərəfindən nəql edilmişdir. Həzrətin ikinci səfiri Məhəmməd ibn Osman Əmri deyir: «Həzrəti son dəfə Məkkədə Allah evinin kənarında gördüm. O deyirdi: «Pərvərdigara, mənə verdiyin və’di yerinə yetir». Həzrət Kə’bənin pərdəsini tutub ərz edirdi: «Pərvərdigara, düşmənlərdən mənim intiqamımı al».

## XÜLASƏ

İmam Mehdinin (ə) yolu və əsərləri haqqında mənbələrdə bir sıra mə’lumatlar vardır. .İmam Mehdinin (ə) yolu iki baxımdan araşdırıla bilər: Qeyb dövrü və zühur dövrü

Qeyb dövründə imam xalq arasındadır, onlardan xəbərdardır və onları qorumağa çalışır. Həzrət zühur dövründə tərbiyəvi, əxlaqi, idarəçilik istiqamətlərində fəaliyyət .göstərir. Həzrətin xüsusiyyətlərinə nəzər salaraq onun ardıcılları öz idealını tapa bilər

İmamın ona münasibətdə ciddi məhdudiyyətlərə baxmayaraq, dəyərli əsərləri .qalmışdır. Dualar, məktublar həzrətin əsərlərindəndir

səh:۱۷۷

## MÜNDƏRİCAT

səh:۱۸۰

## درباره مرکز

بسمه تعالی

هَلْ يَسْتَوِي الَّذِينَ يَعْلَمُونَ وَالَّذِينَ لَا يَعْلَمُونَ

آیا کسانی که می‌دانند و کسانی که نمی‌دانند یکسانند ؟

سوره زمر/ ۹

مقدمه:

موسسه تحقیقات رایانه ای قائمیه اصفهان، از سال ۱۳۸۵ هـ .ش تحت اشراف حضرت آیت الله حاج سید حسن فقیه امامی (قدس سره الشریف)، با فعالیت خالصانه و شبانه روزی گروهی از نخبگان و فرهیختگان حوزه و دانشگاه، فعالیت خود را در زمینه های مذهبی، فرهنگی و علمی آغاز نموده است.

مرامنامه:

موسسه تحقیقات رایانه ای قائمیه اصفهان در راستای تسهیل و تسریع دسترسی محققین به آثار و ابزار تحقیقاتی در حوزه علوم اسلامی، و با توجه به تعدد و پراکندگی مراکز فعال در این عرصه و منابع متعدد و صعب الوصول، و با نگاهی صرفا علمی و به دور از تعصبات و جریانات اجتماعی، سیاسی، قومی و فردی، بر مبنای اجرای طرحی در قالب « مدیریت آثار تولید شده و انتشار یافته از سوی تمامی مراکز شیعه» تلاش می نماید تا مجموعه ای غنی و سرشار از کتب و مقالات پژوهشی برای متخصصین، و مطالب و مباحثی راهگشا برای فرهیختگان و عموم طبقات مردمی به زبان های مختلف و با فرمت های گوناگون تولید و در فضای مجازی به صورت رایگان در اختیار علاقمندان قرار دهد.

اهداف:

۱.بسط فرهنگ و معارف ناب ثقلین (کتاب الله و اهل البیت علیهم السلام)

۲.تقویت انگیزه عامه مردم بخصوص جوانان نسبت به بررسی دقیق تر مسائل دینی

۳.جایگزین کردن محتوای سودمند به جای مطالب بی محتوا در تلفن های همراه ، تبلت ها، رایانه ها و ...

۴.سرویس دهی به محققین طلاب و دانشجو

۵.گسترش فرهنگ عمومی مطالعه

۶.زمینه سازی جهت تشویق انتشارات و مؤلفین برای دیجیتالی نمودن آثار خود.

سیاست ها:

۱.عمل بر مبنای مجوز های قانونی

۲.ارتباط با مراکز هم سو

۳.پرهیز از موازی کاری

۴.صرفا ارائه محتوای علمی

۵.ذکر منابع نشر

بدیهی است مسئولیت تمامی آثار به عهده ی نویسنده ی آن می باشد .

فعالیت های موسسه :

۱.چاپ و نشر کتاب، جزوه و ماهنامه

۲.برگزاری مسابقات کتابخوانی

۳.تولید نمایشگاه های مجازی: سه بعدی، پانوراما در اماکن مذهبی، گردشگری و...

۴.تولید انیمیشن، بازی های رایانه ای و ...

۵.ایجاد سایت اینترنتی قائمیه به آدرس: www.ghaemiyeh.com

۶.تولید محصولات نمایشی، سخنرانی و...

۷.راه اندازی و پشتیبانی علمی سامانه پاسخ گویی به سوالات شرعی، اخلاقی و اعتقادی

۸.طراحی سیستم های حسابداری، رسانه ساز، موبایل ساز، سامانه خودکار و دستی بلوتوث، وب کیوسک، SMS و...

۹.برگزاری دوره های آموزشی ویژه عموم (مجازی)

۱۰.برگزاری دوره های تربیت مربی (مجازی)

۱۱. تولید هزاران نرم افزار تحقیقاتی قابل اجرا در انواع رایانه، تبلت، تلفن همراه و... در ۸ فرمت جهانی:

۱.JAVA

۲.ANDROID

۳.EPUB

۴.CHM

۵.PDF

۶.HTML

۷.CHM

۸.GHB

و ۴ عدد مارکت با نام بازار کتاب قائمیه نسخه :

۱.ANDROID

۲.IOS

۳.WINDOWS PHONE

۴.WINDOWS

به سه زبان فارسی ، عربی و انگلیسی و قرار دادن بر روی وب سایت موسسه به صورت رایگان .

درپایان :

از مراکز و نهادهایی همچون دفاتر مراجع معظم تقلید و همچنین سازمان ها، نهادها، انتشارات، موسسات، مؤلفین و همه

